**FİLOLOGİYA PHILOLOGY ФИЛОЛОГИЯ**

DOI: 10.36719/AEM/2007-2020/51/4-10

**Möhsün Zellabdin oğlu Nağısoylu**
AMEA, Nəsimi adına Dilçilik İnstitutu

# YENİ AŞKARLANMIŞ "DƏDƏ QORQUD" ƏLYAZMASI: EPOSUN YENİ BİR VARİANTI

***Açar sözlər:*** *əlyazma, adlandırma, boy, başlıq, bədii tərtib, folklor*
***Key words:*** *manuscript, nameing, party, title, artistic composition, folklore*
***Ключевые слова:*** *рукопись, наименование, часть, название, художественная оформление, фольклор*

## Giriş

2019-cu il türk dünyası, bütövlükdə türkologiya üçün əlamətdar bir hadisə ilə yadda qaldı: oğuzların ana kitabı "Dədə Qorqud"un yeni bir əlyazması aşkarlandı. Əlyazmanın mətni qısa bir müddətdə Türkiyədə Yusif Azmun, Mətin Ekici və 4 nəfərlik heyət: Naser Xaze Şahgüli, Yaqubi Vəliullah, Ağtabai Şahruz və Behzad Sara tərəfindən nəşr edilmişdir. Əsər həmçinin İranda və Azərbaycanda çapa hazırlanmışdır. Yeni əlyazma Türkiyədə üç adla: "Dədə Qorqudun üçüncü əlyazması" (Y.Azmun), "Dədə Qorqud kitabı. Türkistan/Türkmən səhra nüsxəsi" (M.Ekici) və "Dədə Qorqud kitabının Günbət yazması" (N.Şahgüli və b.), Azərbaycanda isə "Kitabi-Dədə Qorqud"un üçüncü əlyazması" (Ramiz Əskər) adları ilə çap olunmuşdur. Əlyazmanın çox qısa müddətdə bir neçə dəfə nəşr olunmasının başlıca səbəblərindən biri də, fikrimizcə, onun həcminin kiçik olması ilə (31 vərəq) bağlıdır. Yeni aşkarlanmış əlyazma "Türkologiya" jurnalının 2019-cu il, 3-cü sayında (səh.86-121), eləcə də keçən ilin oktyabr ayında Azərbaycan Dillər Universitetində "Sovet-Türk kollokviumu"nun 30 illiyinə həsr edilmiş dəyirmi masada geniş müzakirə olunmuşdur. Sonuncu müzakirədə biz də iştirak etmiş və əlyazma ilə bağlı bəzi məsələlərə öz münasibətimizi bildirmişik (Türkologiya, N4, 2019, səh. 34-97). Bu yazıda isə əlyazmanın özü və onun nəşrləri haqqında bəzi fikir və mülahizələrimizi diqqətə çatdırırıq.

Öncə onu qeyd edək ki, yeni aşkar edilmiş əlyazmanın adlarından heç biri əlyazmaşünaslığın, mətnşünaslığın meyarları və tələblərinə uyğun gəlmir. Əlyazma kitabının "Kitabi-Dədə Qorqud"un üçüncü əlyazması" adlandırılması o deməkdir ki, yeni aşkarlanmış əlyazmanın mətni eposun əvvəlki iki əlyazma nüsxəsinin (Drezden, Vatikan) mətninin ya eynidir, ya da heç olmasa, onlar arasında məzmunca müəyyən bir uyğunluq vardır. Halbuki yeni aşkarlanmış əlyazma ilə "Kitabi-Dədə Qorqud"un məlum əlyazma nüsxələri arasında mətn baxımından uyğunluq və bağlılıq, demək olar ki, yoxdur. Deməli, bu əlyazmanın "Kitabi-Dədə Qorqud"un üçüncü əlyazması adlandırılması mətnşünaslıq baxımından düzgün sayıla bilməz. Əlyazmanın "Dədə Qorqud kitabının Türkmən səhra nüsxəsi" adlandırılması da heç bir meyara uyğun gəlmir. Qeyd edək ki, "nüsxə" məsələsinə bizdən öncə Türkiyə alimi Osman Fikri Sərtqaya aydınlıq gətirmişdir: "Günbed yazmasının ne Drezden ne de Vatikan yazmaları ile ilgisi yoktur... Günbed (Türkmen Sahra) yazması... "nüsha" değil, ancak "paralel metin" olma özelliği taşımaktadır" ("Türkologiya", N3, 2019, səh. 93). Biz də bu fikri dəstəkləyir və məsələ ilə bağlı onu diqqətə çatdırırıq ki, əlyazmaşünaslıqda *nüsxə* termini hər hansı bir əsərin ilkin əlyazmasından köçürülmüş əlyazma kitabı anlamında işlənir. Məsələn, Füzuli divanının Konya nüsxəsi dedikdə o başa düşülür ki, bu əlyazma, şairin divanının daha qədim olan, tutaq ki, Bakı və ya Daşkənd nüsxəsinin mətnindən köçürülmüş bir əlyazma kitabıdır. Təbii ki, bu əlyazma nüsxələrinin mətnləri arasında müəyyən kiçik fərqlər ola bilər, lakin bu şərtlə ki, həmin ayrıntılar əsərin ümumi məzmunu və mətninə əhəmiyyətli dərəcədə təsir edəcək səviyyədə olmasın. Deməli, yeni aşkarlanmış əlyazmanın "Dədə Qorqud" kitabının Türkmən səhra nüsxəsi" adlandırılması da mətnşünaslıq baxımından düzgün deyil. Eyni sözləri "Dede Korkut Kitabının Günbet Yazması" adına da bütünlüklə aid edirik. Maraqlıdır ki, Yusif Azmun yeni aşkarlanmış əlyazmanı "Dede Korkut"un üçüncü elyazması", "Soylamalar ve iki yeni boy ile Türkmen sahra nüshası" adlandırsa da, kitaba yazdığı ön sözdə onu "Kitabi-Dədə Qorqud"un variantı sayır: "Bu yazma ahenkli ve ritmli cümleleriyle Kitabi-Dede Korkut'un bir varyantıdır". Onu da qeyd edək ki, Y.Azmun əlyazmanın fonetik özəlliklərinə dayanaraq onu köçürənin "Azerbaycanlı biri olduğu" qənaətindədir. Müəllif həmçinin mətndəki *utdurmak* sözünün açıqlamasında bu sözün əskidə *yutdurmak* (uddurmaq) olduğunu vurğulayaraq söz başında *y* səsinin, eləcə də müvafiq hərfin düşümünə görə əlyazmanın Təbrizdə hazırlanmasını qeyd edir. Tanınmış Türkiyə alimi Əhməd Bican Ercilasun da yeni aşkarlanmış əlyazmanın mətninin səciyyəvi dil özəlliklərinə dayanaraq onun Güney Azərbaycanda hazırlanmasını

vurğulayır. Alim bu özəlliklər sırasında feilin əmr şəklinin göstəricisi olan *-gilən* morfemini, eləcə də məsdər şəkilçisində ahəng qanununun pozulmasını (*əksilmaq, tükənmaq, dögüşmaq* və s.) feli sifət şəkilçisi *duğı* morfemini (*gəlduğı, gəzdürduğı* və s.) xüsusi olaraq qeyd edir. R.Əskər isə əlyazmanın leksik xüsusiyyətləri əsasında onun Azərbaycanda köçürüldüyünü diqqətə çatdırır. Alim bu fikrinə sübut olaraq *polad, partal* (paltar), *hündür, eşikağası, marıx, oğru, uşaq* və s. kimi sözlərin yalnız Azərbaycanda işləndiyini diqqətə çatdırır.

Yeni aşkarlanmış əlyazmanı Mətin Ekici tam şəkildə bu cür adlandırmışdır: "Dede Korkut Kitabı. Türkistan/Türkmen Sahra Nüshası. Soylamalar ve 13.Boy: Salur Kazan"ın Yedi Başlı Ejderhayı Öldürmesi". Açıqlama səciyyəli bu uzun addakı "Soylamalar" başlığı tamamilə doğrudur, çünki əlyazmanın mətninin əsasını "Kitabi-Dədə Qorqud"un hər iki məlum əlyazma nüsxəsində də olan söyləmələr/soylamalar (alqışlar, nəsihətlər, hikmətli sözlər) təşkil edir. Qeyd edək ki, əlyazmanın əvvəlində boy (fəsil, bölmə) anlamında işlənmiş *soy* sözü müəyyən mənada mətndəki bölümlərin ipucu – açarıdır: irəlicədən onun məzmunu haqqında müəyyən təsəvvür yaradır: "*Bu* ***soyda*** (*seçdirmə bizimdir – M.N.*) *Dədənün müddəası budur ki, hər kim, bəlkə hər nəstə öz həddində və kəmalində olsa, yaxşıdır. Əhli-iste'dadı kəmali-təhsilinə tərğib edüb moizə eylər. Ağız açub bir Allahun adını kim adamaz? Adaduğı ərənlər könli içində mö'mini-müttəqi gərək"* (1b). Bəri başdan qeyd edək ki, bu kiçik mətndəki *adamaz, adaduğı* sözlərini Y.Azmun bu şəkildə oxumuşdur: ādemzādaduğı – səh.26. Mətnin sonuncu cümləsindəki *müttəqi* (Allahdan qorxan; dindar, mö'min) sözü isə M.Ekici və R.Əskərin nəşrlərində *həqir* şəklindədir. Y.Azmun bu sözü düzgün oxumuş, lakin *mömin* (mü'min) sözündən sonra *və* də artırmışdır, halbuki mətndə bu leksik vahid yoxdur. Şahgüli və b. isə sonuncu iki sözü bu şəkildə oxumuşlar: *mö'min müttəqi* (səh.200). Mətnin məzmunundan çıxış edərək bu sözlərin izafətlə oxunuşunu düzgün sayırıq: *mö'mini-müttəqi* (Allahdan qorxan mömin). Qeyd edək ki, yuxarıdakı kiçik mətni verməkdə bir məqsədimiz də diqqəti yeni aşkarlanmış əlyazmanın nəşrlərində müşahidə olunan yanlış oxunuşlara (bunların sayı az deyil və ayrıca bir araşdırmanın mövzusudur) yönəltməkdir.

İndi isə M.Ekicinin nəşrindəki 13-cü boy məsələsi üzərində dayanmaq istəyirik. Qeyd edək ki, bizdən öncə Ramazan Qafarlı və Seyfəddin Rzasoy yeni aşkarlanmış əlyazmaya və 13-cü boy məsələsinə öz münasibətlərini ətraflı şəkildə bildirmişlər ("Türkologiya", N4, 2019, səh. 94-109). Təcrübəli folklor mütəxəssisləri kimi, onların fikrincə, ".... bu əlyazma mətnləri (*şərti olaraq "Dədə Qorqud"un 3-cü əlyazması" adlandırılmış yeni əlyazmanın və eposun məlum iki əlyazmasının mətnləri – M.N.*) tam fərqli poetik struktur tipologiyalarına malikdir və bu mənada "Kitabi-Türkman lisanı" heç bir halda "Kitabi-Dədə Qorqud"un üçüncü nüsxəsi və əlyazması hesab oluna bilməz" ("Türkologiya", N3, 2019, səh. 106). Yeni aşkarlanmış əlyazmadakı cəmi 5 vərəqdə (26b-31a) yer alan kiçikhəcmli boyun (Salur Qazanın yeddibaşlı əjdəhanı öldürməsi) "Kitabi-Dədə Qorqud"un 13-cü boyu kimi təqdim edilməsini biz də doğru saymırıq. Fikrimizcə, bu əlyazma, ümumiyyətlə, götürdükdə soylamalardan və kiçikhəcmli bir boydan ibarət tamamilə yeni bir mətndir – "Dədə Qorqud"un variantlarından – paralel mətnlərindən biridir. Onu da qeyd edək ki, Y.Azmun əlyazmanı "Soylamalar və İki Yeni Boy ile Türkmen Sahra Nüshası" adı altında nəşrə hazırlamışdır. Tədqiqatçı həmin iki boyu şərti olaraq belə adlandırır: "Salur Kazan"ın Araz suyı ilə Kars Kal'asını aldugı boy" və "Salur Kazan"un yedi başlı ejdehayı öldürdügi boy". Qeyd edək ki, R.Əskərin çapa hazırladığı mətndə də iki boy vardır və onların şərti adları Y.Azmunun nəşrindəki kimidir: "Salur Qazanın Araz suyu ilə Qars qəl'əsini alması"; "Qazan xanın yeddi başlı əjdəhanı öldürməsi".

Bu "boy"lardan birincisinin mətni əlyazmada cəmi iki vərəq (24a-25b) həcmindədir və burada Qazanın özünü öyməsindən danışılır. Qazan öncə sərhəd bəylərindən bir çaparın gələrək onun üstünə on min yağının yürüməsi xəbərini verməsindən söz açır. Sonra isə düşmən qoşununun sayını on-on artıraraq sonda yüz minə çatdırır:

*"Qeysər Salur iyəsi, dumanlı dağ börüsi, Salur yegi, Eymur görki, Zülqədir dəlüsi, Bayındır padşah vəkili Qazan der: Ağalarum ilən ala qarlı, gög sünbülli dağlara ava getmiş idüm, içür idüm. Sərhəd beglərindən çapar gəldi: "Qazan, nə içərsən? On min yağı üstünə gəldi."*

*On min yağı gəldügini eşidəndə qol götürüb aq otaq içində oyına girdüm.*
*İyirmi min yağı gəldi, - deyəndə yerümdən imrənmədüm.*
*Otuz min yağı gəldi, - deyəndə hiçə saydum.*
*Qırx min gəldi, - deyəndə qara gözümün ucından qıya baxdum, qımzanmadum.*
*Əlli min gəldi, - deyəndə əl verüb əlləşmədüm, "azdır", - dedüm.*
*Altmış min gəldi, - deyəndə Allahı andum, atlanmadum.*
*Yetmiş min gəldi, - deyəndə yetlənmədüm.*
*Səksən min, [gəldi], - deyəndə səksənmədüm.*
*Doqsan min yağı gəldi deyəndə, - arxaluqcaq idüm, donum geydüm.*
*Yüz min yağı gəldi, - deyəndə yüz çevirüb qayıtmadum".*

Qeyd edək ki, Qazanın bu öygü – soylamasının azacıq fərqli variantı "Kitabi-Dədə Qorqud" eposunun "Salur Qazan tutsaq olub oğlı Uruz çıqarduqı boyı bəyan edər" adlı 11-ci boyunda da yer almışdır. Yeni əlyazmadan fərqli olaraq Qazan bu boyda kafirlərin ona: "bizi öy", - deyərkən yalnız bir parçasını verdiyimiz aşağıdakı soylamanı dilə gətirir:

*On bin ərdən yağı gördüm isə, "oyunum" de[mə]düm.*
*Yigirmi bin ər yağı gördüm isə, yelmədüm.*
*Otuz bin ər yağı gördüm isə, ota saydum.*
*Qırq bin ər yağı gördüm isə, qıya baqdum.*
*Əlli bin ər [yağı] gördüm isə, əl vermədüm.*
*Altmış bin ər [yağı] gördüm isə, alışmadum.*
*[Yetmiş bin ər yağı gördüm isə, yeləmədüm]*
*Səksən bin ər yağı gördüm isə, səksənmədüm.*
*Toqsan bin [ər] yağı gördüm isə, tonanmadum.*
*Yüz bin ər [yağı] gördüm isə yüz dönmədüm.*

(Oğuzların diliyle Dedem Korkut'un kitabı. Hazırlayan: Mustafa S.Kaçalin, Ankara, 2017, səh. 190)

Bu fakt Dədə Qorqud dastanlarının uzun bir müddət ərzində müəyyən dəyişikliklərlə yaddaşlarda qorunub-saxlandığını, şifahi şəkildə nəsillərdən nəsillərə ötürüldüyünü sübut edir. Qeyd edək ki, yuxarıdakı parçalar arasında yaxın bir səsləşməyə baxmayaraq onlar tamamilə fərqli məqamlar da özünü göstərir. Bu məsələyə bizdən öncə diqqət yetirən R.Qafarlı yazır ki, həmin oxşar parçalar "şifahi epik ənənənin standartlıq qanunu əsasında ayrı-ayrı zamanlarda yaranmışdır. Bu, nağıl və dastan mətnlərindəki iki qat, üç qat təkrarlanma sistemində olduğu kimi şifahi poetik mətn elementidir". ("Tükologiya", N4, 2019, səh.65)

Yeni əlyazmadakı sözügedən bölümdə Qazan yuxarıda verdiyimiz soylamasından sonra namaz qılır, ya Məhəmməd, ya Əli deyir (sonuncu söz burada açıq-aşkar bir şiəlik təəssübkeşliyi olmasını təsdiqləyir) və önündə kimləri *çarxçı* (döyüşdə öncü, öndə gedən) buyurmasını söyləyir. Onlar sırasında Dədə Qorqud dastanlarında adı çəkilən Qaragünə oğlu Qara Budaq və Qıyan oğlu Dəli Dondarla yanaşı, qurçıbaşı Xan Əfşarın da adına rast gəlirik. Qeyd edək ki, "Kitabi-Dədə Qorqud"da qurçıbaşı (Səfəvilər dövründə atlı mühafizə alayının başçısı) kimi bir vəzifə sahibinə, eləcə də Xan Əfşar adlı şəxsə rast gəlmirik. Maraqlıdır ki, "yüz min kafirin qırıldığını" bilən Qazan xan qələbədən sonra Akça Qala Sürməlidə Lələ Qılbaşı daruğa (darğa) təyin edir. Qeyd edək ki, monqol mənşəli *daruğa* sözü "Kitabi-Dədə Qorqud" dastanlarında qeydə alınmamışdır. "Yeddi gün, yeddi gecə kafirə qılıc çalan" Qazan sonda Qars qalasını alır və bəylər ilən Təbrizin cənubundakı Sürxab (Eynəli) dağına gəzintiyə çıxır ("Kitabi-Dədə Qorqud"da bu toponimlər də yoxdur). Bütün bu hadisələr Qazanın dilindən verilir və açıq-aşkar bir öygü (özünü öymə) təsirini bağışlayır.

Əlyazmanın ən sonunda yer alan və Qazanın yeddibaşlı əjdəhanı öldürməsindən bəhs edən hissəni ayrıca bir boy kimi təqdim edən Y.Azmun və R.Əskər Qars qalasının alınması ilə bağlı bölümü də boy adlandırmışlar. Məsələ ilə bağlı M.Ekicinin fikri isə bir qədər fərqlidir. Onun fikrincə, bu bölüm əlyazmada yeganə olan boya – Qazanın yeddibaşlı əjdahanı öldürməsi boyuna hazırlıq məqsədi daşıyan bir hissədir. M.Ekici bu fikrinə sübut olaraq "Kitabi-Dədə Qorqud"un Drezden nüsxəsindəki Dirsə xan oğlu Buğac, eləcə də Qanlı Qoca oğlu Qanturalı haqqındakı boylarda da buna bənzər bir durumun yer aldığını, yəni eposun bu hissələrində də əsas hadisədən ayrıla biləcək yerlərin olduğunu diqqətə çatdırır. Biz də folklorçu mütəxəssisin bu arqumentləri ilə razılaşır və hesab edirik ki, əlyazmadakı Qazanın Qars qalasını almasından bəhs edən hissə məzmununa görə ayrıca bir boy üçün vacib olan meyarlara cavab vermir və əslində öygü-soylama təsirini bağışlayan bir bölümdür.

İlk vərəqi itmiş yeni əlyazmanın heç bir yerində başlıq yoxdur. Bununla belə, onun mövcud 1b və 2b vərəqlərində qırmızı xətlə yazılmış başlıq səciyyəli iki kiçik mətn vardır ki, biz onlardan birini yuxarıda verdik. Qırmızı mürəkkəblə yazılmış hər iki başlıqda – soyda Dədənin (Dədə Qorqudun) məqsəd və məramına aydınlıq gətirilir, mətnin qısaca məzmunu verilir. Bu fakta əsasən düşünürük ki, əlyazmanın itmiş ilk vərəqində onun qırmızı mürəkkəblə yazılmış adı var imiş.

Əlyazmanın mövcud 3a, 4a, 5b, 7b, 9a, 11a, 14b, 15b, 16a, 17a, 17b, 18b, 19b, 20b, 22a, 22b, 23b, 26b vərəqlərində də başlıqlar üçün boş yerlər buraxılmış, lakin hansı səbəbdənsə həmin hissələr elə boş olaraq da qalmışdır. Qeyd edək ki, orta əsrlərə aid digər əlyazmalarda da bu kimi hallara rast gəlirik.

Əlyazmada başlıq üçün boş buraxılmış sonuncu vərəqin (26b) mətni *"Bir gün adəmlər əvrəni, islam dini qüvvəti, qoŋur atlı Salur yegi..."* sözləri ilə başlayır və burada Qazan xanın yeddibaşlı əjdahanı öldürməsindən danışılır.

Qeyd edək ki, burada Qazan xan üçün işlədilmiş epitetlər yuxarıda nümunə olaraq verdiyimiz parçadakılardan bir qədər fərqlənir. Ən maraqlısı isə odur ki, bu epitetlər sırasında "Savalan dağı yaylaqlı" və "Azərbaycan ləngəri" ifadələrinə də rast gəlirik:

“...Salur yegi, Eymur görki, Zülqədirli dəlüsi, Savalan dağı yaylaqlı, Sarıqamış qışlaqlı... Adərbaycan ləngəri, padşahun vəkili Ulaş oğlı Qazan qara yazun fəslində tazı-tula yeddürdi,.. ava getdi”.

Boyun qısaca məzmunu isə belədir: Günortaya qədər Aq Manqanda ov ovlayan Qazan yoldaşlarını (mətndə: aqalarını) orduya göndərərək tək qalır və qaranlıq düşəndə Qara dağın ətəyində yeddi yerdə alovlanan – tüstülənən od görür. Həmin yerə yaxınlaşanda alovun yeddibaşlı əjdaha olduğunu görür. Qazanın ovda tək qaldığını eşidən Lələ Qılbaş ağasının ardınca gəlir. Qazan lələsi ilə əjdahanın üstünə getməsi barədə məsləhətləşir və “hə” cavabını aldıqdan sonra bu heybətli heyvanı öldürməyə girişir. Əjdaha əvvəlcə Qazanı sümürüb udur, lakin igid qəhrəman Allahına yalvardıqdan sonra əjdahanın ağzından xilas olur və yenidən vəhşi heyvanla vuruşur. Bu zaman Qazanın bir gözü qana bulaşır. Maraqlıdır ki, boyun bu hissəsində Qazanın öz gözü haqqında dediyi sözlər “Kitabi-Dədə Qorqud”un 11-ci boyunda Qazanın yeddi başlı əjdahanın adını çəkdiyi soylamadakı cümlələrlə yaxında səsləşir. Aşağıda hər iki parçanı veririk:

*Yedi başlu əjdərhaya yetüb vardum,*
*Heybətindən sol gözüm yaşardı.*
*Hey gözüm, namərd gözüm, müxənnət gözüm.*
*Bir yılandan nə var ki, qorxdun? – dedüm.*

(Oğuzların diliylə Dedem Korkudun Kitabı, səh.190).

*“Mərə sən mənüm namərd gözüm.*
*Qara polad sav qılıcun yalmanından qorxmazdun,*
*Sühar oqlar peykanından üşənməzdün.*
*On altı batman kafir görzi təpəmdən dəgdi, pörtləmədün.*
*Əjdəha dedikləri bir yılandur, anda nə var ki, bulaşursan, öləzürsən?*
*Sənün kimi namərd göz mənüm kimi mərd igiddə neylər?”*

(Yeni əlyazma, 28b-29a).

Bu sözləri dedikdən sonra Qazan əvvəlcə xəncər ilə gözlərini oymaq istəyir, lakin bu fikrindən daşınır. Əjdahaya səksən ox tuşlayan Qazan sonda vəhşi heyvanı öldürür və onun dərisini soyduraraq özünə don düzəldir və bu qiyafədə Bayındır padşahın hüzuruna gəlir. Padşahın vəkilləri əvvəlcə Qazanın əjdahaya döndüyünü düşünərək onu öldürmək qərarına gəlsələr də, padşah onlarla razılaşmır və Qara Budağı igidin üstünə göndərir. Qara Budağ məsələdən xəbərdar olur və padşah İç Oğuzla Dış Oğuzla birgə öz vəkilini – Qazanı qarşılayır. Padşahın ayağına düşən Qazan əjdaha dərisindən sayəban (kölgəlik) tikdirir və yeddi gün, yeddi gecə padşahı qonaqlayır. Boy bu sözlərlə bitir:

*Dədəm Qorqud der: “Qazan kimi qoçaq igid dünyadan gəldi – keçdi”.*

Yeni əlyazmadakı bu boyun məzmunundan da göründüyü kimi, o istər həcminə, istərsə də hadisənin təsvirinə görə “Kitabi-Dədə Qorqud”da yer alan boylar səviyyəsində deyil. Başqa sözlə desək, “Qazanın əjdəhanı öldürməsi süjeti ümumi axarına görə boy janrının tələblərini tam ödəmir”. (R.Qafarlı)

Onu da qeyd edək ki, başda Şahgüli olmaqla dörd nəfərin hazırladığı mətndə, ümumiyyətlə, başlıq yoxdur. Burada mətndəki bölümlər 25 nömrə altında verilmişdir ki, fikrimizcə, bu daha məqsədəuyğun bir qərardır.

Əlyazmanın mətnində başlıq üçün boş buraxılmış yerlərdən birində (5b) fars dilində karandaşla yazılmış belə bir qeyd vardır:

*Celd-e doyyom-e ketab-e torkman lesani. 1347*

Türkmən dilindəki kitabın ikinci cildi. 1928/1929

Qeyddəki sonuncu sözün (*lesani* – dil) ərəb əlifbasındakı ikinci hərfi *sin* əvəzinə yanlış olaraq *se* hərfi ilə yazılmışdır. Bu fakta əsasən Y.Azmun və R.Əskər həmin sözün *lesan* yox, *əl-sani* (ikinci) olduğu qənaətindədirlər. Onların fikrincə, katib (əslində kitab sahibi) burada *sani* sözündən qabaq *rəbiül* və ya *cəmadiül* sözlərini yazmağı unutmuşdur (rəbiül-sani, cəmadiül-sani). Biz isə hesab edirik ki, həmin yazı kitab sahibinə aiddir: o, milliyyətcə İranda yaşayan türkmandır və bu qeydlə əlyazmanın türkman dilində olmasını diqqətə çatdırmaq istəmişdir. “Celd-e doyyom” (ikinci cild) məsələsinə gəldikdə isə, düşünürük ki, mövcud əlyazma Dədə Qorqud haqqındakı soylamalardan ibarət olan kiçikhəcmli kitabın ikincisi imiş, yəni onun birinci cildi də həmin vaxt (1347/1928-29-cu ildə) naməlum xətt sahibinin istifadəsində olubmuş. Qeydi belə də izah etmək olar: xətt sahibi bu yazısı ilə əlyazmanın əvvəlki vərəqlərini (1a-5a) kitabın (mətnin) birinci cildi, sonrakıları isə (5b-31a) ikinci cildi kimi qəbul etmişdir. Əlyazmanın 4b vərəqinin yuxarısındakı qeyd də eyni xətlədir və mətnin birinci sətrindəki sözlərin təkrarıdır. Maraqlıdır ki, bu vərəqdə də başlıq üçün boş yer buraxılmışdır.

Əlyazmanın köçürülmə tarixinə gəldikdə isə, qeyd etməliyik ki, Şahgüli və b.-nın qeyd etdikləri kimi, katib 1a vərəqinin haşiyəsində iki sözün (*uçmağ, sızdırdı*) sözlərinin mənalarını izah edərkən Nadir şahın münşisi Məhəmməd Mirzə Mehdi xanın 1759-cu ildə tamamladığı “Sənglax” (“Daşlıq”) adlı lüğətində veril-

miş çağatay türkcəsinin məşhur nümayəndələrindən olan şair Lütfinin (XV əsr) iki beytindən istifadə etmişdir. Bu isə o deməkdir ki, sözügedən əlyazma bu tarixdən (1759) sonra hazırlanmışdır. Əlyazmanı araşdırmış tədqiqatçılardan M.Ekici və Y.Azmun isə onun XVII-XVIII əsrlərə aid olduğunu təxmin edirlər. Əlyazmadakı *eşikağası, divanbəgi, cəbbadar* (cəbbəxana müdiri) kimi vəzifə adları onun arxetipinin Səfəvilər dövrünə aid olduğunu sübut edən amillər sırasındadır.

Yuxarıda qeyd etdiyimiz kimi, əlyazmanın mətnində olan eyni sözlərin müxtəlif nəşrlərdə həm fərqli oxunuşları, həm də ayrıntılı mənaları diqqəti çəkir. Bu qəbildən olan sözlərdən biri üzərində ayrıca dayanmaq istəyirik. Bu, aşağıda verilmiş cümlədəki *ayqaq* sözüdür:

*Ayqaqlaruŋ ağzından, çuqullaruŋ dilindən, quru böhtan bəlasından Dədəm der: Həq-təala saxlasuŋ canuŋızı* (15b).

*Ayqaq* sözünün mənasını M.Ekici *cahil,* Y.Azmun isə *boş konuşan, geveze* kimi mənalandırmışdır. N.Şahgüli və b.-nın nəşrində bu sözün *çok konuşan* mənası qeyd olunur. R.Əskərin nəşrində də *ayqaq* sözünün *gəvəzə, çox danışan* mənası göstərilir. Göründüyü kimi M.Ekicidən başqa, digər tədqiqatçıların fikrincə *ayqaq* çox danışan deməkdir. Müasir Azərbaycan ədəbi dili üçün arxaik səciyyə daşıyan bu söz dilimizin Qax və Naxçıvan şivələrində *ayqax* şəklində öz varlığını qoruyub saxlamışdır. "Azərbaycan dilinin dialektoloji lüğəti"ndə bu sözün Qaxda *bələdçi*, Naxçıvanda isə *təlxək* mənaları qeydə alınmışdır. Çağdaş türk ədəbi dilində isə *ayqaq/ayğak* sözünə rast gəlmirik.

Türk dillərinin əski qatlarına dair lüğətlərə gəldikdə isə, *ayqaq* sözü bizə məlum məşhur əski lüğətlərdən Lazar Budaqovun və Vasili Radlovun lüğətlərində qeydə alınmışdır. L.Budaqov bu sözü *ayğak* kimi yazaraq onun çağatayca və qırğızcada *şahid, xəbərçi* anlamlarında işləndiyini göstərir.

Vasili Radlov da *ayğaq* sözünün qırğızcada, çağataycada *şahid* və *xəbərçi* mənalarını qeyd edir. Alim bu sözün kökündə uyğurcada *danışmaq, demək* mənasında işlənən *aymaq* feilinin dayandığını da vurğulayır. Maraqlıdır ki, bu qədim söz dilimizin Füzuli şivəsində *aymağ* (söyləmək, demək) anlamında öz varlığını qoruyub saxlamışdır. *Demək, söyləmək* anlamını daşıyan *aymaq* feili ilə *ayqaq* (şahid; xəbərçi) düzəltmə ismi arasında müəyyən bir bağlılıq olması göz qabağındadır. Deməli, yuxarıda verdiyimiz nümunədə işlənmiş *ayqaq* sözü də burada *çox danışan, gəvəzə* anlamını yox, *xəbərçi* mənasını daşıyır. Yeri gəlmişkən qeyd edək ki, XVI əsr Azərbaycan tərcümə əsəri "Şühədanamə" də bu söz *əyğağ* şəklindədir və *casus* anlamında işlənmişdir:

*Əmma ravi der ki, neçə əyğağlar Ziyadoğlına dedilər ki, Müslimün iki oğlı bu şəhərdə gizlüdürlər*.

Aydınlıq üçün qeyd edək ki, "Şühədanamə"nin farsca orijinalı olan "Rövzətüş-şühəda" əsərində *əyğağ* sözünün qarşılığı *casus* leksik vahididir.

Onu da qeyd edək ki, *xəbərçi* və *casus* sözləri arasında müəyyən məna bağlılığı olsa da, fikrimizcə, yeni aşkara çıxarılmış əlyazmada işlənmiş *ayqaq* sözü daha çox *casus* mənasını verir. Bunu həmin cümlədə işlənmiş *çuğul* (xəbərçi) sözü də təsdiq edir.

Alman türkoloqu Dorfer "Yeni farscada türk ünsürləri" adlı məşhur kitabında *ayqaq* sözünün *xəbərçi* mənasını göstərərək bu leksemin özbək dilində *kəşfiyyatçı, casus* anlamlarında da işləndiyini qeyd edir. Dorfer həmçinin *ayqaq* sözünün fars və monqol dillərinə keçdiyini də diqqətə çatdırır. Qeyd edək ki, "Özbək dilinin izahlı lüğəti"ndə *aygok* sözü ilə yanaşı, *ayğokçi* lekseminin *gizli agent, casus* və *salnaməçi* anlamlarında işləndiyi göstərilir. *Ayqaq // ayğağ* sözü ilə bağlı onu da əlavə edək ki, İran leksikoqrafı Həsən Ənvərinin "Soxən" adlı farsca izahlı lüğətində türkmənşəli bu leksemin orta əsrlərdə fars dilində *xəbərçi* anlamında işlənməsi qeyd olunur.

Əlyazmanın yazı xüsusiyyətləri ilə bağlı fikirlərimizi də bildirmək istəyirik. Mətn şikəstə ünsürlü gözəl nəstəliq xətti ilə, əsasən, 14 sətirdə yazılmış və qızılı suyu ilə işlənmiş beş nazik xətlə haşiyəyə alınmışdır. Haşiyədəki 1-ci və 2-ci, eləcə də 3-cü və 4-cü xətlərin arası qızıl suyu ilə doldurulmuşdur. Beşinci xətt isə bütün bu xətləri dövrəyə alır. Əlyazmadakı mövcud 1a vərəqinin mətni bu sözlərlə başlanır: *"Həq-təala gögdən Qur'an endürdi arı dinli Mühəmmədə oqumaq içün"*. Əlyazmanın sonluğu – axırıncı cümləsi isə belə səslənir: *"Dədəm Qorqud der: "Qazan kimi qoçaq igid dünyadan gəldi-keçdi"* (31a).

Əlyazmanın mövcud ilk vərəqindən (1a) başlayaraq, bir sıra vərəqlərin haşiyələrində katib kiçik xətlə öz dövrü üçün arxaik səciyyə daşıyan bəzi türkmənşəli sözlərin izahını vermişdir. Məsələn, *uçmaq* (behişt), *ağayıl* (qoyun, qoyun sürüsü), *böri* (qurd), *imrəmək* (həvəslənmək), *ırğanmaq* (sallanmaq) və s. Qeyd edək ki, bu izahlar sırasında yanlış olanları da vardır. Məsələn, katib *ornac* sözünü *"zahirən görk* və *borazeş* (*yaraşıqlı – M.N.*) *mənasına ola*" kimi açıqlayır (3a). Halbuki *ornac* sözü burada ölən adamın *yurdunda qalan, varis, xələf* anlamındadır. Azmun isə kitabın "Sözlükçe" bölümündə bu sözü *ornaç* kimi yazaraq onu belə mənalandırır: *göstəriş, yakışık*. Yeni əlyazmanın digər nəşrlərində isə *ornac* sözünün *varis, xələf* mənaları göstərilir.

Qeyd edək ki, əlyazmanın haşiyəsində yazılmış izahlar yalnız ilk vərəqlərdədir, sonrakı vərəqlərdə onlara rast gəlmirik. Əlyazmanın haşiyəsindəki xətlə əsas mətnin xətti eyni katibə məxsusdur. Sadəcə olaraq, haşiyədəki yazılar əsas mətnlə müqayisədə kiçik xətlə yazılmışdır.

Əlyazmanın bədii tərtibinə görə düşünürük ki, o, yüksək vəzifəli şəxs üçün hazırlanıbmış. Qeyd edək ki, əlyazmanın hazırkı sahibi, İranın Gülüstan ostanının Günbət şəhər sakini Vəli Məhəmməd Xocanın dediyinə görə, o, bu qiymətli kitabı Tehrandakı bir bukinist mağazasından almışdır. Kitabı satan şəxs Vəli Məhəmməd Xocaya Qacarlar nəslindən olduğunu və əlyazmanın Ağa Məhəmməd şah Qacarın kitabxanasına məxsus olduğunu söyləyir. Deməli, əlyazma uzun zaman bu görkəmli dövlət xadiminin kitabxanasında olmuşdur.

"Kitabi-Dədə Qorqud" eposu kimi, yeni aşkarlanmış "Dədə Qorqud" əlyazmasında da bahadırlıq və mərdlik, igidlik və qoçaqlıq, comərdlik və əliaçıqlıq, insansevərlik və xeyirxahlıq kimi keyfiyyətlər tərənnüm olunur. Əlyazmanın dili də eposda olduğu kimi, özünəməxsusluğu: axıcılığı və oynaqlığı, ritmikliyi və ahəngdarlığı, coşqunluğu və lirizmi, obrazlığı və yüksək poetik xüsusiyyətləri ilə seçilir ki, bütün bunlar da oxucuya yüksək estetik zövq verir. Aşağıdakı kiçik parça bunu əyani şəkildə sübut edir:

*Sərp yügürür sallar atlar - ər qanatı; minə bilməz, çapa bilməz,*
*Bir müxənnəs ol atları savaş güni minincə minməsə yeg.*
*Çalar, kəsər, götürür, qara polad sav kılıclar - ər azusı;*
*Anı çala bilməz, yetürə bilməz Müxənnəsün əlində*
*Qılıcdan isə, mərd igidün əlində bir aqac yeg.*
*Otı bitməz qara daglar yıxılsa yeg*
*At yeməyən acı otlar qara yerün üzərində bitincə bitməsə yeg.*
*Adəm içməz bulanuq sası su*
*Damarından çəkilsə yeg.*
*Bəzə miskin, xeyir görməz, kor ilən nakəs baylar,*
*Dədəm der: Talanıban pozulsa yeg.* (22a-22b)

Daha bir vacib məsələ haqqında öz fikirlərimizi bildirmək istəyirik. Ə.B.Ərcilacunun da qeyd etdiyi kimi, yeni aşkarlanmış "Dədə Qorqud" əlyazmasının Türkiyə nəşrlərində, daha doğrusu, əski əlifbada olan mətnin transkripsiyasında kifayət qədər fərqli məqamlar vardır ("Türkologiya", N4, 2019, səh. 80-81). Bakıda prof. R.Əskərin nəşrə hazırladığı "Kitabi-Dədə Qorqud"un əlyazmasının transkripsiyasında da mübahisəli məqamlar az deyil. Bunu nəzərə alaraq biz sözügedən əlyazmanın yenidən nəşrə hazırlanmasını bir mətnşünas-əlyazmaçı kimi müəyyən mənada özümüzə borc bilərək bu işi artıq tamamlamış və tezliklə nəşrə təqdim etmək fikrindəyik.

Əlyazma ilə bağlı daha bir incə məqam onun Günbət yazması, yoxsa Türkmən Səhra nüsxəsi adlandırılmasına aiddir. Yuxarıda qeyd etdiyimiz kimi, yeni aşkarlanmış əlyazmanın "Kitabi-Dədə Qorqud"un üçüncü nüsxəsi kimi təqdim olunması mətnşünaslıq baxımından yanlışdır. Günbət yazması məsələsinə gəldikdə isə, fikrimizcə, əlyazma kitabı Tehranda aşkara çıxarıldığı və uzun müddət ərzində bu şəhərdə saxlanıldığı üçün onun Tehran əlyazması adlandırılması məqsədəuyğundur. Qeyd edək ki, R.Əskər də bu fikirdədir.

Bir neçə kəlmə də yeni aşkara çıxarılmış əlyazmanın adı haqqında. Yuxarıda qeyd etdiyimiz kimi, əlyazmanın bizə gəlib çatmayan ilk vərəqində, çox güman ki, onun adı qeyd olunubmuş. Hər halda indiyədək əldə olan Dədə Qorqud əlyazmalarına əsasən, fikrimizcə, yeni aşkara çıxarılmış əlyazmanı şərti olaraq "Dədə Qorqud: soylamalar və Qazan xanın əjdəhanı öldürdügi boy" və ya "Oğuznamə" adlandırmaq olar. Xatırladaq ki, "Kitabi-Dədə Qorqud"un məlum Drezden və Vatikan nüsxələrində əlyazmaların adları bu şəkildədir: "Kitabi-Dədəm Qorqud əla lisan-i taife-yi Oğuzan"; Hekayət-i Oğuzname-yi Qazan bəg və ğeyri".

## Nəticə

Dədə Qorqudla birbaşa bağlı olan daha bir əlyazma Ankarada – Türk Tarix Qurumunda saxlanılır. Həmin əlyazma professor Mustafa S.Kaçalin tərəfindən nəşrə hazırlanmış və şərti olaraq "Oğuz-namə" adlandırılmışdır. Bu əlyazmada "Kitabi-Dədə Qorqud" eposunun Drezden əlyazmasının əvvəlindəki Dədə Qorqud haqqında olan hissə (mətndə: Hekayət-i Qorqud Ata) və birinci boy (mətndə: Əl-hekayətül-əvvəlu) yer almışdır və bu hissələr Drezden əlyazmasından, demək olar ki, fərqlənmir. Təliq xətti ilə yazılmış cəmi 11 vərəqlik bu əlyazma yarımçıqdır: onun əvvəli və sonu yoxdur. Onu da diqqətə çatdıraq ki, Ə.B.Ərcilasun bu əlyazmanı "Dədə Qorqud"un 3-cü əlyazması, Tehranda yeni aşkar olnumuş əlyazma kitabını isə eposun 4-cü əlyazması adlandırır.

Əlyazmanın olduqca böyük əhəmiyyəti sırasında xüsusi olaraq qeyd etmək lazımdır ki, burada işlənən bir sıra sözlərin "Kitabi-Dədə Qorqud"un Drezden əlyazmasındakı indiyədək oxunuşu mübahisə doğuran ayrı-

ayrı leksik vahidlərə aydınlıq gətirməsidir. Məsələn “Kitabi-Dədə Qorqud”da indiyədək *ortac, çaya girsə, qanadıyla* kimi oxunmuş leksik vahidlər yeni əlyazmada *ornac, çapa girsə, qanadı ala* şəklindədir ki, bu da tamamilə düzgün variantdır. Ümumiyyətlə, yeni aşkarlanmış “Dədə Qorqud” əlyazmasını türkologiya üçün əlamətdar hadisə sayır və hesab edirik ki, bu dəyərli əlyazma kitabı ən yüksək səviyyədə və ətraflı şəkildə araşdırılmalıdır.

**Recently discovered manuscript of Dada Gorgud: new version of the epic**
**Summary**
In 2019, a new manuscript of Oguz’s main book, Dada Gorgud, was discovered. There is almost no textual consistency and correlation between the recently discovered manuscript and the famous manuscript copies of Kitabi Dada Gorgood. The new manuscript titled Matin Ekici is completely called: “The Book of Dede Korkut. Turkestan / Turkmen desert. 13th battle: The killing of the seven-headed dragon by Salur Casan. "The 31-page manuscript does not contain a title. Researchers studying the manuscript suggest that it dates from the 17th and 18th centuries. Due to the manuscript's artistic composition, we think it was prepared for a senior An official in a recently discovered manuscript of Deda Gorguda glorifies such qualities as courage and bravery and generosity, as well as humanity and kindness.

**Недавно обнаруженная рукопись «Китаби Деде Горгуда»: новая версия эпоса**
**Резюме**
В 2019 году была обнаружена новая рукопись главной книги Огуза «Дада Горгуд». Между недавно обнаруженной рукописью и известными рукописными копиями «Китаби Дада Горгуд» почти нет текстовой согласованности и корреляции. Новая рукопись названная Matin Ekici полностью называется: «Книга Деде Коркута. Туркестан / Туркменская пустыня. 13-й бой: убийство Семиголового дракона Салур Казаном”. 31-страничная рукопись не содержит заголовка. Исследователи, изучающие рукопись, предполагают, что она датируется 17 и 18 веками. Из-за художественной композиции рукописи мы думаем, что она была подготовлена для высокопоставленного чиновника. В недавно обнаруженной рукописи «Деде Горгуда» прославляются такие качества, как мужество и отвага, храбрость и щедрость, а также гуманность и доброта.

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/11-14

**Жұпар Тәжіқұлқызы Танауова**
Қожа Ахмет Ясауи атындағы Халықаралық қазақ-түрік университеті
Түркология ғылыми-зерттеу институтыны
tanjupar_1963@mail.ru

# ТҮРКІ ХАЛЫҚТАРЫНЫҢ ОРТАҚ ФОЛЬКЛОРЛЫҚ МҰРАСЫ – КҮЛДІРГІ ӘҢГІМЕЛЕР

***Кілт сөздер:*** *фольклор, кейіпкерлер, күлдіргі әңгімелер, түркі халықтары, ұлттық ерекшеліктер*
***Key words:*** *folklore, characters, humorous stories, Turkic peoples, national characteristics*
***Ключевые слова:*** *фольклор, персонажи, юмористические рассказы, тюркские народы, национальные особенности.*

Күлдіргі әңгіме кейіпкерлері Қожанасыр мен Алдаркөсе қазақ ауыз әдебиетінде ғана емес, бүкіл Шығыс және түрік халықтарының фольклорына ортақ кейіпкерлер дәрежесіне көтерілген. Қазақ фольклорындағы Алдаркөсе, Қожанасыр, өзбек ауыз әдебиетіндегі Афанди, Хожа Насриддин, түркімен фольклорында Кеминэ мен Мирали, ал ұйғыр ауыз әдебиетіндегі Саляй Чаққан мен молла Зайдин, түрікте Бекташ, қырғызда Шәршен, қарақалпақта Өмірбек сияқты т.б. күлдіргі әңгіме кейіпкерлері – бірін-бірі толықтырып отыратын образдар.

Әр халық ұлттық тіл ерекшелігіне қарай күлдіргі әңгімелерді әр түрлі атайды. Мысалы өзбектер мен ұйғырлар оны ләтифалар, татарлар мәзек, түрікпендер шота сөз дейді. «Орыс тілінде «анекдот» «байка» деп жүргеніміз де, сайып келгенде, осы күлдіргі әзіл әңгімелер деген түсінікті береді… Дүние жүзіндегі басқа да елдердің күлдіргі әзіл әңгімелері орыс тілінде «анекдоты» деген атпен шығарылып жүр. Ал «анекдот» деген сөздің өзінің төркініне үңілсек, ол грекше – жарияланбаған, ауызша тараған деген ұғымды білдіреді [1]. Анекдотты ғалым З.Ахметов былай түсіндіреді: «Анекдот (грек. anekdotos – жарияланбаған) – қысқа күлдіргі әңгіме, фольклордың барлық кезеңдерге тән, өміршең жанры. Басты ерекшеліктері – баяндаудың шындыққа жанасымдылығынан гөрі тапқырлық танытатын қызықтылығы, әдейі әзілдеп айту шеберлігі. Оқиғаның аяғы мүлде күтпеген жағдайға барып тіреліп, ой желісі тұтқиылдан кілт өзгереді, болған жағдай, іс-әрекет үйреншікті қалпынан бөлек, тосын басқа бір қырынан танылады. Анекдоттың ұтымдылығы тура мағынасында емес, ишарамен берілетін туынды мағынасында, пікірдің әдеттен тыс айрықша өткірлігінде. …Анекдот кейде өмірде болған, тарихта белгілі адамға байланысты қиыстырылып келтірілген қызықты оқиға, күлкілі жағдай болса, ал кейде өткір жауап қайырумен түйінделетін, әзіл-күлкі, кекесіні аралас сөз қағыстыру түрінде кездеседі» [2, 29 б.]. Сол сияқты «Латифа – шығыс әдебиетінің әдеби термині, қызықты күлкілі шағын әңгіме анекдот. Көбінесе белгілі бір адамның, кейіпкердің атына байланысты айтылады. Мысалы, тәжік әдебиетіндегі Мушфикиге, түрікмен әдебиетіндегі Кеминеге байланысты күлдіргі әңгімелер қазақтың Алдар Көсе төңірегінде айтылатын күлдіргі әңгімелерімен ұқсастығы мол» [2, 132 б.].

Анекдот жалпы әдебиетте көне заманнан белгілі. Батыс Еуропа беллетристикасында XVII–XVIII ғасырларда кең танылған. Ресейде XVIII ғасырдың II жартысында кеңінен таралған. «Анекдот» терминінің мағынасы – ақылды да тапқыр жауаптан тұратын кішігірім әзіл немесе күлдіргі әңгіме, оның мақсаты – белгілі бір кісінің мінез-құлқын, кемшіліктерін мазақ ету. Өз ішіне алуан түрлі тақырыпты қамтиды. «Кейбір анекдоттар өз ішіне саяси мағынаны да қамтиды. …Анекдот жайлы теориялық зерттеулер өте аз» [3, 21-52 бб.]. Анекдот көбіне диалогқа құрылады деген зерттеуші П.Әуесбаева анекдотты күлдіргі әңгімелердің бір түрі деп таниды [4, 21 б.].

Анекдотты ауызекі әңгімеден айырып алу қиынға соқпайды. Анекдотта кең түрдегі сюжет болмайды. Ол барынша қысқа, кейіпкерлер саны аз, тілі нақты, көркем болады. Ауызекі әңгіме мен анекдоттың айырмашылығы туралы пікірлер көп. Анекдотта тарихи оқиғалар сөз етілмейді, оның негізгі міндеті зәрлі мазақ пен зарарлы мінездерді көрсету. Ауызекі әңгімеде әзіл-сықақ реңі болмайды, бұл – тарихи маңызы бар нәрселерді баяндау [5, 5 б.].

Ұйғыр фольклорының жанрын зерттеуші М.Алиева ләтифа мен сатиралық ертегілердің бір-біріне жақын екеніне назар аударады: «К уйгурским сатирико-юмористическим сказкам очень тесно примыкают латифы (анекдоты). Близость этих жанров заключается в следующем:

1. Отдельные эпизоды или целые сюжеты бытовых сказок известны как латифы. Например, латифы «Каменные сапоги», «Апанди и дверь» – это эпизоды из таких сказок-загадок, как «Мастер и уче-

ник», «Умная девушка и жестокий хан». Сюжет о трех вопросах, известный как сатирическая сказка «Три мудрых совета», преобразовался в сатирический анекдот и.т.д.

2. В том и другом жанре популярен один и тот же образ – Апанди (или Ходжа Насыр). Апанди – один из центральных персонажей латифов. Однако в целом ряде сатирико-юмористических сказок безымянный герой или таз легко заменяется образом Апанди, т.е. они сосуществуют. Таковы сказки «Решение судьи», «Умный падишах», «Лавочник», «Апанди и три вора» и др.

3. Образ Апанди как в сказках, так и в латифах двойствен и противоречив. Отсюда и два типа сказок и латифов – с юмористическим и сатирическим направлением [6, 106 б.].

М.М.Алиеваның бұл пікірінен байқайтынымыз, Қожанасыр жайындағы латифа, яғни анекдот, сатиралық ертегілердің құрамындағы эпизод не сюжет ретінде кейін жеке жанрлық туынды болып бөлініп айтыла бастаған. Бірақ бұл үдеріс кері болмады деп кім айта алады? Мысалы, Е.Д.Тұрсынов Алдаркөсеге қатысты әңгімелер анекдоттардың бірігуінен пайда болды деген пікір айтады: «С другой стороны, эти сюжеты имеют в основном одноэпизодную структуру, строятся на неожиданной ситуации, а потому в жанровом отношении должны быть отнесены к анекдотам.

Таковы например, анекдоты «Алдар-Косе и черт», «Среднеазиатец и казах» в казахском фольклоре (Васильев, 1898; Потанин, 1917), «Кто старше?», «Кто больше знает песен?» – в туркменском («Кимиң яшы улы?», «Ким көп айдым билйэр?» – ЕД, 1964). Вместе с тем анекдоты об Алдаре имеют тенденцию к сцеплению, составляя таким образом повествования, объединенные общностью главного персонажа и сходным характером сюжетных ситуаций, строящихся на ловком обмане, а также вытекающей из последнего обстоятельства единой логикой развития действия» [7, 27–28 бб.].

Әдеби шығармалардың бөлшектенуінен гөрі бірігу үдерісі орын алатыны туралы араб әдебиетіндегі новелла жанрын зерттеуші Т.А.Мухтаров былай дейді: «Как уже отмечалось, ат-Танухи проделал большую творческую работу, сведя разрозненные анекдоты в единый сюжет. Автор произвел причинное сцепление анекдотов-эпизодов, в той или иной степени мотивируя наступление каждого последующего. Он раздвинул два эпизода бытовавшего в народе произведения и в образовавшуюся «рамку» поместил еще два анекдота…

Мы рассмотрели здесь целую серию анекдотов. Одни из них изложены как самостоятельное произведение, другие включены в некий единый сюжет и выступают как эпизоды одного развивающегося события, в котором возрастают все изображения индивидуальностей и появляется гуманистический элемент. Простая, непосредственная, бытовая народность повествования анекдота частично восполняется в новелле посредственно общенародным подходом, который сопряжен с усилением искусственности, «литературности» [8, 110-111 бб.].

Ал араб әдебиетіндегі навадир (көңіл көтерер әңгіме, анекдот) жанрын зерттеген Ж.Серікбаева бұл жанрдың пайда болуын ислам дінімен байланыстырады: «К числу наиболее популярных жанров арабской средневековой литературы относится навадир (мн. от надира), понимаемый как занимательный рассказ анекдотического характера, который дошел до нас в многочисленных сборниках, составленных на протяжении почти пяти историко-культурных веков с момента возникновения ислама и арабо-мусульманской культуры в начале VII в. вплоть до конца Аббасидского халифата в XII в.» [8, 3 б.]. Зерделей келсек, Қожанасыр жайындағы күлдіргі әңгімелер оқиғалары мұсылман қоғамымен өте тығыз байланыста. Тіпті мұсылманшылыққа қатысты емес болғанның өзінде де, ислам дінімен байланысты қоғам демі айқын сезіліп тұрады. Сонымен қатар Ж.Серікбаева навадир жанрының негізін салушысы әл-Джахиз деп көрсетеді: «Что же называет навадир ал-Джахиз (775-868 гг.), который считается основоположником нового направления в этом жанре? Для него это – уже определенный литературный жанр со своими каноническими параметрами, и он создает новое понятие этого термина, которое можно определить как сочетание следующих компонентов: нового для того времени стиля – с употреблением ссылок и цитат из Корана и хадисов, разнообразных остроумных выражений; речей, бесед и диалогов персонажей в индивидуализированной форме; разнообразной по своей палитровой гамме и популярной во времена ал-Джахиза литературной темы по различным вопросам этики, социальной жизни, психологии – описания в комическом свете разнообразных пороков – скупости, глупости, невежества и др.» [8, 8–9 б.]. Келтірілген пікірге назар салсақ, араб әдебиетіндегі анекдот сипаты бар күлдіргі әңгіме - навадир жанрының пайда болуы әл-Джахиздің «Сараңдар жайлы кітабы» жинағынан бастау алады. Және де бұл жанрды ерекшелейтін белгілерге мыналар жатады:

1. Белгілі бір өлшемі бар: өлшемнің негізінен қысқалығы айтылады;
2. Құран, хадистерден цитаталар келтіріп, басқа да тапқыр сөздерге иек артады;
3. Әңгіме, диалог, сөз нақты бір адамдарға телінеді;

4. Тақырыптық жағы сан қырлы: этика, психология, әлеуметтік қатынас сияқты мәселелерді қамти отырып, адамның сараңдық, ақымақтық, надандық тәрізді жаман құлықтарын күлдіргі формада сипаттайды.

Осы белгілерді қазақтың күлдіргі әңгімелерінен табуға бола ма? Бірінші белгі бойынша, шынында да күлдіргі әңгімелердің қысқалылығы, дұрысырақ айтсақ, нақтылылығы көзге ұрады. Ал Алдаркөсе жайындағы әңгімелер іс-әрекетті, оның нәтижесін жеткізуге байланысты баяндауға салынып, өлшем жағынан ұзақтау да болады. Екінші белгі бойынша, қазақтың күлдіргі әңгімелері Құран, хадис сияқты қасиетті сөздерге иек арта беруге шорқақ. Үшінші белгі бойынша, Қожанасыр туралы әңгімелердің басты кейіпкері Қожа, ал қалған кейіпкерлер оқиғаға байланысты жалпылама алынады, мысалы, қазылыққа келсе, жауап беруші, не базарда саудагер, ұры, алаяқ сияқты кейіпкерлер нақтыланбайды. Алдаркөсеге қатысты әңгімеде Шық бермес Шығайбайдан басқасының барлығы да Алдар өмір сүретін қоғам адамдары ретінде жалпы көрсетіледі. Төртінші белгіге келсек, белгілі дәрежеде, Қожа мен Алдар тақырыптарды саралап алғандай. Алдар көбіне сараңдықпен аты шыққан байларды, дүмше молдаларды алдап, олардың жаман құлықтары мен қылықтарын әшкерелеуде жаза қолдануға барын салса, Қожанасыр әбестік істер мен сөздерді, надандық, ақымақтық пен арсыздықты сөзбен шымшып, күлкі тудыратын істердің мәніне бойлай, еш жаза қолданбай, тек адамгершілік тұрғыда мінге жататынына ишара жасап білдіруге бейім.

Сонымен қатар Қожанасыр бейнесі де біркелкі емес. Бұл туралы М.Алиева былай дейді: «В одних сказках и латифах Апанди умный и проницательный, заступник обиженных. Непримиримый враг эксплуатации, он зло высмеивает и разоблачает представителей господствующего класса – ханов, баев, мулл, купцов, которые изображаются глупыми, ленивыми и назойливыми. Такие произведения резко сатиричны («Если падишах жестокң, «И ты в хозяина», «Ну и бог», «Деньги за молитву» и др.). В других сказках и анекдотах Апанди сам дурень, попадающий в положения, одно нелепее и комичнее другого; поэтому в быту уйгуров человеку, попавшему в глупое положение, говорят: «Ты, как Апанди».

Между этими противоположными сказками, из которых первые, как уже говорилось, глубоко сатирические произведения, а вторые – юмористические, можно выделить промежуточную группу: сказки и латифы, где, Апанди лишь кажется глупцом, точнее, одевает его маску. Например, он кажется до крайности наивным, угощая свой чапан байским пловом, но столько в этой нарочитой наивности сарказма и едкой сатиры. Следовательно, это промежуточная группа произведений объединяет сатирические и юмористические группы, воплощая собой и то и другое, но своим содержанием увеличивая число сатирических» [8, 144 б.].

Түрік халықтары ауыз әдебиетіне ортақ кейіпкерлер Қожанасыр мен Алдаркөсе тілі, діні бөлек елдердің ауыз әдебиетіне ауысқанда, оларға бірден сіңісіп кете алмаған. Олар басқа елдің от ауызды, орақ тілді шешендері мен су жұқпас суайттарына ұшырасады. Қожанасыр тек күлкілі кейіпкер ғана емес, ұстаз, данышпан бейнесінде, кейде алаңғасар аңқау түрінде кездеседі. Қарсыласы өзінен басым түскен уақытта Қожанасыр аңқау, ал қарсыласы аңқау болғанда, айла-амалы асқан қу болып шығады.

Қорыта айтқанда, Алдаркөсе мен Қожанасыр күлдіргі әңгімелері – тек қазақ халқына ғана емес, түркі халықтарына ортақ мұра. Олар қазақ халық ауыз әдебиетіндегі Алдаркөсе мен Қожанасыр әңгімелеріне тарихи-мәдени типология, генетикалық типология тұрғысынан да өзара ұқсас болып отырады. Түркі тілдес халықтардың күлдіргі әңгімелеріндегі ортақ сюжеттер мен мотивтер күні бүгінге дейінгі ұзақ даму процесін өткерді. Генетикалық ұқсастықтардың әр түрлі формада көрініс табуы біріншіден, ортақ рухани бастауларды аңғартса, екіншіден, мотив пен сюжеттің өзі даму, өзгеру үстінде болатын тарихи процесс екенін білдіреді. Тек түркі халықтары ғана емес, әлем халықтарының күлдіргі әңгімелеріне шола қарасақ, қай халықтың болмасын күлдіргі әңгімелері тақырыбы жағынан, кейіпкерлері мен көздеген идеялық мақсаты жағынан бір-біріне өте ұқсас, кей жағдайларда бірдей де болып кездесе береді. Бірақ сол ұқсас тақырып пен мазмұнды, кейіпкерлер мен типтерді күлкіге айналдыруда, әзіл-әжуа етуде әр халықтың өзіндік үні, өзіндік бояуы байқалып отыратынын естен шығармауымыз керек.

**Әдебиеттер:**

1. Сөз тапқанға қолқа жоқ. Құрастырған А.Бейсенғалиева. – Алматы, Жазушы, 1988. – 607 б.
2. Әдебиеттану терминдерінің сөздігі (Құрастырушылар: З.Ахметов, Т.Шаңбаев). – Алматы, Ана тілі, 1996. –240 бет.
3. Сидельникова В.М. Идейно-художественная специфика русского народного анекдота. «Вопросы литературоведения» вып. 1., – М.: 1964. – 21-52 стр.

4. Әуесбаева П.Т. Қазақ фольклорындағы әңгіме жанры: филол. ғыл. канд. дисс. авторефераты. – Алматы, 2000. 15-б.
5. Мореви А.К. Как работать с народными сказом. – М., 1939.
6. Турсунов Е.Д. Генезис казахской бытовой сказки (в аспекте связи с первобытным фольклорам) Издание вторoе. – Алматы: 2004. – 192 б.
7. Алиева М.М. Жанры уйгурского фольклора. – Алматы, 1989, 143 б.
8. Мухтаров Т.А., Серикбаева Ж.М. Наводир в средневековый арабской литературе. – Алматы, 2000. –120 с.

**Humorous Stories - National Heritage of Turkic Peoples**
**Summary**

Turkic peoples have always been in close contact with each other. It is known that the cultural and literary ties of neighboring peoples are closely intertwined. That is why the images, plots in the humorous stories of these peoples are united, forming a system of common characters. The article relates to scientific research on humorous stories - the common heritage of Turkic folklore - and compares them.

**Юмористические рассказы - народное наследие тюркских народов**
**Резюме**

Тюркские народы всегда были в тесном контакте друг с другом. Известно, что культурные и литературные связи соседних народов тесно переплетены. Вот почему образы, сюжеты в юмористических рассказах этих народов объединяются, образуя систему общих персонажей. Статья относится к научным исследованиям о юмористических рассказах - общем наследии тюркского фольклора - и сравнивает их.

Göndərilib: 27.02.2020 Qəbul edilib: 28.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/15-18

**Rövşən Ramizoğlu**
Səlcuq Universiteti (Konya, Türkiyə)
rovshan@selcuk.edu.tr

# TƏRCÜMƏŞÜNASLIĞIN İKİ APARICI NƏZƏRİYYƏSİNİN – DİLÇİLİK VƏ ƏDƏBİYYATŞÜNASLIQ NƏZƏRİYYƏLƏRİNİN TƏHLİLİ

***Açar sözlər:*** *tərcümə nəzəriyyəsi, tərcümə modelləri, dilçilik, ədəbiyyatşünaslıq*
***Key words:*** *translation theory, translation models, linguistics, literary criticism*
***Ключевые слова:*** *теория перевода, модели перевода, лингвистика, литературоведение*

Mədəniyyətin bir sahəsi kimi tərcümə haqqında danışarkən adətən ya tərcümə mətninin yaradılması prosesi, ya da bu prosesin nəticəsi nəzərdə tutulur. Son dövrlər tərcümə nəzəriyyəçiləri tərəfindən tərcümə prosesini öyrənən üç əsas model işlənib hazırlanıb. Bunlar situativ, transformasiya və semantik modellərdir. Tanınmış rus tərcümə nəzəriyyəçisi V.N.Komissarov özünün "Müasir tərcüməşünaslıq" kitabında bu modelləri xüsusi şərh edərək situativ modelin tərcümə prosesini dil və gerçəkliyin əlaqələri ilə bağlı olan linqvistik konsepsiyaların tətbiqi vasitəsilə öyrəndiyini yazır. Bu modelə görə istənilən situasiya istənilən dil vasitəsi ilə ifadə oluna bilər. Hətta dildə gerçəkliyin hansısa elementlərini əks etdirmək üçün lazımi vasitələr çatışmırsa belə, yeni sözlər yaratmaq və ya artıq mövcud olan sözlərdən istifadə etməklə bu çatışmazlığı aradan qaldırmaq olar.

Tərcümə prosesi zamanı sintaktik struktur seçiminin hansı yolla aparıldığını transformasiya modeli öyrənir. Transformasiya modeli dilin nüvə strukturunu tədqiq edən transformativ qrammatikaya əsaslanır. Bu modelə görə tərcümə prosesi üç mərhələdən ibarətdir. Birinci mərhələdə orijinalın üst strukturu onun nüvə stkrukturuna, ikinci mərhələdə orijinalın nüvə strukturu tərcümənin nüvə strukturuna, üçüncü – sonuncu mərhələdə isə tərcümənin nüvə strukturu onun üst strukturuna keçirilir.

Tərcümə prosesini öyrənən üçüncü model semantik modeldir. Bu modelə xas xüsusiyyətlərdən biri tərcümədə leksik-semantik əvəzləmələrin öyrənilməsidir. Bu əvəzləmələr adətən ya konkretləşdirmə, ya da ümumiləşdirmə yoluyla aparılır. Hər bir dildə əşyalar və hadisələr qrupunu bildirən ümumi və növləri bildirən konkret ifadələr mövcuddur. Tərcümə zamanı nə vaxt ümumini konkret, konkreti isə ümumi ilə əvəzləmək mümkün olduğunu məhz tərcümə prosesinin semantik modeli öyrənir.

Bu modellər bu günəcən tərcümə nəzəriyyəçiləri tərəfindən formalaşdırılan onlarla tərcümə modelindən yalnız üçüdür. Amma tərcümə modellərini, prinsiplərini və konsepsiyalarını tədqiq etməzdən öncə ilk növbədə "tərcümə nəzəriyyəsi nədir?" sualına cavab tapmaq lazımdır.

Tanınmış tərcümə nəzəriyyəçilərindən biri, müasir rus tərcüməşünaslığının banisi A.Fyodorov özünün "Tərcümə nəzəriyyəsinə giriş" kitabında tərcümə nəzəriyyəsinin filoloji fənn və dilçiliyin bir qolu olduğunu vurğulayır (9, 15). Sözügedən əsərin ikinci nəşrində o, tərcüməni belə xarakterizə edir: "Tərcümə etmək – bir dil vasitəsilə artıq başqa bir dildə ifadə olunmuşları dəqiq və tam şəkildə ifadə etmək deməkdir" (10, 15). Onun fikrincə bütün tərcümə növləri iki dil arasındakı qarşılıqlı əlaqəyə əsaslandığına görə, istənilən tərcümə problemi yalnız dilçiliyin çərçivələri daxilində həll oluna bilər (11, 16).

Q.Qaçeçiladzenin də bu məsələyə münasibəti maraqlıdır: "Tərcümə məsələlərini həll edə bilmək üçün orijinalın dilini və əsərin tərcümə olunduğu dili gözəl bilmək, eləcə də orijinalın meydana gəldiyi dövrün sosial şəraitini xüsusi olaraq öyrənmək lazımdır. Bu şərtlərə əməl olunması bədii tərcümənin müasir nəzəriyyəsinin və tədrisinin əsasını təşkil etməlidir" (3, 74). O, başqa bir fikrində tərcüməni yaradıcılıq fəaliyyəti kimi dəyərləndirir: "Bədii tərcümədə orijinal canlı gerçəkliyin orijinal yaradıcılıqda oynadığı rola oxşar vəzifələri yerinə yetirir. Tərcüməçinin yaradıcı üslubu əsasən onun dünyagörüşünə müvafiq olur. Öz dünyagörüşünün çərçivələri daxilində tərcüməçi seçdiyi əsərin bədii gerçəkliyini forma və məzmun vəhdətində, xüsusinin ümumiyə nisbətində əks etdirir" (4, 148).

J.P.Vine və J. Darbelne tərcümə prosesinə dilçilik nöqteyi nəzərindən yanaşırlar və "tərcümə prosesi zamanı tərcüməçinin iki linqvistik sistemi bir-birinə yaxınlaşdırdığını" (2, 157) yazırlar.

İ.Levıya görə "Tərcümə informasiyanın ötürülməsidir. Daha dəqiq desək, tərcüməçi orijinal əsərin müəllifinin yaratdığı mətndəki informasiyanın şifrini açır və onu öz ana dilinin sistemində əks etdirir (yenidən şifrələyir). Mətndəki informasiyanın kodunu isə tərcüməni oxuyan oxucu yenidən tapır" (5, 49). Tərcümə zamanı "kodların" təkcə məzmunun, yəni orijinalın məzmununun yenidən yaradılması baxımından yox, həm də forma-quruluşun, yəni orijinalın formasının yenidən yaradılması baxımından dəyişilməsi

prosesi gedir. Tərcümədə iki dil iştirak edir: orijinal yeni qeyri-ekvivalent forma qazanmaqla başqa bir ədəbi dil mühitinə keçir, amma bununla belə o, özünün məzmun komponentlərini, məzmununun ekvivalentliyini itirmir.

İnternetdəki “Kruqosvet Ensiklopediyası”nda isə tərcümə bu cür xarakterizə edilir: “Tərcümə – bir dildəki mətnin məzmununu digər dil vasitələri ilə ifadə edən fəaliyyət növü, eləcə də bu fəaliyyətin nəticəsidir” (7).

Orijinal mətn ilə tərcümə mətninin müqayisəsindən söz düşəndə hər şeydən əvvəl nəyi müqayisə etməyin vacibliyini aydınlaşdırmaq lazımdır; konkret sözu sözlə, yoxsa bütünlüklə bədii əsəri tərcümə əsəri ilə. Bu, tərcümə nəzəriyyəsinin yüz illərdir ki, mübahisə doğuran məsələlərindən biridir.

Tərcümə nəzəriyyəsinə dair məsələlər, bu sahədəki problemlər bu gün bir neçə istiqamətdən tədqiq olunur. Ümumiyyətlə isə tərcümə nəzəriyyəçilərini iki qrupa bölmək olar. Birinci qrupa daxil olan nəzəriyyəçilər dilçilik, ikinci qrup nəzəriyyəçilər isə ədəbiyyatşünaslıq nöqteyi-nəzərindən ümumi tərcümə nəzəriyyəsinin formalaşdırılmasını vacib sayırlar. Ümumi tərcümə nəzəriyyəsinin yaradılmasına cəhd göstərilən ilk dövrlərdən başlayaraq bu iki mövqe tərəfdarları arasında qızğın mübahisələr gedir. Tərcümənin dilçilik konsepsiyasını əsas tutan alimlər tərcümə prosesi zamanı itkinin baş verməsini, əlavələrin edilməsini qəbulolunmaz hal kimi dəyərləndirirlər. Onlar tərcüməyə dilçiliyin çərçivələri daxilində baxırlar. Tərcüməçi fəaliyyətinin linqvistik interpretasiyası üsulundan yararlanmaqla bu tədqiqatçılar tərcümə qanunauyğunluqlarını hər şeydən əvvəl iki dilin struktur xüsusiyyətlərindən asılı olan formal və funksional uyğunluqlara tabe etdirirlər. Bu meyli İ.İ.Revzinin, V.Y.Rozensveyqin, A.Q.Etingerin və digərlərinin mikrolinqvistik konsepsiyalarında müşahidə etmək olar.

Müasir dilçilikdə makrolinqvistika adlanan digər bir konsepsiya da mövcuddur. Bu konsepsiya tərəfdarları kommunikasiyanın ümumtarixi və situativ şərtləri kimi dil strukturundan kənarda olan ekstralinqvistik amillərə də diqqət ayırırlar.

Ədəbiyyatşünaslar isə öz növbələrində tərcüməni yaradıcı proses kimi dəyərləndirirlər. Onlar dilçilik qanunauyğunluqlarının bu prosesə tabe olduğunu bildirirlər. Məzmun və formanın vəhdətini vacib sayan ədəbiyyatşünaslar ictimai-siyasi, tarixi şərait, ədəbi cərəyanlar, üslub, emosional mühit, estetik təsir kimi amilləri də nəzərə alırlar. Bu mövqe tərəfdarları tərcüməçinin tərcüməşünaslığın dilçilik konsepsiyasında öz əksini tapmayan individual ustalığının və bədii zövqünün əhəmiyyətini xüsusi vurğulayırlar.

1954-cü ildə sovet yazıçılarının ikinci qurultayında tərcümə problemlərinin yalnız ədəbiyyatşünaslıq nöqteyi-nəzərindən araşdırılmasının düzgün olduğu qəti fikir kimi irəli sürüldü. Bu vaxt tərcümənin dilçilik nəzəriyyəsinin məhdudlaşdırılması və hətta birdəfəlik rədd edilməsi ilə bağlı fikirlər də səsləndi. Bu fikirləri səsləndirənlər dilin tərcümə zamanı oynadığı rolu musiqi bəstələnən zaman not yazılarının oynadığı rolla eyniləşdirir və onların hər ikisinin ikinci dərəcəli olduğunu iddia edirdilər. Ədəbiyyatşünasların bəzilərinin fikrincə tərcümə heç də linqvistik əməliyyat deyil və buna görə də, dilçilik elmi tərcümə nəzəriyyəsinin öyrənilməsi işinə öz töhfəsini verə bilməz.

Amma şübhəsiz ki, tərcümənin ən vacib vəzifələrindən biri orijinalın məzmununun və formasının bir dildən digər dilə köçürülməsidir. Bu formulun tətbiqi yalnız qarşımızda hansı növ orijinal mətnin – ictimai-siyasi, texniki və ya bədii – olmasından asılı olaraq dəyişir. Mətndəki hər bir element yalnız dil vasitəsilə ifadə olunur. Tərcüməçi – bədii söz ustası kimi mətndəki həm dil xüsusiyyətlərini, həm də mətnin ümumi bədii dəyərini yaxşı duymalıdır.

Keçən əsrin əllinci illərində A.V.Fyodorovun konsepsiyasını tənqid edənlər də məhz bu amilə əsaslanırdılar. İ.Kaşkin, P.Toper və bir sıra digər tərcümə nəzəriyyəçiləri tərcümənin ədəbiyyatşünaslıq konsepsiyasının düzgünlüyünü dönə-dönə vurğulayırdılar. Özünün “realist tərcümə nəzəriyyəsi”ndə İ.Kaşkin tərcüməni ədəbi hadisə kimi dəyərləndirirdi. Bununla belə o, dilçilik və ədəbiyyatşünaslıq konsepsiyalarını bir-birinə qarşı qoymağı yox, onların sintezini yaratmağı daha düzgün sayırdı.

XX əsrin 60-70-ci illərində bu mövzu ətrafında mübahisələr daha da qızışır. Bu dövrdə Q.Qaçeçiladze A.V.Fyodorov ilə elmi fikir mübadiləsi aparır. O, ədəbiyyatla dil arasında sıx əlaqələrin mövcudluğunun tərcümə nəzəriyyəsinin müstəqil fənn olmasına heç bir maneəçilik törətmədiyini söyləyir.

Bu cür fikir mübadilələri müasir dövrdə də aparılır. Bütün bu fikir ayrılıqlarına son qoymaq üçün ümumi tərcümə nəzəriyyəsi yaradılmalı və o, istənilən növ tərcüməyə aid əsas prinsipləri özündə əks etdirməlidir. Tərcümənin hər bir növünə müxtəlif amillər təsir göstərir. Bu səbəbdən bütün tərcümə növləri üçün bir ümumi prinsip yaratmaq qeyri-mümkündür. Ümumi tərcümə nəzəriyyəsi konkret nəzəriyyələrdən formalaşdırılmalıdır. Deməli, tərcümə nəzəriyyəsi kompleks şəklində öyrənilməlidir. Burada yalnız bir mövqeni əsas götürüb tədqiqat aparmaq olmaz.

Tərcüməşünaslığın ümumi xarakteri haqqında danışarkən dilçilik və ədəbiyyatşünaslıq elmləri ön plana çıxır. Tərcümə nəzəriyyəsinin dilçiliklə əlaqəsi onun elmi dəqiqliyə, ədəbiyyatşünaslıqla əlaqəsi isə estetik

keyfiyyətlərə yiyələnməsinə şərait yaradır. Bir vaxtlar Korney Çukovski tərcümə sənətinin tədricən elmə çevrildiyini, bununla belə həm də sənət olaraq qaldığını söyləyirdi.

Tərcüməşünaslıq elmi və tərcümə sənəti – bu anlayışlar heç də bir-birini inkar etmir. Tərcüməçiliyin sənət, yaradıcı peşə olduğu tərcüməşünaslıqda öz əksini tapıb. Hər bir sənət növü isə elmi cəhətdən əsaslandırılmış nəzəri bazaya malik olmalıdır. Tərcüməçiliyin bu bazası isə təkcə dilçilik və ədəbiyyatşünaslıq elmlərinə əsaslanaraq yaradılmamalıdır.

Tanınmış bolqar tərcümə nəzəriyyəçisi A.Lilova sosiologiyanın da tərcüməşünaslığa böyük təsir göstərdiyini vurğulayır. Bununla bağlı o yazır: "Tərcümənin sosial təbiətini, mahiyyətini, funksiyalarını nəzərə almadan onu dərk etmək və ona elmi tərif vermək mümkün deyil. Tərcümə cəmiyyətdən kənarda əmələ gələ, mövcudluğunu qoruya, yaşaya bilməz. O, yalnız ictimai inkişafın müəyyən mərhələsində digər vasitələrlə ödəmək mümkün olmayan tələbatlar yarananda və müvafiq şərait yetişəndə meydana çıxır.

Tərcümə cəmiyyətin inkişafı ilə bərabər inkişaf edib, zənginləşib, təkmilləşib" (6, 45). A.F.Şiryayevin fikirləri də A.Lilovanın fikirləri ilə üst-üstə düşür: "Tərcümə sosial vacib və ictimai əhəmiyyətli əməyi özündə cəmləyən fəaliyyət növüdür" (12, 10).

Təsadüfi deyil ki, müasir tərcüməşünaslıqda "dil və cəmiyyət" problemlərinin müxtəlif aspektlərini tədqiq edən sosiolinqvistika vacib əhəmiyyət daşıyır. Sosiolinqvistika tərcüməni mədəniyyətlər arasında körpü rolu oynayan fəaliyyət növü kimi dəyərləndirir.

İctimai elmlərdən isə tərcümə nəzəriyyəsinə ən yaxını tarixdir. Əslində, tarixi təcrübə nəzərə alınmadan heç bir elmi nəzəriyyə inkişaf edə bilməz. Bununla bağlı R.A.Budaqov yazır: "Bir dilin başqa bir dilin və ya dillərin leksikasına təsiri tarixi səbəblərlə müəyyən olunur" (1, 88).

A.Lilova isə tərcüməşünaslığın ümumi nəzəri bazası yaradılarkən bu elmin ictimai elmlərlə yanaşı dəqiq elmlərlə, məsələn, riyaziyyatla, kibernetikayla, informatikayla da əlaqələrinin araşdırılmasının vacibliyini vurğulayır (6, 24-25).

Göründüyü kimi keçən əsrin ortalarından başlayaraq tədqiqatçıların diqqətini özünə daha çox cəlb edən tərcüməşünaslıq bir növ sərhəddə duran elmdir. Bura həm poetik (obrazlılıq, məzmun, üslub, ədəbi dil, janrlar), həm estetik (dərk olunma və ifadə edilmə), həm dilçilik (fonetika, semantika, sintaksis, onomastika), həm də yaradıcılıq prosesinin psixologiyasını əks etdirən kateqoriyalar daxildir (6, 45-46).

Tərcüməşünaslığın kökü bir çox elmlərin kökləri ilə birləşir. Bu gün "tərcümə problemləri həm ənənəvi olaraq tərcüməni öyrənən (və öyrənməkdə davam edən), həm də qarışıq və qarışıq olmayan elmlər üçün böyük əhəmiyyət kəsb edir" (8, 4).

Hələ keçən əsrdə akademik A.N.Nesmeyanov XX əsrin ən bitkin kəşflərinin kompleks yanaşma, bir neçə elmin öyrənilməsi yoluyla edildiyini söyləyirdi. Tərcümə nəzəriyyəsinə də məhz bu cür yanaşma olmalıdır. Tərcüməşünaslıq müstəqil elm olmaqla yanaşı digər elmlərlə də sıx əlaqəlidir. Deməli, bu elmlərin hər birinin onun tədqiqat obyektinə – tərcüməyə təsiri var. Tərcümə tədqiqat predmetinə çevrilərkən bu təsiri nəzərə alıb dil, ədəbiyyat, etik və estetik, psixoloji, fəlsəfi, tarixi, sosioloji və s. amillər də nəzərdən keçirilməlidir.

**Ədəbiyyat:**

1. Будагов Р.А. Очерки по языкознанию. М.: Изд-во Академии наук, 1953, 280 с.

2. Вине Ж.П., Дарбельне Ж. Технические проблемы перевода / Вопросы теории перевода в зарубежной лингвистике. М.: Международные отношения, 1978, с.157-167

3. Гачечиладзе Г.Р. Художественный перевод и литературные взаимосвязи. М.: Советский писатель, 1972, 262 с.

4. Гачечиладзе Г.Р. Художественный перевод и литературные взаимосвязи. 2-е изд., М.: Советский писатель, 1980, 253 с.

5. Левый И. Искусство перевода М.: Прогресс, 1974, 397 с.

6. Лилова А.А. Введение в общую теорию перевода. М.: Высшая школа, 1985, 255 с.

7. Перевод. Энциклопедия кругосвет.
https://www.krugosvet.ru/enc/gumanitarnye_nauki/lingvistika/PEREVOD.html

8. Таирбеков Б.Г. Философские проблемы науки о переводе (Гносеологический анализ) Баку: Издание АГУ, 1974, 184 с.

9. Федоров А.В. Введение в теорию перевода. М.: Изд-во литературы на иностранных языках, 1953, 336 с.

10. Федоров А.В. Введение в теорию перевода. 2-е изд., М.: Изд-во литературы на иностранных языках, 1958, 370 с.

11. Федоров А.В. Основы общей теории перевода (Лингвистические проблемы). М.: Высшая школа, 1983, 303 с.

12. Ширяев А.Ф. Картина речевых процессов и перевод / Перевод как лингвистическая проблема. М.: МГУ, 1982, с. 3-12

**Analysis of two major theories, linguistic and literary theories, of translation studies**

**Summary**

In the article, it is mentioned that, translation theorists prepared three main models studying translation process - situative, transformation, semantic models. Their functions are determined on the basis of definitions given to these models.

It is stated that translation theories are classified into two groups. Theorists included in first group consider formation of general translation theory from the point of view of linguistics, whereas second group theorists take literary study as the basis for translation theory. Linguists examine translation within the frame of linguistics. Literary critics evaluate the translation as a creative process. It is mentioned that, the relationship with linguistics helps translation theory to gain scientific exactness, while connection to literature creates opportunity for obtaining esthetic qualities.

However, it is not right to put translation into the frame of two sciences. The core of translation is connected to other sciences. Therefore, together with social sciences, the importance of researching relationship of this field to exact sciences, for example, mathematics, cybernetics, informatics, is also stated in the article.

**Анализ двух ведущих теорий переводоведения: лингвистической и литературоведческой**

**Резюме**

В статье отмечается, что современные теоретики перевода разработали три определяющие модели переводческого процесса: ситуационная, трансформационная и семантическая. На основе определений, данных этим моделям, определяются и их функции.

В статье подчеркивается, что теоретики перевода делятся на две группы. Первая группа теоретиков рассматривает важность формулирования общей теории перевода с лингвистической точки зрения, а вторая группа с литературоведческой. Лингвисты рассматривают перевод в рамках лингвистики, а литературоведы определяют его как творческий процесс. Отмечается, что связь с лингвистикой способствует научной точности теории перевода, а связь с литературоведением способствует развитию ее эстетических качеств.

Но будет неправильно рассматривать перевод только в рамках двух наук. Корни перевода связаны с корнями многих наук. По этой причине в статье подчеркивается важность изучения связи переводоведения с социальными науками, такими как математика, кибернетика и информатика.

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/19-22

**Sevinc İslam qızı Əhmədova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
sevincasger@gmail.com

# AZƏRBAYCAN DİLİNDƏ DAD BİLDİRƏN SİFƏTLƏRİN SEMANTİK VƏ ÜSLUBİ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *sifət, semantik təhlil, "dad" kateqoriyası, üslubi çalar*
***Key words****: adjective, semantic analysis, the category of "taste", stylistic features*
***Ключевые слова****: прилагательные, семантический анализ, категория «вкус», стилистические особенности*

## Giriş

İnsanın empirik duyğuları arasında xüsusi yeri olan dad duyğusu orqanizmin xarici qıcıqlardan müdafiə reaksiyalarında mühüm rol oynayır və böyük emosional-psixoloji əhəmiyyətə malikdir. Dad duyğuları hissi idrak səviyyəsi və gerçəkliyin müəyyən zaman kəsiyi barədə biliklərimizin mənbəyi olaraq müxtəlif elmlərin – tibb, psixologiya, fiziologiya və s. – tədqiqat predmeti kimi çıxış edir. Bu da həmin elmlərin verdiyi məlumatların müvafiq dil hadisələrinin aydınlaşdırılması üçün linqvistik təhlil prosesində istifadə edilməsini nəzərdə tutur. XX yüzilliyin 70-ci illərində meydana çıxan koqnitiv psixologiya sahəsində,müasir psixoloji tədqiqatlarda insanın ətraf aləmi dərk etməsinin mexanizmlərini ortaya çıxarmaqda böyük işlər görüldü. Hər şeydən əvvəl, bu tədqiqatlarda ətraf aləmin insan tərəfindən qavranılmasında, o cümlədən qavrama anlayışına bir sıra dəqiqləşdirmələr gətirildi. Duyğular təkcə ətraf mühit, daxili aləmimiz, bədənimiz haqqında biliklərimizin mənbəyi deyil, həm də hiss və emosiyalarımızın mənbəyidir.

"Dad"ın bir anlayış kimi qavranılıb dərk edilməsi üçün onun fizioloji, psixoloji, koqnitiv, eləcə də linqvistik əsaslarına diqqət yetirmək lazım gəlir. Fizioloji mənada dad xüsusi bir duyğu, hiss olub, dilin selikli qişasındakı dadbilmə üzvlərinə və ağız boşluğunun bəzi hissələrinə maddə və cisimlərin təsiri ilə əmələ gəlir. Əksər fizioloqlar dörd əsas dad duyğusunun – acı, şirin, duzlu və turş – olduğunu qəbul edir. Müvafiq olaraq xalis dad duyğularını da yalnız dörd əsas dadda birləşdirmək olar: acı, şirin, duzlu və turş. Dad hissiyyatı koqnitiv sistemin bir hissəsidir. Həmin sistemə iybilmə, toxunma da daxildir. İndi mövcud biokimyəvi və biofiziki mexanizmlərin heç biri dadın hiss edilməsini təfərrüatı ilə izah edə bilmir. Dad xüsusiyyətlərinin insan tərəfindən dərk edilməsinin nəticələri özünün dildəki ifadəsini sifət kateqoriyasında, xüsusilə dad bildirən sifətlər qrupunda tapır.

Müasir Azərbaycan dilində "sifət", ingilis dilində "adjective", rus dilində "прилагательное" termini ilə adlandırılan söz kateqoriyasının mənşəyi problemi müasir dilçilikdə qəti həllini tapmadığı səbəbindən hər zaman tədqiqatçıların diqqət mərkəzində olmuşdur. Tədqiqatçılar arasında sifət kateqoriyasının mənbələri və diaxroniyası ilə bağlı fikir birliyi yoxdur. Məsələn, rus nəzəri dilçiliyində hələlik az və ya çox dərəcədə qəbul edilmiş ümumi fikir bundan ibarətdir ki, sifətlər isimdən törəmişdir (S.D.Katsnelson, A.A.Potebnya, L.P.Yakubinski, V.M.Jirmunski və s.). Sifət nitq hissəsi keyfiyyət və əlamət bildirən söz qrupu kimi dilçilik tarixində uzun müddət xüsusi bir adla göstərilməyib, semantik və sintaktik cəhətdən ayrıca bir nitq hissəsi şəklində fərqləndirilməmişdir. Əsrlər boyu digər sözlərlə birlikdə, müasir təsnifat meyarları üzrə isim statusu almaqla, onlar substantiv (əşyavi) mənaya malik olmuş, ad sinfinə aid edilmiş və sadəcə adlar adlandırılmışdır.

Türk dillərində tarixi baxımdan sifətin bir nitq hissəsi olaraq xüsusi morfoloji göstəriciləri olmamışdır, sifətin özünün müstəqil nitq hissəsi kimi mövcudluğu türkoloqlar arasında mübahisə yaratmışdır. Türkologiyada bu məsələyə XX əsrdə yeni baxış bucağından yanaşılmağa başlanmışdır. Bu yanaşmanın mahiyyəti ondan ibarətdir ki, sözün bu və ya digər nitq hissəsinə aid edilməsi bir yox, müxtəlif əlamətlər əsasında təyin edilməlidir. Həmin yanaşmanın formalaşmasında türk dillərini tədqiq edən rus dilçilərinin təsiri olmuşdur. Türk dillərində nitq hissələri nəzəriyyəsinin əsas müddəaları keçən əsrin ortalarında təxminən belə formalaşdırıldı ki, sözlərin nitq hissələrinə aid edilməsi üçün mühüm olan meyarlar morfoloji, semantik və sintaktik olaraq götürülməlidir.

Azərbaycan dilçiliyində nitq hissəsi kimi sifətə yanaşma müxtəlif olmuşdur. Belə müxtəliflik hətta sifətin bir nitq hissəsi olaraq məna tutumunun müəyyənləşdirilməsində özünü göstərmişdir. Dilçiliyimizdə sifət həm əşyanın əlamət və (ya) keyfiyyətini bildirən sözlər kimi [3, s.45], həm də ümumən əlamət və keyfiyyət bildirən nitq hissəsi olaraq göstərilir [5, s. 78]. Hətta dilçiliyimizdə sifətin yalnız "əlamət" bildirən söz kimi təqdim olunduğu da müşahidə olunur [7, s.36]. Azərbaycan dilçiliyində akademik və monoqrafik nəşrlərdə

sifətin tərifində işlədilən “əlamət” və “keyfiyyət” və ya yalnız “əlamət” terminindən istifadə edilməsi müəyyən izahat tələb edir. Bu məsələyə münasibət bildirən Y.Seyidov yazır ki, “.... əlamət və keyfiyyət müxtəlif anlayışlar kimi qəbul edilir. Əlamət deyəndə əşyanın zahiri görünüşü (gözəl, uca, geniş, ağ, qara), keyfiyyət deyəndə əşyanın daxili xüsusiyyətləri (yaxşı, ağıllı, mərd, paxıl) nəzərdə tutulur. Əlamət termini təkcə işlədiləndə bu xüsusiyyətlərin hamısı (həm zahiri, həm də daxili) anlaşılır [8, s. 98]”. Q.Kazımov qeyd edir ki, “sifət əşyanın əlamətini və ya keyfiyyətini bildirən bir söz qrupu kimi, başqa nitq hissələrindən mənasına, morfoloji əlamətinə və sintaktik vəzifəsinə görə fərqlənir. Sifətlər konkret lüğəvi mənasına görə əlamət və ya keyfiyyət bildirdiyi kimi, ümumiləşmiş qrammatik mənasına görə də əlamət, keyfiyyət bildirir və bu cəhət onu başqa nitq hissələrindən fərqləndirməyə imkan verir [6, s. 69]”.

Azərbaycan dilində “dad bildirən sifətlər”, “dad sifətləri”, “dad məfhumu bildirən sifətlər”, “dad ifadə edən sifətlər”, “dad əlamətlərini ifadə edən sifətlər” kimi terminlərlə adlandırılır. Azərbaycan dilçiliyində istifadə edilən dörd terminin yalnız biri – dad bildirən sifətlər – mahiyyət etibarilə məzmunu ifadə edə bilir. Fikrimizcə, sonuncu termin daha məqbul sayıla bilər. Ayrı-ayrı dillərin materiallarına əsaslanan araşdırmalarda dad bildirən sifətlərin vahid təsnifatının olmaması da vurğulanmalıdır. Müxtəlif araşdırmalarda tədqiqatçılar ya semasioloji, yəni ümumi semantik komponent əsasında, ya da onomasioloji, yəni sözün mənasının müəyyən anlayışla əlaqəsi, nisbəti prinsipindən çıxış edərək sifətləri konkret qrupa daxil edirlər. Bu zaman həm dad duyğusunu ifadə edən sifətlər, həm də dad duyğusunu səciyyələndirən sifətlər eyni qrupa aid edilir.

Azərbaycan dilində: acı, acılı, acımış, acımsov, acımtıl, apacı, ballı, dadlı, dadsız, duzlu, duzsuz, ədviyyatlı, ədviyyəli, kəmşirin, kəskin, qaxsımış, qaxsınmış, qəndli, ləziz, ləzzətli, ləzzətsiz, limonlu, meyxoş, sirkəli, şomşor, şəkərli, şərbətli, şimşit, şipşirin, şirəli, şirəsiz, şirin, şirincə, şirinhal, şirinli, şirinsov, şirintəhər, şit, şor, şorakətli, şoranlı, şorməzə, tamlı, tamsız, tumturş, turş, turşaşirin, turşhal, turşməzə, turşulu, turşumuş, tünd. Sonra həmin siyahıdan dad mənası əsas olan sifətlər bu mənanın üzə çıxarılması üçün tətbiq edilən bir sıra qaydalar [10, s.78] əsasında seçilir və dad bildirən əsas leksik vahidlərin siyahısı aşağıdakı tərkibdə müəyyənləşdirilir: acı, şirin, turş, şit, şor. Azərbaycan dilində duzlu sifətləri siyahıya daxil edilmir, çünki onlarda dad mənası nominativ deyil, törəmədir. Lakin həmin sözlər də tədqiqatdan kənarda saxlanmır. Lüğətlərdə verilmiş izahlara əsaslanaraq, dad bildirən sifətlərin qarşılaşdırılan dillərdə aşağıdakı cərgələr əmələ gətirdiyini söyləmək olar:

a) məzmununda dadın olduğunu təsdiq edən sifətlər: acı, acılı, ballı, duzlu, şəkərli, şirin, şirinhal, şorməzə, şipşirin, kəmşirin, dadlı, tamlı, ləziz, ləzzətli və s.

b) məzmununda dadın olduğunu inkar edən sifətlər: dadsız, şit, duzsuz, ləzzətsiz, tamsız və s.

Dad bildirən sifətlər müxtəlif qrup və yarımqruplarda birləşərək mikrosahələr əmələ gətirir ki, onları da aşağıdakı cədvəl şəklində təsvir etmək olar:

| | |
|---|---|
| **Şirin** mikrosahəsi | şirin, şirintəhər, şirinhal, şirinsov, kəmşirin, şirincə, meyxoş, turşaşirin, şirinliacılı, şipşirin, şəkərli, qəndli, ballı, şirəli, şərbətli |
| **Acı** mikrosahəsi | acı, acımsov, acımtıl, acılışirinli, tünd, kəskin, apacı, acımış, qaxsımış, qaxsınmış, ədviyyatlı, ədviyyəli |
| **Turş** mikrosahəsi | turş, turşhal, turşməzə, meyxoş, şorməzə-turş, tumturş, turşaşirin, limonlu, turşulu, turşumuş, sirkəli |
| **Duzlu** mikrosahəsi | duzlu, şor, şorməzə, şomşor, şoranlı, şorakətli, şorməzə-turş salt, |
| **Duzsuz** mikrosahəsi | duzsuz, şit, şirin |
| **Dadlı** mikrosahəsi | dadlı, ləzzətli, ləziz, şirəli, |
| **Dadsız** mikrosahəsi | dadsız, şit, şimşit, ləzzətsiz, şirəsiz, tamsız |

Cədvəldən göründüyü kimi, müxtəlif qruplar arasında kəskin sərhəd qoymaq həmişə mümkün olmur. Bu ondan irəli gəlir ki, dad əlaməti bildirən eyni bir sifət müxtəlif qrupa daxil ola bilir. Məsələn, Azərbaycan dilində turşaşirin, meyxoş sifətləri həm “Şirin”, həm də “Turş” mikrosahələrinə daxildir, yaxud Azərbaycan dilində tünd sifəti həm “Acı” mikrosahəsinə, həm də “Turş” mikrosahəsinə daxil edilə bilər. Şit sifəti “Duzsuz” mikrosahəsində yer aldığı kimi, “Dadsız” mikrosahəsində, azərbaycan dilində şirin sifətləri isə həm “Şirin”, həm də “Duzsuz” mikrosahələrində yerləşdirilə bilir. Dad əlamətinin təzahüründəki müxtəlif dərəcələrin ifadə edilməsi üçün qarşılaşdırılan dillərdə analitik konstruksiyalardan geniş istifadə edilir.

Ədəbi dilin funksional, xüsusilə bədii, qismən də publisistik üslublarında ekspressivlik mənbəyi kimi sifətin üslubi imkanlarını nəzərə almamaq olmur. Hər bir dilin bədii ədəbiyyatında sifət nitq hissəsinin üslubi imkanlarını üzə çıxarmağa şərait yaradan gözəl nümunələr vardır. Akad. A.A.Axundov yazır ki, "Bədii əsərin gözəlliyi üçün əsas şərt olan bədii mükəmməllik bu və ya digər əsərin yalnız kompozisiyası, canlı və parlaq obrazları ilə deyil, eyni zamanda həmin əsərin dili ilə təyin edilir: bədii yaradıcılıq məhsulu o zaman qiymətli olur ki, onun dili də yaxşı olur, oxucunu ələ ala bilir, onu həyəcanlandırır". Danışıq, bədii və publisistik üslublarda dad bildirən sifətlər çoxfunksiyalılıq nümayiş etdirir. Belə mətnlərdə həmin leksika həm birbaşa, həm də məcazi mənalarda müxtəlif üslubi məqsədlərlə istifadə edilir. [1, s. 67]

"Şirin" dad bildirən sifətlər Azərbaycan dilində istər ilkin məna, istərsə də törəmə mənalar baxımından geniş imkanlarla üzə çıxır. Şirin dad, ümumiyyətlə, xoş, pozitiv hissi ifadə etdiyi üçün sənətkarlar tərəfindən onların bu imkanlarından istifadə edilərək nitqin daha ekspressiv, ifadəli olmasına çalışılır. Şirin dad bildirən sifətlər bədii-poetik mətnlərdə əsasən eşitmə, görmə, iy, qoxu ilə bağlı obrazların təqdimatında çıxış edir. Acı dad xoş olmayan, neqativ hissi ifadə edir. Bu səbəbdən acı dad bildirən sifətlərdən müxtəlif mətnlərdə insana xoş olmayan, neqativ hiss və duyğuların ifadəsində istifadə olunur. Həmin sifətlərin semantik strukturunda qiymətləndirmə metaforasının köməyilə yaranan məcazi mənalar meydana çıxır

Bədii ədəbiyyatdan toplanan nümunələr şirin sifətinin aşağıdakı mənalarını fərqləndirməyə imkan verir:

1. Şəkər və ya bala xas dadı, tamı olan. Bu, şirin sifətinin əsas, denotativ mənasıdır. Onun reallaşmasında şirin sifəti aşağıdakı isimlərlə birləşmə əmələ gətirir: a) dad adı bildirən: şirin dad, şirin tam. Limonadların qəbulundan sonra ağızda şirin dad qalır ("Həftə" qəz.); b) içki adları: Çoxları daha çox şirin çaxır içirdilər. (Elçin). Necə yəni çayınız qəndsiz də şirin olar? c) meyvə və giləmeyvə adları: şirin gilas, şirin qarpız, şirin alma, şirin gavalı və s. Elə ən şirin meyvələr də ağacın lap yuxarılarında olar (S.Səxavət). Şaftalısı - nabatlı, Üzümləri - şirin qənd (X.Əlibəyli). Hamısı şirin nar dənəsidi (Ə.Cəfərzadə); d) qida məhsulları, yemək adları: Bu arıların balı da şirin olur (Anar). İmsakda çox yağlı, çox duzlu və həddindən artıq şirin yeməklər məsləhət deyil.

2. Təmiz, içməyə yararlı. Bu məna şirin sifətinin əsas mənası ilə əlaqəlidir. Həmin mənada şirin sözü əsasən "su" ismi ilə işlənir. Su və suyun qərar tutduğu bulaq, çay, göl, dəniz və s. isimlərlə işləndiyi məqamlarda şirin sifəti atributiv və predikativ funksiyalarda işlənir. Ətraf su səltənətiydi – birbirindən şirin bulaqlar, bir-birindən soyuq, buz kimi, dupduru bulaqlar (Anar). Şirin idi, bal kimi, daşdan sızıb gələn sular idi quyu suları (Ə.Cəfərzadə).

3. Ürəyəyatımlı, sevimli, əziz. Bu mənada şirin sifəti qız, gəlin, insan, adam tipli konkret isimlərlə birləşmə əmələ gətirir. ... ucaboy, şirin, əsmər bənizli qız isə onun yanından elə keçirdi ... (İ.Əfəndiyev).

4. Qulağa xoş gələn, ahəngdar. Bu mənada şirin sifəti qulaqla eşidilə bilən hər bir şeyi bildirən isimlərlə (səs, söz, avaz, zümzümə, nəğmə,musiqi,15 ton, mahnı, ləhcə, gülüş, sükut və s.) birləşmə əmələ gətirir: Bütün qızlar kimi onu da şirin sözlər meyxoş edirdi(İ.Şıxlı). ...bir azdan uşağın şirin mışıltısı eşidildi (A.Quliyev).

5.Ümumən xoş qavranılan, xoş duyğular bəxş edən, rahatlıq gətirən//verən, xoş xarakterli.Həmin mənada şirin sifəti aşağıdakı isimlərlə birləşmə əmələ gətirir: a) həyatın müxtəlif dövrlərini, situasiyalarını bildirən isimlərlə: Həqiqi mənada yaşanan ömürlər çətinliklərdən, əzablardan keçəndə çox şirin olur (Şərq qəzeti); b) yaşanan zamanın müxtəlif kəsiklərini bildirən isimlərlə: şirin vaxtlar, şirin dəqiqələr, şirin anlar və s.: Təskinliyim isə budur ki, bu kiçik yazını qələmə alıb, gözəl bir poeziya axşamından yaddaşımda qalan şirin anları xatırladım (C.İbrahimli); c)insanın fəaliyyəti,vəziyyəti, hiss və duyğularını bildirən isimlərlə: Yaqut xanımın şirin yuxusuna haram qatılar (Anar). ... anlaşılmaz, şirin ağrılar dolu bu ecazkar məhrəmlikdə əriyib itmək qorxusuyla... heç vaxt adam kimi yaşaya bilməyəcəyimi anlayıram (A.Məsud); d) insanın davranış tərzi ifadə edən isimlərlə: şirin əhval-ruhiyyə, şirin xasiyyət, şirin naz-qəmzə

6. Xoş ətri // qoxusu // iyi olan. Bu məna dad və qoxu duyğularının birgə çıxış etdiyi metaforik məna əsasında "dad" sahəsinə aid sifətin "qoxu" sahəsinə köçürülməsi ilə ortaya çıxır. Sərin, dinc otluğun şirin ətrindən, bulaqları andıran dadlı tamından özgə heç nə duyulmurdu (S.Əhmədli)

Turş sözü üçün Azərbaycan dilində aşağıdakı izah verilir: "TURŞ sif. [fars.] Sirkə, limon, lavaşana və s. dadında olan" [2, s. 78]. Lüğətdə verilən izah turş sifətinin təkmənalı söz olduğunu, yalnız dad bildirdiyini göstərir.

Bəzi tədqiqatçılar yazırlar ki, "Azərbaycan dilində turş sifəti, əsas etibarilə, dad ifadə edir və ingilis dilindən fərqli olaraq, insanlara tətbiq edilmir. Belə ki, biz nə danışıq dilində, nə lüğətlərdə, nə də bədii ədəbiyyatda "turş görünüş" və ya "turş xasiyyət" kimi birləşmələrə rast gəlmədik." Azərbaycan dilindəki turş sifətinin təkcə dad bildirməyib, insana aid edilə bilən məna çaları bildirdiyini bir sıra isimlərlə birləşmələrində müşahidə etmək olar. [4, s. 67]

Azərbaycan dilində duzlu sifətinin semantik strukturunda "xoş, ürəyəyatan, sevimli, xoşagələn, qanışirin, suyuşirin, yapışıqlı, cazibəli, maraqlı" məna çaları mövcuddur. Bu mənada duzlu sifəti adam, insan, qız, oğlan, cavan və s. isimlərlə işlənərək insanlara şamil edilir: ... Şəmistan ağanın deyib-gülən, at çapan, nazlı-duzlu bir bir qızı var (İ.Şıxlı).... özü duzlu adam idi. (S.Səxavət). Duzlu sifəti danışıq, söhbət, xəbər, dil,

üslub, şeir, hekayə, kitab, lətifə, atmaca və s. isimlərlə də işlənir: Bu qəribə əhvalatları özünəməxsus cod, yonulmamış, acıq-saçıq, amma duzlu bir üslubla danışırdı (S.Rüstəmxanlı).

**Nəticə.** Əlamət və keyfiyyət bildirən sözlərin ümumi dilçilikdə, türkoloji və Azərbaycan dilçiliklərində tədqiqi məsələlərinin nəzərdən keçirilməsi bir daha belə bir qənaətə gəlməyə əsas verir ki, bu sahələrin hər birində sifət nitq hissəsinə yanaşmada təxminən eyni, mübahisəli, lakin kifayət qədər nəzəri cəlb edən mənzərə müşahidə olunur. Azərbaycan dilində dad bildirən sifətlərin semantik strukturunun müqayisəsi aşkar şəkildə göstərir ki, dad bildirən leksik vahidlərin semantikasının milli spesifikasının təzahürü hesab edilə bilər. Azərbaycan dilində dad bildirən sifətlərin oxşarlığı özünü belə bir faktda göstərir ki, onların semantik strukturunda eyni məna tipləri ayırd edilə bilir: əsas (ilkin) nominativ məna; törəmə nominativ məna, əsas məna əsasında motivləşmiş törəmə-nominativ məna, frazeoloji bağlı məna. Azərbaycan dilində şirin, acı, turş, şit, şor, duzlu söz cərgəsi ilə təmsil olunan dad bildirən sözlərin vahid sistemi meydana çıxmışdır. Dad bildirən sifətlərin məzmunu göstərilən bu semantik əlamətlərlə hüdudlanmır. Tədqiq edilən sifətlərin semantik strukturuna eyni zamanda dad hissindən əlavə digər hiss orqanları ilə əlaqəli semalar da daxil olur ki, bu da həmin sifətlərin semantik strukturunu konnotativ, məcazi məna çalarları ilə zənginləşdirir. Frazeologizmlərin tərkibində dad bildirmə müxtəlif üslubi funksiyalar yerinə yetirir, informativliyi zənginləşdirir, ona obrazlılıq verir. Dad bildirən sifətlər Azərbaycan dillərinin funksional üslublarının demək olar ki, hamısında təmsil olunur. Onlar obrazlılığın, üslubi priyomların, məcazların, fiqurların yaradılması üçün tikinti materialı kimi çıxış edir, hər iki dilin linqvo-üslubi vasitələrinin tərkibində fəal iştirak edir.

**Ədəbiyyat:**

1. Axundov A. Dilin estetikası. Bakı: Yazıçı, 1985, s. 219
2. Azərbaycan dilinin izahlı lüğəti. IV c. Bakı: Şərq-Qərb, 2006, s. 377
3. Azərbaycan dilinin qrammatikası.I hissə. Azərbaycan SSR EA-nın nəşri, 1951, s.118
4. Əliyeva Nərmin. İngilis dilində sifət. Oçerklər. Bakı: Elm və təhsil, 2010, s. 268
5. Hüseynzadə M. Müasir Azərbaycan dili. Morfologiya. 3-cü hissə. Bakı: Maarif, 1983, s. 72- 73
6. Kazımov Q.Ş. Müasir Azərbaycan dili. Morfologiya. Bakı: Nurlan, 2010, s. 98
7. Müasir Azərbaycan dili, II cild, Morfologiya. Bakı: Elm, 1980, s. 95.
8. Seyidov Y. Azərbaycan dili. Bakı: Maarif, 1978, s. 82. 4
9. Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya (ikinci nəşr). Monoqrafik dərs vəsaiti. Bakı: Bakı universiteti nəşriyyatı, 2002, s. 267.
10. Tahirov İ. Azərbaycan və ingilis dillərində zaman kateqoriyası. Bakı: Nurlan, 2007, s. 126.

**Semantic and stylistic features of taste adjectives in azerbaijan language**

**Summary**

The article gives general information about the concept of "taste" and its the semantic features in Azerbaijani language, and it is mentioned in different languages. In general, the attributes included in this group are involved in linguistic research on the materials of the Azerbaijani language. Identifying the typology and specificity of the semantic variation of lexical units, which defines the attributes and qualifications, will determine the dependence of the semantics and the context in which they are used as a speech part.

**Семантические и стилистические особенности прилагательных вкуса на азербайджанском языке**

**Резюме**

В статье дается общая информация о категории «вкуса», раскрывающая смысловые особенности вкуса на азербайджанском языке, и она упоминается на разных языках. В целом, атрибуты, входящие в эту группу, часто становятся предметом исследования лингвистических исследованиий на материалах азербайджанского языка. Определение типологии и специфики семантической вариации лексических единиц, которая определяет атрибуты и квалификации, определит зависимость семантики и контекста, в котором они выступают в качестве речевой части.

**Rəyçi: prof. C.Cəfərov**

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

**ELMİ İŞ (beynəlxalq elmi jurnal) 2020, №02/51** **ISSN 2663 – 4619 / Print**
**filologiya / philology / филология**

DOI: 10.36719/AEM/2007-2020/51/23-26

**Nigar Firuz qızı Sadıqova**
Bakı Slavyan Unversiteti
nigarsadiqova1@gmail.com

## QƏTRAN TƏBRİZİNİN GƏNCƏ SƏFƏRLƏRİ

***Açar sözlər:*** *Qətran Təbrizi, Gəncə səfəri, şair, yol*
***Key words:*** *Gatran Tabrizi, trip to Ganja, poet, road*
***Ключевые слова:*** *Гатран Тебризи, поездки в Гянджу, поэт, путь*

XI əsr Təbriz.Orta əsr şairlərinin taleyində nə qədər oxşarlıq olarmış! Ürəyi "tənbur kimi sevinc və şadlıq xali" olan gəncurə - xəzinədara oxşadaraq, talesizliyindən, ona rəva görünən azar-əziyyətdən qoca çağlarında əzab çəkən Qətran acı-acı şıkayət edir. Məlum olur ki, Səlcuq ordubaşçıları şairin Təbrizdəki bağını da əlindən almışlar:

شده جوخانه زنبور باغم از تركان
همى خلند بفرمانها جو زنبورم (1, 491)

*("Bağım türkmənlərdən arı pətəyinə dönmüşdür,*
*Onlar öz fərmanları ilə məni arı kimi sancarlar..."*

Burada ləpirlər itib batır... Fəqət, geriyə dönüb baxdıqda keçib gəldiyimiz yoldan bir qədər aralı kiçik bir cığırın ağardığını görürük. O getdikcə böyüyür: Gəncə yolu! Bir zaman şairin irəlilədiyi yol! Yenə onun hənirtisi duyulur, ləpirlərini tapır, atının ayaq səslərini eşidirik. Budur, ikinci dəfə Gəncə səfərinə hazırlaşan şair sevgilisi ilə vidalaşır:

جو كردم ز تبريز رو سوى گنجه      زدورى بدل برنشانده نهالى
بت سيم سيما شد آگاه و آمد      نموده دلش مايهٔ هر دلالى
بكوش اندرون گوشوارى نهاده      جو بر كوشهٔ بدر بسته هلالى
رخ از درد كشته بسان ترنجى      تن از رنج كشته بسان خلالى
بزارى مرا گفت اى برگرفته      دل از دلبرمهر بان بى وبالى
بيارام يك جند ازآن راه كردن      كه داد از هنر ذوالجلات جلالى
اگر يار خواهى ترا هست يارى      و اگرمال خواهى ترا هست مالى
مگر يارت آمد همى يار بيشين      كت آمد زبيوستن ما ملالى
چنان خيز رانى كه در سرو بيجد (1, 392-393)      بگردن در آورد نش زود بالى

("*Təbrizdən üzümü Gəncəyə tutub,*
*Könlümdə ayrılığın fidanın basdıranda,*
*O gümüşcamallı agah olub gəldi.*
*Elə bil naz-qəmzədən yoğrulmuşdu.*
*Qulağına sırğa taxmışdı,*
*Elə bil bədirlənmiş ayın guşəsindən hilal asılmışdı*
*Çöhrəsi dərddən turunca,*
*Canı əziyyətdən çöpə dönmüşdü.*
*Ağlaya-ağlaya mənə dedi:*
*"- Sən ey suçsuz-günahsız mehriban dilbərindən könlünü almış aşiq!*
*Bu yola çıxmaqda bir zaman usan!*
*Zülcəlalın ki, hünərinə görə sənə hər cəlala veribdir:*
*Əgər yar istəyirsən, yarın var,*
*Əgər mal istəyirsən, malın var.*

Şeirin məzmunundan məlum olur ki, şair Gəncə əyanlarından Əbülfərəc adlı köhnə dostunun[1] görüşünə tələsir (1, 521). Bu onların ikinci görüşü, yaxud şairin Gəncəyə ikinci بار ديگر gəlişidir. Seyid Əhməd Kəsrəvi bu səfərin Əbülmüzəffər Fəzlunun hakimyyətə gəldiyi 1066-67ci illərdə baş verdiyini, həmin şeirin də bu

[1] Qətran dövrün ziyalılarından olan saray hacibi Əbülfərəclə hələ Ləşkəri vaxtından tanışdı. Şair onun adını ilk dəfə Təbrizdən Əbülyüsərə göndərdiyi məktubunda (Məsnəvi) çəkir.

vaxtlar yazıldığını təxmin edir. Bu mülahizə ilə barışmaq çətindir. Başqa əsərlərindəndə hiss edildiyi kimi, bəşarət adamı olan şairin sevgilisi ilə bu sayaq intim münasibətləri qocalığını təsdiq etmədiyi kimi, (1066-67-ci illərdə Qətranın altmışa yxın yaşı vardı) cəlal, mal-mülk hərisi olduğunu da təsdiq etmir həyatına aid edilə bilməz. Demək, şeir daha qabaqlarda yazılmışdır.

Qətranın Gəncəyə ikinci səfərinin yenə Vəhsudanın dövründə, təqribən 1040-47-ci illərdə baş verdiyini düşünmək olar. 1048-ci ildə artıq Ləşkəri süqut etmiş, Ani Şəddadilərin olan Əbüs-süvar Şavur Aranda hakimiyyət başına keçmişdi. Beləliklə, Əbüs-süvarın hakimiyyətdə olduğu 1066-cı ilə qədər şairin Gəncəyə gəlmək ehtimalı ortadan çıxmış olur. Çünki Qətran onun siyasi rəqibi Ləşgərinin sarayında xidmət etmişdi. Bəlkə də Ləşkəri ilə kəsdiyi duz-çörəyi xatirinə idi ki, Şəddadilərin bu çox qüdrətli hökmdarına – Əbüs-süvara bircə şeir belə ithaf etməmişdir.

Bəs Qətranı qocalıq çağlarında Aran hökmdarı Əbülmüzəffər Fəzluna (1066/67-1088/89) bağlayan səfər?.. demək, şairin Gəncəyə üçüncü səfəri də olmuşdur. Deməli, Gəncəyə bir və ya iki deyil, bir neçə dəfə gəlmişdir. Lakin son səfəri nə vaxt olmuşdur? Aran hökmdarı Əbülmüzəfər Fəzlunun hakimiyyətə gəldiyi ilk günlərdəmi, yoxsa daha sonralar? Bu suala düzgün cavab vermək Səlcuqilərin Azərbaycanı ikinci dəfə təsir altına almaq cəhdləri ərəfəsində şairimizin həyatını, heş olmazsa onun ümumi cizgilərini müəyyənləşdirməyə, vəfat tarixini dəqiqləşdirməyə kömək edir.

50-60-cı illər Azərbaycanda Əbu Mənsur Vəhsudan və Məmlanın hakimiyyət illəridir (Toğrul 1058-ci ildə rəsmi olaraq, Əbu Nəsr Məmlan ibn Vəhsudanı Azərbaycan hakimi təsdiq etmişdi). Demək bu bir daha əsas veriri ki deyək ki, Qətran, heç olmazsa, 1066-67-ci ilə qədər Təbrizdə olmuşdur. Halbuki daha sonralar da ola bilərdi. Çünki Məmlandan sonra Əbdülxəlil Cəfər (Əbdülxəlil məlik Cəfər bin İzzəddin) zühur edir. Sonralar görəcəyik ki, şair onu Azərbaycan hökmdarı adlandırır, sarayını təsvir edir, Sipahana səfərini, müharibələrini qələmə alır... Qətran hətta yoxsul kəndinə çəkilib ehtiyac içərisində yaşadığı vaxtlarda da, qabaqda göstərildiyi kimi, Əbülxəlilə mürciət edib şikayətlənirdi.

Aran hökmdarının sarayına şairin yaxınlığı Xürüşnənin fəthi (464) (1071-72) və II Fəzlunun Məlikşah Tərəindən tutulub Astrabada sürgün edilməsindən bir qədər qabaq olmamlıdır. Qətranın Şəddadi hakimi həsr etdiyi kimi sayca az olan şeirlərində Fəzlunun məhz Astrabaddan qaytması və bundan sonrakı əhvalatların əks olunması da bu gümanı qüvvətləndirir.

Qətran Əbülmüzəffər Fəzulun Astrabaddan qayıtması münasibəti ilə yazdığı بهرچیزی بود خرسند هرکش قدرتی بالا[2] mətləli şeirində vətənindən didərgin salınmış Fəzulun əziyyətlərindən sonra Səlcuqilərlə mübarizədə hakimiyyəti yenidən ələ almasını alqışlayır, Məmduhu qələbə münasibəti ilə təbrik edir. Şair həqiqi rahatlığın zəhmət və əziyyət sayəsində mümkün olduğunu, şirin xurmanın tikan içərisində qərar tutduğunu deyərək, bu böyük müvəffəqiyyətə ürəkdən sevinir (1, 3-5). Yenə bu münasibətlə yazılmış başqa bir şeirində کنون د انم که بامردم بدل میلست گردونرا – که برتخت شهی بنشاند شاهنشاه فضلونرا Qətran ölkədən zülmün götürüləcəyinə, zamanın Zöhhakı taxtdan salıb Firidunu onun yerində əyləşdirəcəyinə ümid bəsləyir. Üzünü padşaha tutub deyir: “Tale ulduzun yar oldu, qayıdıb mülkündə əyləşdin. Dünya bundan sonra alçaq adamları daha ucaltmaz!.. ” (1, 22-24)

Həmin əsərlərdə Əbülmüzəffər Fəzlunun Arana qayıtması, Məlikşahın Gəncə hakimi təyin etdiyi sərhəng Savtəkini taxtdan salıb hakimiyyəti ələ alması, Səlcuqilərə qarşı istiqlaliyyət mübarizəsinin yenidən təşkili kimi ciddi tarixi hadisələrə işarə edən Qətran əhvalatın canlı şahidi, iştirakçısı kimi görünür. Fəzlunun yolunu gözləyən şairin hər bir söz və ifadəsi, eyham və işarəsi (Yaqub və Yusif hekayəsini də burada gətirmişdir) bunu deyir:

شد یم از گریه نابینا جو یعقوب ازغم یوسف
زلیخا وار کشته بیرو این خود بود حق ما
کنون گشتیم بینا چشم و برنا جسم بازاز بسعی
که باز آمد بدارالملك شادان خسر وبرنا
شهنشه بوالمظفّر کاوست یوسف روی و یوسف خوی
نکو منظر نکو مخبر نکو بنهان نکو بید ا
ملك فضلون که گسترده است فضل اووجود او
ز جا بلقا بجا بلیا زجا بلسا بجا بلقا
... بد ستان خانهٔ آباد جد اکردند زو خصمان
بمرد ی بازدست آورد رفته خانهٔ آبا ...

(1, 3-5)

[2] Divanda بی بالا getmişdir. Texniki səhvdir. Burada islah edildi.

Bu şeirlərin Gəncədə yazıldığına şübhə yeri qalmır. Bu isə 70-ci illərdə, bundan da bir qədər əvvəl Qətranın Aranda olduğunu öz-özlüyündə təsdiq edir. Görünür şair Azərbaycanda Səlcuqilərin təsirinin artmasına dözməyib (Təbrizdəki bağının əlindən alındığını, kənddə iqtadarlar tərəfindən sıxışdırıldığını yada salaır)bu vaxtlar hələ istiqlaliyyətini saxlamaqda olan Arana gəlmiş köhnə dostu Əbülyüsr vasitəsi ilə Əbülmüzəffər Fəzluna təqdim olunmuşdur.

Aran hökümdarı haqqında Qətrana hədiyyə və bəxşişləri haqqında Şərq ədəbiyyatında gözəl hekayələr, rəvayətlər mövcuddur. Rəvayətlərin birində Qətrana bircə qəsidəsinə görə Fəzlun tərəfindən özü ağırlığında qızıl-gümüş verildiyindən söhbət gedir...Xaqani və Caminin əsərlərində Fəzlun və Qətran əhvalatına maraqlı işarələr vardır. Cami "Səlman və Əbsalda" Qətrana həsr etdiyi hekayəsində Fəzlunun "dərya bəxşişini" xatırlayıb, əlimdə mal-dövlət olsaydı, mən də onunla belə edərdim! (2, 70) – deyir.Şəddadilərin son hökmdarı II Fəzluna Qətranın ithaf etdiyi şeirlər azdır. Lakin bu şeirlərində o, doğurdan da sözün haqqını vermişdir. Görünün, Ləşkəri, Vəhsudan və Əbulxəlil kimi, Fəzlunu da şair özünə dost bilirmiş. Qətran Azərbaycan hökmdarları ilə fəxr edirdi, onlar da şairin kamalından öyrənir, şeirindən zövq və ləzzət alırdılar.

Qətran qocalıq çağlarında yenidən Təbrizə qayıdır. Bu dəfə torpaq onu çəkib gətirmişdi. Təbrizdən Gəncəyə Fəzluna göndərdiyi şeirlərindən birində şair qocalıq və ağır nəğrəs (padaqra) xəstəliyindən şikayətlənib Şəddadi hökmdarının xidmətindən ayrılmağının səbəbini də izah edirdi:

ملكا نقرسم از خد مت تو باز گرفت
نقرسی جود توكرد ه است مراخود دانی (1,406)

Şairinin vəfat tarixini dəqiq müəyyənləşdirmək çətindir. Rzaquluxan Hidayət 465-ci ili (1072-73) göstərməklə, görünür Fəzlunun Astrabaddan qayıtması münasibəti ilə Qətranın yazdığı şeirləri nəzərdə tutur.[3] Halbuki yuxarıda gətirilən faktlar şairin bundan çox-çox sonralar sağ olduğunu təsdiq edir.

Məlikşahın hicri 481-də (1088-89) ikinci dəfə Gəncəyə hücumu sanki Qətranın yenidən görünməyinə səbəb olur. Elə bil bu müddətdə şairin qaranlıqda qalan surəti bir daha, bəlkə də sonuncu dəfə parlayır...

Məlikşah Səlcuqi Gəncə əhalisinin qəhrəman müdafiəsini qırıb Əbülmüzəf-fər Fəzlunu məğlub edərək əsir alır. Səlcuq hakimi Aran və Azərbaycanda böyük nüfuzu olan Fəzlunu öldürməyib, Bağdada sürgünə göndərir (4, 308).

Qətranın Əbülmüzəffər Fəzlunun Gəncədən çıxarılmasına işarə edən, ağır ruhi sarsıntıları əks olunan iki şeiri əsasında şairin 1088-89-cu illərə qədər yaşadığını təxmin etmək olar. Şeirlərinin hər ikisi qitədir.

آواره شد ازمسكن وماؤا صنم من mətləli birinci şeir bütövlükdə Fəzlunun faciəsinə həsr olunmuşsa, Əbülxəlilə yazılmış (Əbülxəlil Cəfər yenidən baş qaldırmışdı) بتبريزخانه برين برزمين mətləli ikinci şeirdə o faciə ancaq yad olunur. Birinci şeirdə aşağıdakı beytlərə diqqət edək:

آواره شد از مسكن وماوا صنم من    از طعنه بد كوى وزبيقاره دشمن
هم بسته زبانم من و هم خسته روانم من    هم سوخته جانم من وهم سوخته خرمن
هر جند توانند برون كرد نش ازشهر    كردن نتوانند برونش ز دل من
هر چند بآ هن نتو ان بست د ل من    دانم كه دل من بتوان خست بآهن
هرگز ز دل من نشود دوستى او    گرمن بخر اسان بوم ودوست بارمن
بت روى مرا بهره بلاى سفر آمد    هنگام مى روشن ووقت گل وگلشن
(1, 496) تيره شود ازدور دل اين ديد ۀ گريان    تيره كند از گرد ره آن عارض روشن

*("Mənim yarım öz yurdundan, aşıyanından didiərgin düşdü,*
*Pis ağızla adamların tənəsi və düşmənin kini buna səbəb oldu.*
*Dilim, ağzım bağlanmış, ruhum incilmişdir,*
*Canım oda yaxılmış, xırmanım küləyə verilmişdir.*
*... Onu şəhərdən çıxarmağı bacarsalar da,*
*Mənim ürəyimdən çıxara bilməyəcəklər!*
*Mənim ürəyimi parçalamaq mümkün olsa da,*
*Dəmirlə sarımaq olmaz!*

1088-89-cu illərdə şairin qocalıb əldən düşdüyü, həm də ağır xəstə olduğu nəzərə alınarsa, bu tarixdən çox az sonra vəfat etdiyini söyləmək olar.

Qətranın Təbrizdə Məğbərətüş –şüərada (Sürxab qəbristanında) basdırıldığı təxmin olunur.

---

[3] S.Ə.Kəsrəvi Rzaquluxan Hidayətin göstərdiyi tarixə etiraz etmişdir. Müəlliflərdən ancaq Bədiüz-zaman Xorasani (Fruzanfər) Hidayətlə razılaşmadığını bildirir (3, 143).

## Ədəbiyyat:

1. تبریزی قطران.دیوان. حکیم قطران تبریزیک چاپخانه شفق، 1954، 544 ص.
2. جامی عبد الرحمان. سلمان و ابسال. تهران. چاپخانه شرق، 1302 (شمسی) 115 ص.
3. خراسانی بدیع الزمان. سخن و سخنوران. جلد دوم. کتاب اول. تهران: چاپخانه فردین و برادر، 1312، 393 ص.
4.کسروی سید احمد. شهریاران گمنام. جلد دوم. چاپ دوم.

### Gatran Tabrizi visits to Ganja

**Summary**

On the base researches of a great number of creative works of the native and foreign orientalists and historians yhe author analyses literary heritage of great Azerbaijan literary artist, poet, philosopher and historian Gatran Tabrizi and his cultural, social ethical and philosophical sphere of epoch. Pointing out those facts as moral principles and the world outlook the researcher underlines their key position in the development of Azerbaijan literary history early in the middle ages.

The articles is considered for the specialists specialized in the branches of the Middle Aged Azerbaijan poetry and history.

### Поездки Гатрана Тебризи в Гянджу

**Резюме**

В статье на основе исследований множества творческих работ отечественных и зарубежных востоковедов и историков автор анализирует литературное наследие великого азербайджанского литературного художника, поэта, философа и историка Гатрана Табризи и его культурную, социально-этическую и философскую сферу эпохи. Определив эти факты как моральные принципы и формы проявления мировоззрения Гатрана Тебризи, исследователь подчеркивает их ключевую роль в развитии истории литературы Азербайджана в раннем средневековье.

Статья предназначена для специалистов, специализирующихся в области поэзии и истории средневековья Азербайджана.

**Rəyçi: dos. S.H.Qafarova**

Göndərilib: 23.02.2020 Qəbul edilib: 26.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/27-30

**Zərifə İsmayıl qızı Avilova,**
**Zərifə Bayram qızı Məmmədova**
Azərbaycan Tibb Universiteti

# MONOLOJİ NİTQİN ÖYRƏNİLMƏSİNİN ƏSAS ASPEKTLƏRİ

***Açar sözlər**: nitqin növləri, monoloji nitq, nitq inkişafı, tədris*
***Key words**: types of speech, monologue speech, speech development, teaching*
***Ключевые слова**: виды речи, монологическая речь, развитие речи, преподавание*

## Giriş

Nitq inkişafının tədris prosesində yer alması çox vacib bir məsələdəir. Xüsusi ilə ali təhsil müəssisələrində ana dilinin tədrisində nitq mədəniyyətinin inkişafı önəmlidir. Nitq mədəniyyətinin tədrisində onun iki növü üzərində xüsusi olaraq dayanmalı və tələbələrin hər iki növdə özünü sərbəst hiss etməsi əsas məqsəd kimi təyin olunmalıdır. Nitqin ifadə üsullarına, təzahür şəkillərinə, kommunikasiya məqsədinə, şəraitinə və s. əlamətlərə görə bir sıra növləri (şifahi nitq, yazılı nitq, rəsmi nitq, səhnə nitqi, danışıq nitqi, kütləvi nitq, ədəbi nitq, vasitəli nitq, vasitəsiz nitq, təşkil olunmuş və təşkil olunmamış nitq və s.) mövcuddur ki, onlar müəyyən cəhətlərinə görə bir-birindən fərqlənirlər. Danışan və dinləyənin nitq prosesində iştirakı həmişə eyni formada olmur. Bir nitq praktikasında danışan və dinləyən, demək olar ki, eyni dərəcədə fəaliyyət göstərir: sual verir, dinləyən cavab, danışan rəyini söyləyir, müsahib ona münasibətini bildirir. Başqa bir nitq formasında isə dinləyən ya ehtiyac, ya da imkanının olmaması üzündən müsahibinin danışığına müdaxilə etmir, münasibət göstərmir. Bu cür nitq monoloji nitqdir.

Müasir dövrdə insanın özünə və karyerasına dair təqdimatın önəmi çox böyükdür. Bu mənada çıxışların, hesabatların savadlı şəkildə hazırlanması elmi-nəzəri bazanın mənimsənilməsini tələb edir. Digər tərəfdən praktik vərdişlərin aşılanması çox vacibdir.

Tədqiqatçılar göstərirlər ki, monoloji nitqin əsas məqsədi kommunikasiya prosesində təsvir, təsdiqləmə, fikir söyləmə, səciyyələndirmə kimi məzmunu qarşıdakılara çatdırmaqdır. Həmin nitq təşkil olunmuş, proqramlaşdırılmış bir nitqdir. Yəni danışan deyəcəklərini qabaqcadan düşünür. İfadə edəcəyi fikrin həcmini, xarakterini müəyyənləşdirir, müəyyən fərdə və ya auditoriyaya müraciət formasını və dil materialını seçir, dinləyicilərin müsahiblərinin səviyyəsini, deyəcəklərinin ona (onlara) necə təsir edəcəyini təsəvvüründə canlandırır.

Monoloji nitq məzmun baxımından bir neçə şəkildə təzahür edir: a) fikir söyləmə səciyyəli monoloq; b) təsdiqləmə səciyyəli monoloq.

Nitqin monoloji növündə danışan fikrən və ya yazılı şəkildə əvvəlcədən plan tərtib edir, izah və təhlil edəcəyi məzmunu çatdırmaq üçün ona "bəzək-düzək" verir. Natiq bu işə ciddi hazırlaşır, hansı fikri əvvəlcədən, hansını ortada, hansı sonda deyəcəyini özü üçün müəyyənləşdirir.

Yazılı formada icra olunan monoloji nitq əvvəlcədən yazılı şəkildə hazırlanır. Monoloji nitqin növündən asılı olmayaraq orada çıxış, məruzə, məktub və s. hazırlanan ərəfədə müəyyən dəyişmələr özünü göstərə bilər.

Şifahi monoloji nitqin özünün də iki forması müəyyənləşdirilmişdir:

1) əvvəlcədən təşkil edilmiş nitq;
2) təşkil edilməmiş nitq. İkinciyə spontan nitq də deyirlər (1, 123).

Əvvəlcədən təşkil edilmiş nitq qabaqcadan planlı şəkildə hazırlanmış nitqdir. Nitqin əvvəlcədən təşkili üçün nitq söyləyən tərəfindən aşağıdakı işlərin görülməsi zərurəti meydana çıxır:

1) mövzu üçün plan tərtib etmək;
2) mövzu ilə əlaqədar ədəbiyyatları nəzərdən keçirmək;
3) mövzunun həcmini, əhatə dairəsini təyin etmək;
4) fikrin ardıcıllığına nail olmaq üçün bəzi qeydlər etmək;
5) mövzunun məzmununu dərindən öyrənmək;
6) mövzunun auditoriyaya yaxşı çatdırılması üçün əlverişli ifadə tərzi seçmək; nəqli cümlələrdən geniş istifadə etmək;
7) mövzunun şərhi üçün lazım olan söyləmə tərzini müəyyənləşdirmək;

8) intonasiyanı müəyyənləşdirmək.

Amma bəzən monoloji nitqi qura bilməyən, auditoriya qarşısında çətinliklə çıxış edən, nitqi korlayan (lazımsız sözləri işlədən, məsələn, zad, şey, adı nədi, adın sən de, yadımdan çıxdı və s.) şəxslərə də rast gəlmək olur. Natiq belə bir vəziyyətlə qarşılaşmamaq üçün söyləyəcəyi fikri yazıya köçürməli, sonra onu şifahi şəkildə ifadə etməlidir. Bu cür təşkil olunmuş monoloji nitqdə aşağıdakılar əsas götürülməlidir: a) məzmun ilə bağlı faktlar, nümunələr toplamaq; b) toplanmış faktları, nümunələri nitqdə məqamına görə yerləşdirmək; c) nitqin məzmununu yazmaq; ç) nitqi əzbərləyib yaddaşına köçürmək, dəfələrlə məşq edib söyləmək; d) mövzunu dinləyicilər qarşısında şərh etmək.

Natiq şifahi monoloqunda yersiz məlumatlar verməməlidir. O, hər hansı bir vacib məsələdən danışarkən bir neçə suala aydınlıq gətirməlidir. Birinci növbədə, "nəyi demək?" sualı mövzunun şərhində önə çəkilməlidir.

Şifahi monoloji nitqin digər bir forması spontan formadır. Bu monoloji nitqə hazırlıq görülmür. Natiq söyləyəcəyi nitqi sərbəst şəkildə icra edir. Belə monoloqu improvizasiya ilə müqayisə edirlər. Aşıqların bədahətdən söylədiyi əhvalatlar, nağıllar, dastanlar monoloji nitqin bu forması ilə nisbətən uyğun gəlir. Bəzi tədqiqatlarda monoloji nitqin bu formasına "ekspromt forma" da deyilir (2).

Şifahi monoloji nitq formasında nitq vahidləri, faktlar müstəqil, dilin təbii inkişafına əsaslanaraq əmələ gəlir, onlardan ən əlverişlisindən, dərketməni asanlaşdıranlardan istifadə olunur. Spontan nitqi nitq təcrübəsi geniş olan söz adamları (şairlər, yazıçılar, müəllimlər, alimlər və b.) işlədirlər. Nitqin alınmasında natiqin həyat təcrübəsi, dünyagörüşü, zəngin müşahidələri, hazırcavablığı və ən əsası isə onların fitri istedadı başlıca önəm daşıyır.

Monoloji nitqin bu forması həm də çətindir. Bəzi hallarda fikri fəallığı təmin etmək mürəkkəbliyi ortaya çıxır. Danışıq üçün təsirli, mənalı, dinləyiciləri özünə, nitqinə cəlb edən vasitələr tapmalıdır ki, nitq təbii və canlı alına bilsin. Hər hansı şəraitdən, situasiyadan asılı olmayaraq məruzəçi monoloji nitqində hərəkət etməli, fikrin sistemini qurmalı, mövzunun ardıcıllığına diqqət yetirməlidir.

Monoloji nitqin mühazirə forması. Mühazirəçilik bir məharət tələb edən sənətdir. Mühazirə formasından, əsasən, ali məktəblərdə müxtəlif fənlərin tədrisində istifadə olunur. Bu, effektli şərh üsulu sayılır. Həmin üsulun köməyilə tələbələr elmi biliklərə yiyələnirlər.

Mühazirə müəlim tərəfindən proqram və dərsliyə uyğun olaraq hazırlanır. Tematik plan əsasında hazırlanan mühazirələr tədris proqramına uyğun olmalıdır. Müəllim mühazirələrin hazırlanmasında məsuliyyətli olmalıdır. Mühazirə konkret fakt və dəlillərə əsaslanmalı, dərslikdəki məlumatlardan fərqlənməlidir. Çünki dərslikdə olan məlumatları yenidən tələbələrə - dinləyicilərə çatdırmağın elə bir əhəmiyyəti yoxdur.

Mühazirədə dialoqlardan da istifadə oluna bilər. Başa düşülməyən zaman dinləyici mühazirə söyləyənə sual verə və cavab ala bilər.

Mühazirəni üzündən oxumaq da dinləyicilərin maraq səviyyəsini azaldan amillərdəndir. Mühazirə aydın izahla, şərhlə müşayiət olunmalıdır. Asan və sadə dildə deyilən mühazirələr mövzunun yadda qalmasına səbəb olur. Ardıcıllığı, sistemliliyi gözləmək üçün mühazirə mətnindəki qeydlərə, sitatlara baxmaq lazım gəlir.

Mühazirənin dəyəri mühazirə deyənin səviyyəsindən asılıdır. Mühazirəçinin nitqi aydın, səlis və anlaşıqlı olmalıdır. O, çətin elmi terminlərdən istifadə etməməlidir. Əgər terminin qarşılığı yoxdursa, mühazirəçi onun mənasını aydınlaşdırmalıdır. Mühazirəçi fikrini əsaslandırmaq üçün mövzu ilə bağlı dəlilləri, sübutları, faktları elmi cəhətdən izah etməyi bacarmalıdır. Mühazirə adətən giriş, əsas hissələr və nəticədən ibarət olmalıdır. Bu quruluşda hazırlanmış mühazirələr hər bir sahədə yaxşı təsir bağışlayır, öyrədici xarakter daşıyır. Nəticələr mühazirənin ümumiləşdirilmiş əsas hissələrindən çıxarılmalıdır. Yəni mühazirənin nəticələrində ümumiləşdirilmiş fikir güclü vəə yetərincə olmalıdır.

"Mühazirə bir monoloq nitqinin quruluşu kimi idraki əhəmiyyət daşımalı, elmi siqləti, dərinliyi və məntiqi şərhi ilə seçilməlidir. Orada elmi ümumiləşdirmələrə, faktik materialın təhlilinə geniş yer ayrılmalıdır" (3, 127).

*Monoloji nitqin məruzə forması*. Məruzə monoloji nitq prosesində istifadə olunan əsas formalardandır. Hər hansı bir məsələ barədə məruzə etmək. Bu iş əvvəlcədən görülür. Məruzənin məzmun baxımından müxtəlif tipləri ilə qarşılaşmaq olur: müəyyən müddətə görülmüş işlərin hesabat məruzəsi, yaranmış fövqəladə vəziyyət haqqında məruzə, elmi-praktik konfranslarda, simpoziumlarda edilən məruzələr. Bunlar xarakter etibarı ilə fərqlənir.

Həmin formalar yazılı şəkildə əvvəlcədən yazılır. Faktlar və dəlillər dəqiqləşdirilir. Elmi mənbələr dürüstləşdirilir. Təcrübə göstərir ki, dinləyicilər daha çox qısa şəkildə olan məruzələrə meyillidir. Amma ictimai-siyasi həyatda, elmi arenada geniş məruzələrə də çox rast gəlmək olur.

Quruluş cəhətdən məruzə giriş, əsas hissə və nəticə olmaqla üç hissəli olur. Bu hissələr bir-birini tamamlamalıdır. Əvvəlinci hissədə qoyulmuş məsələlərdə problemin aktuallığından, önəmindən söhbət gedir. Qarşıya qoyulan məqsədə müvafiq olaraq hansı yol və üsullardan istifadə etməyin əsasları müəyyənləşdirilir. Məruzənin əsas hissəsi həlledici məqamdır. Görülən işin məzmunu açılır, məruzəçi tərəfindən müəyyən münasibət ifadə olunur. Məruzəçi sonra şərh etdiyi məsələni yekunlaşdırır, bir sıra təkliflərlə çıxış edir.

*Monoloji nitqin məlumat forması*. Hər hansı bir məsələ haqqında (rəsmi təşkilatlarda, idarələrdə və s.) monoloji nitqin bu formasında əsas məlumatlar verilir.

*Monoloji nitqin çıxış forması*. Hər hansı bir çıxışın müvəffəqiyyəti, nitqin dinləyicini inandırmaq və özünə tabe etmək bacarığı ilk öncə nitqin uyğunluğundan asılıdır.

Çıxışların məzmunu fərqli xüsusiyyətlərə malikdir. Məsələn, siyasi məzmunlu fərqli xüsusiyyətlərə malikdir. Məsələn, siyasi məzmunlu çıxışlar. Heydər Əliyevin siyasi məzmunlu çıxışlarını nümunə göstərmək olar.

Əsl monoloji nitqdə məntiqilik, ardıcıllıq, dəqiqlik, aydınlıq və konkretlik əlamətlərinin hamısı bütövlükdə cəmləşməlidir.

Təsiredicilik keyfiyyəti monoloji nitq üçün başlıca əlamət sayılır. Bu, nüfuzedicilik xüsusiyyətidir. Nitqin təsirediciliyi ona qulaq asanlar üçün nüfuzedici olmasından, dinləyənin bütün varlığı ilə ona diqqət kəsilməsindən ibarətdir. Bu cür monoloji nitqin quruluşu da sadə olur. Lakin sadə olduğu qədər də dolğun, düşündürücü səciyyəli olur. Təsiredici-nüfuzedici monoloji nitq dinləyiciyə sadəcə nəticə kimi yox, həm də nəticənin nəticəsi təsiri bağışlayır. Həmin nitqdə, eləcə də xüsusiləşdirici ifadələrdən istifadə olunmaqla, konkret şəxs anlayışını canlandıran morfoloji vasitələrdən də məqsədəmüvafiq formada istifadə edilir.

Çıxışlar, əsasən, məruzələrdən sonra danışılan nitqdir. Bir əsas məruzədən sonra onun ətrafında müxtəlif çıxışlar edilir. Məruzəyə münasibət çıxışlar vasitəsilə bildirilir. Bu zaman məruzənin çatışmayan cəhətləri də çıxışlarda göstərilir.

Tədqiqatçılar çıxışlarını effektli, səmərəli olması üçün aşağıdakı cəhətlərin varlığını göstərirlər:
- dinləyiciləri razı salsın;
- yığcam olsun, çox vaxt aparmasın;
- danışan müzakirə olunan mövzudan kənara çıxmasın;
- məruzədə və ya əvvəlki çıxışlardakı fikirlər təkrar edilməsin;
- deyilənlərdə ardıcıllıq və rabitəlilik olsun;
- sözlər, cümlələr aydın, hamının eşidə biləcəyi bir səs tonu ilə tələffüz edilsin;
- danışıqda loru və tüfeyli sözlərə, ifadələrə, şivə tələffüzünə və s. yol verilməsin.

Monoloq da replikaların müxtəlifliyindən ibarətdir. Monoloq ideya, fikirdən fərqli olaraq meydana çıxsa da, bunları monoloq deyənin fərdi hissi və münasibəti bütövləşdirir. Dram əsərlərinin dilində monoloq səciyyələndirici xüsusiyyətə malikdir. Belə əsərlərdə monoloq hadisələri müxtəlif istiqamətə yönəldə bilir. "Yazıçı təhkiyəsi ilə veriləcək mətləbləri, səhnədən kənarda cərəyan edən hadisələri elə fərdi danışıq fonunda əks etdirir ki, bu fərdilik ictimai sifətlərdən təcrid olunmur, əksinə, ictimaisifətləri, qüsur və mənfiliyi bütün kökləri ilə üzə çıxarır" (4, 47).

Monoloq xarakteri başa salmaq, hadisələrin gedişini xəbər vermək, ziddiyyətlərin açılmasına yönəlmək və s. vəzifələri yerinə yetirir. Monoloqların məzmunu aşağıdakı cəhətlərlə bağlıdır.

1) Dram monoloqları emosional baxımdan fərdi xarakter daşıyır. Hər bir personajın fərdi və tipik xarakterinə müvafiq olan nidalar, hiss və münasibətlər görünür. Obrazın fikrində yanğı, ötkəmlik, özünü öymə, eyni zamanda acizlik və s. mənəvi hallar özünü göstərir.

2) Monoloq mühiti və şəraiti. Müəyyən mühit və şərait monoloq nitqini formalaşdırır.

3) Monoloqların köməyilə müxtəlif hadisə və proseslər bir nöqtədə birləşdirilir, zaman və məkan etibarı ilə bir-birindən uzaqda baş vermiş hadisələr arasında əlaqə, insanlar arasında münasibət yaranır.

4) Monoloqlarda pafos. Pafos yunanca *pathos* sözündəndir, mənası "ehtiras" deməkdir (pafosla danışmaq, nitq söyləmək). Ehtiraslı deyilən nitq dinləyicilərin ruh yüksəkliyini artırır, təmtəraqlı olur. Monoloqlarda aşılanan yüksək ideyanın doğurduğu şövq, ilham, vəcd, coşqunluq, ehtiras kimi keyfiyyətlər əsas yer tutur.

Pafoslu monoloqlara, çıxışlara siyasi məzmunlu mətnlərdə çox rast gəlmək olur. Siyasi xadimlərin nitqi bu cür çıxışlarla zəngindir.

1) Monoloqlarda mübarizə əzmi yüksək olur.

2) Monoloqun hissi-emosional çalarları nidalarla, təzadlı təsvirlərlə ifadə olunur.

Psixoloji baxımdan daxili monoloqlar gərgin şəraitdə keçir. Yəni hər bir nitq parçasında psixoloji gərginlik ifadə olunur. Nitqi söyləyənin düşüncə tərzi üzə çıxır.

Yazılı nitqdə, xüsusən bədii ədəbiyyatda monoloqlardan istifadə olunur. Monoloq personajın daxili aləmini, onun məqsədini, məqamını, hadisələrə münasibətini açır. Monoloq daha çox onun müəllifinin özünə ünvanlanır. Lakin digərlərinə ünvanlanan monoloqlar da az deyildir. Məsələn, C.Məmmədquluzadənin

"Ölülər" dramında İskəndərin monoloqu meydana toplaşanlara, H.Şekspirin "Hamlet" əsərində isə qəhrəmanın monoloqu onun özünə ünvanlanmışdır.

Monoloqdan fərqli olaraq, daxili nitq tələffüz olunmayan, səslənməyən nitqdir. Daxili nitq lakonikliyi, qırıq-kəsikliyi, rabitəsizliyi, qrammatik konstruksiyaların elliptikliyi ilə monoloqdan fərqlənir.

Daxili monoloq xüsusi üslubi qaydalardan biridir. Bu, daxili nitq statusundadır. Belə nitq prosesində baş vermiş hadisələr təsvir olunmur, onlarla əlaqədar olaraq yaranmış fikirlər və hisslər ifadə edilir. Monoloji nitq emosional baxımdan fərdiləşə bilir. Hər bir obrazın individual cəhətinə müvafiq nidalar hiss və emosiyaları qüvvətləndirir.

Monoloji nitqdə fasilə, sürət, ahəng, ton xüsusi rol oynayır. Dramaturgiyada monoloji nitq üçün gerçək şərait və mühit, həmçinin forma müəyyən edilir. Məsələn, tədqiqatçıların göstərdiyi kimi, C.Cabbarlı monoloqların köməyi ilə müxtəlif hadisələri bir nöqtədə birləşdirir, zamanca, məkanca bir-birindən uzaqda baş vermiş hadisələr arasında əlaqə yaradır. Monoloq "səhnə daxilində səhnə" üsulunun tənzimedicisi kimi təqdim edilir. Belə monoloqların məzmun həcmi genişlənir, bir surətin danışığı geniş bir dövrün bədii təcəssümünə təkan verir, hadisələrin quru təsviri yerinə canlı təcəssümü, təbii cərəyanı göstərilir" (Abbasova N.K., Cəfər Cabbarlı dramaturgiyasında söz. Bakı: Yazıçı, 1983, 191 s. 1, 48).

## Nəticə

Hər bir şəxs gözəl danışığa, yüksək nitq mədəniyyətinə sahib ola bilər. Lakin bu cür çətin işin öhdəsindən gəlmək möhkəm iradə, böyük həvəs, müvafik bilik və bacarıqlar tələb edir. Gözəl səslə, fikrə müvafiq intonasiya seçməklə, normativ tələffüzlə danışmaq üçün hər bir kəs öz üzərində daim çalışmalıdır. Nitq istedadla bağlı olmasına baxmayaraq, ali məktəbdə təhsil alan gələcək mütəxəssis monoloji nitqi mənimsəmək üçün istər nəzəri bilikləri, istər praktik vərdişləri mənimsəməlidir. Bu zaman mütləq olaraq monoloji nitqin öyrənilməsinin əsas aspektləri nəzərə alınmalıdır. Çünki bu məsələdə nəzəriyyə və təcrübə vəhdəti çox vacibdir.

## Ədəbiyyat:

1, Abdullayev N.Ə., Məmmədov Z.T., Nitq mədəniyyətinin əsasları. Bakı: ADPU-nun nəşri, 2008, 336 s., 123
2. Abdullayev Ə.Z. Mətni anlama modelləri. Bakı: "Səda", 1999, 334 s.
3. Bayramov Ə.S. Təfəkkürün müstəqillik və tənqidiliyinin kiçik məktəbyaşlı uşaqlarda inişaf dinamikası: fil. elm. nam. dis. Bakı, 1967, 124 s.
4. Abbasova N.K., Cəfər Cabbarlı dramaturgiyasında söz. Bakı: Yazıçı, 1983, 191 s.

## The main aspects of monologue

### Summary

It is very important that the development of speech is included in the educational process. In particular, it is important to develop a speech culture when teaching the native language in higher educational institutions. When teaching speech culture, you need to focus on two types of speech and make students feel comfortable in both types. Methods of expression, appearance, purpose of communication, conditions, etc. There are a number of features (oral speech, written speech, formal speech, stage speech, public speaking, literary speech, indirect speech, indirect speech, organized and unorganized speech, etc.) that differ in different parameters from each other. In the process of training, a future specialist should gain theoretical knowledge and practical skills in constructing monologic speech.

## Основные аспекты обучения монологической речи

### Резюме

Очень важно, чтобы развитие речи было включено в учебный процесс. В частности, важно развивать речевую культуру при обучении родному языку в высших учебных заведениях. При обучении речевой культуре необходимо сосредоточиться на двух типах речи и сделать так, чтобы студенты чувствовали себя комфортно в обоих типах. Методы выражения, внешний вид, цель общения, условия и т.д. Существует ряд особенностей (устная речь, письменная речь, формальная речь, сценическая речь, публичные выступления, литературная речь, опосредованная речь, косвенная речь, организованная и неорганизованная речь и т. д.), которые по разным параметрам отличаются друг от друга. В процессе обучения будущий специалист должен получить теоретические знания и практические навыки построения монологической речи.

**Rəyçi: dos. M.Hüseynova**

Göndərilib: 23.02.2020 Qəbul edilib: 25.02.2020

**HÜQUQ ELMLƏRİ THE LAW SCİENCES ПРАВОВЫЕ НАУКИ**

DOI: 10.36719/AEM/2007-2020/51/31-34

**Rauf Əhəd oğlu Şəmsizadə**
Bakı Dövlət Unvesiteti

# HÜQUQİ ŞƏXSLƏRİN CİNAYƏT MƏSULİYYƏTİ

***Açar sözlər:*** *hüquqi məsuliyyət, cinayət məsuliyyəti, hüquqi şəxslər, hüquqi şəxslərin cinayət məsuliyyəti*
***Key words:*** *legal liability, criminal liability, legal entities, criminal liability of legal entities*
***Ключевые слова:*** *юридическая ответственность, уголовная ответственность, юридические лица, уголовная ответственность юридических лиц*

Hüquqi məsuliyyət bütün dünya ölkələrinin yurisprudensiyasında dövlətin hüquq sisteminin üzvü tərkib hissəsi qismində çıxış edir. Hüquqi məsuliyyət ictimai həyatda son dərəcə mühüm olan əlahiddə bir funksiyanı yerinə yetirir. O, ilk növbədə hüquqazidd (qeyri-əxlaqi) əməlləri zərərsizləşdirir, onları cəmiyyət üçün təhlükəli və təqsirli hesab etməklə rədd edir, eləcə də cəmiyyət həyatının hüquq sahələrində insanların hüquqauyğun (əxlaqi) hərəkət və davranışlarını stimullaşdıran və islahedici vasitə qismində çıxış edir.

Ümumi şərtləri adətən, fiziki (daha konkret desək, ictimai təhlükəli əməl törətmiş) şəxslərə tətbiq edilən, hüquqi məsuliyyətin tərkib hissəsi və əsas növlərindən biri olan cinayət məsuliyyəti fərdin qanunla müəyyən edilmiş yaş həddinə çatmasını, onun psixi cəhətdən sağlam olmasını tələb edir. Azərbaycan Respublikası Cinayət məcəlləsinin (AR CM) 19-cu maddəsinə uyğun olaraq bu Məcəllə ilə müəyyən olunmuş yaş həddinə çatmış və cinayət törətmiş anlaqlı cinayət məsuliyyətinə cəlb edilir.

Əgər cinayət məsuliyyətinə cəlbetməyə hüquqi şəxslər nöqteyi-nəzərindən baxılarsa, o halda hüquqi şəxs qanunvericiliklə müəyyənləşdirilmiş qaydada (AR MM-nin 48.1-ci maddəsi) dövlət qeydiyyatında və fəaliyyət qabiliyyətinə (AR-nin 44.1 maddəsi) malik olmalıdır.

Deməli, Azərbaycan Respublikası Mülki Məcəlləsinin 43.1-ci maddəsinə uyğun olaraq hüquqi şəxs qanunla müəyyənləşdirilən qaydada dövlət qeydiyyatından keçmiş, xüsusi yaradılmış elə bir qurumdur ki, mülkiyyətində ayrıca əmlakı vardır, öz öhdəlikləri üçün bu əmlaka cavabdehdir, öz adından əmlak və şəxsi qeyri-əmlak hüquqları əldə etmək və həyata keçirmək, vəzifələr daşımaq, məhkəmədə iddiaçı və ya cavabdeh olmaq hüququna malikdir. Hüquqi şəxsin müstəqil balansı olmalıdır.

Mülki qanunvericiliyin xatırladılan normasından belə məntiqi nəticə çıxır ki, məhkəmədə cavabdeh qismində (mülki mühakimə icraatında) çıxış etmək hüququna malik olan hüquqi şəxs cinayət mühakimə icraatında da yol verdiyi təqsirli əmələ görə məsuliyyət daşımağa və müvafiq surətdə cəzalandırılmağa borcludur. Lakin Azərbaycan Respublikasının istintaq və məhkəmə təcrübəsində hüquqi şəxslərin cinayət məsuliyyətinə cəlb edilməsi, demək olar ki, praktikadan keçirilməmişdir. Bu prosedur Azərbaycanın keçmiş SSRİ-nin tərkibində olduğu dövr ərzində də hökm sürmüşdür. Ümumiyyətlə, ingilis-sakson (ingilis-amerikan), müsəlman və ənənəvi (qarışıq) hüquq ailələrindən fərqli olaraq, roman-german hüquq ailəsinə daxil olan ölkələrin hüquq və qanunvericilik sistemində buna çox az təsadüf olunur. Bu sahədə elmi diskussiyalara ötən əsrin 90-cı illərindən Rusiya Federasiyasında (RF) rəvac verilmişdir. Təbii olaraq RF hüquqşünasları praktikanı yuxarıda adları çəkilən hüquq sistemlərinin və eləcə də Avropa İnsan Hüquqları Məhkəməsinin (AİHM) təcrübəsindən əxz etmişdir.

Azərbaycanın tədqiqatçı- hüquqşünası F.Y.Səməndərov yazır: «Hüquqi şəxslərin cinayət məsuliyyəti barəsində məsələ illərdən başlayaraq elmi müzakirə obyekti olmuşdur. 1993-1994-cü illərdə hazırlanan RF-in yeni CM-nin layihəsində hüquqi şəxslərin cinayət məsuliyyəti barəsində göstəriş vardır. Xüsusən, CM-nin 1994-cü il layihəsinin 106-cı maddəsində hüquqi şəxslərin cinayət məsuliyyəti müəyyən edilirdi (1, s.611). Lakin RF-in 1996-cı il CM-si qəbul edilərkən onun mətnindən müvafiq maddələr çıxarıldı. Bununla belə, hüquqi şəxslərin cəzalandırılması ideyası ilə bağlı «güzəştli» inzibati məsuliyyət müəyyən edirdi. RF-in 2001-ci ildə qəbul edilən «İnzibati hüquq pozmalar haqqında» məcəlləsində müvafiq maddələr məcəllənin ümumi hissəsində öz əksini tapmış oldu» (1, s.611).

Müasir hüquqşünas (xüsusən də roman-german hüquq sisteminə daxil olan ölkələrin qanunvericiliyi) hüquqi şəxslərin cinayət məsuliyyətinə cəlb edilməsi üsullarını bu gün də fəallıqla axtarmaqdadır. Bunun da səbəblərindən biri presedent hüququna inteqrasiya meylinin sürətlə artmasıdır. Ancaq o da məlumdur ki, belə inteqrasiyanın istənilən səviyyədə baş tutması o qədər də asan deyildir. Presedent hüququndan əsasən ümumi hüquq (ingilis-sakson) ailəsinə daxil olan ölkələrin qanunvericiliyində istifadə olunur.Belə ölkələr isə yazılmamış qanunlar əsasında fəaliyyət göstərirlər. Roman-german hüquq ailəsinə daxil olan dövlətlərin hüquq və

qanunvericilik sistemi yazılı hüquq əsasında işləyir. Bu isə həmin ölkələrin, xüsusilə də cinayət qanunvericiliyində köklü dəyişikliklərin edilməsini zəruri edir. Əks təqdirdə inteqrasiya, yaxud mənimsənilmə haqqında söhbət gedə bilməz.

Hüquqi şəxslərin cinayət məsuliyyətinə cəlb edilməsilə əlaqədar bir sıra hüquqi tədbirlər Azərbaycanda da gerçəkləşdirilmişdir. Belə ki, AR CM-nə 7 mart 2012-ci il tarixli Qanunda «hüquqi şəxslər barəsində tətbiq olunan cinayət-hüquqi tədbirlər» sərlövhəli 15-2 fəsil əlavə edilmişdir. Əslində bu, qüvvədə olan qanunvericinin hüquqi şəxslərin cinayət hüquq münasibətlərinin iştirakçısı, eləcə də cinayət məsuliyyətinin subyekti ola bilməsi və ya bilməməsi probleminə öz mövqeyinə əks etdirməsidir.

Hüquqi şəxslərə cinayət-hüquqi tədbirlərin tətbiq olunmasının əsasları və şərtləri AR CM-nin 99-4-cü maddəsində nəzərdə tutulur. Həmin maddəyə uyğun olaraq;

99-4.1. hüquqi şəxsə cinayət-hüquqi tədbirlər həmin hüquqi şəxsin xeyrinə və ya onun maraqlarının qorunması üçün aşağıdakı fiziki şəxslər tərəfindən törədilən cinayətlərə görə tətbiq edilir:

99-4.1. hüquqi şəxsə cinayət-hüquqi tədbirlər həmin hüquqi şəxsin xeyrinə və ya onun maraqlarının qorunması üçün aşağıdakı fiziki şəxslər tərəfindən törədilən cinayətlərə görə tətbiq edilir:

99-4.1.1.hüquqi şəxsi təmsil etmək hüququna malik olan vəzifəli şəxs;

99-4.1.2. hüquqi şəxsin adından qərarlar qəbul etmək səlahiyyətinə malik olan vəzifəli şəxs;

99-4.1.3. hüquqi şəxsin fəaliyyətinə nəzarət etmək səlahiyyətinə malik olan vəzifəli şəxs;

99-4.1.4. bu məcəllənin 99-4.1.1 – 99-4.1.3-cü maddələrində nəzərdə tutulmuş vəzifəli şəxslər tərəfindən nəzarətin həyata keçirilməməsi nəticəsində hüquqi şəxsin işçisi.

Qanun normasının məzmunundan göründüyü kimi, hüquqi şəxslər cinayətin bilavasitə subyekti qismində çıxış etmirlər və edə də bilməzlər. Çünki konkret cinayətkar əməl hüquqi şəxs deyil, yalnız fiziki şəxs tərəfindən törədilə bilər. Belə halda hüquqi şəxslər özünün səlahiyyətli vəzifəli şəxsləri vasitəsilə ancaq cinayət məsuliyyətinin subyekti ola bilərlər. Belə ki, hüquqi şəxsin öz fəaliyyətində yol verdiyi qanun pozuntusuna görə onu təmsil edən konkret vəzifəli şəxs məsuliyyətə cəlb oluna bilər.

Belə bir cəhəti göstərmək lazımdır ki, müasir dünyada cinayət məsuliyyətinə dair konsepsiyalarda birbirinə yaxınlaşma müşahidə olunur. Cinayət məsuliyyəti haqqında normalara münasibətdə bu gün (nasizmin aradan qaldırılmasından sonra) özünəməxsus vahid təkamül konsepsiyasına malikdir. Bu müasir hüquq sistemlərində müşahidə edilməkdədir. Bununla əlaqədar olaraq Raymon Leje yazır: «Bu, xüsusən də fiziki şəxslərin cinayət hüquq pozuntularına bərabər tutulan əməllərinə görə məsuliyyətini müəyyənləşdirən prinsiplərə münasibətdə ədalətlidir. Hüquqi şəxslərin cinayət məsuliyyəti barəsində isə formalaşmaqla olan müasir hüquq hələ başa çatmamışdır və belə formalaşma ayrı-ayrı Avropa ölkələrində tamamilə müxtəlif cür gerçəkləşdirilir» (3, s.417).

Deməli, hüquqi şəxslərin cinayət məsuliyyətinə cəlb edilməsinə dair vahid konsepsiya özünün formalaşma mərhələsini yaşayır və problemin həlli istiqamətində çətinlik ondan ibarətdir ki, həmin formalaşmanın istiqamətləri müxtəlif ölkələrdə özünəməxsus orijinal xarakterə malikdir. bu da, şübhəsiz ki, hüquq sistemlərinin müxtəlifliyi (hətta eyni olan hüquq ailələrində) ilə bağlıdır. Bu cəhətdən Azərbaycanın da cinayət qanunvericiliyi istisnalıq təşkil etmir.

Hüquqi şəxslərin cinayət məsuliyyətinin müəyyən edilməsi ilə bağlıya dövlətlərinin qanunvericiliyində əsas iki model mövcuddur. Birinci model fiziki şəxslərlə bərabər şəkildə hüquqi şəxslərin də cinayətin müstəqil subyekti olmasını nəzərdə tutur (ABŞ, Kanada, Böyük Britaniya, Avstraliya, Belçika və s.) İkinci model fiziki şəxsləri cinayətin yeganə subyekti kimi tanıyır və yalnız şəxslərin hüquqi şəxsin xeyrinə və ya maraqlarının qorunması məqsədilə cinayət törətdikləri halda hüquqi şəxslərin cinayət məsuliyyətini müəyyən edir (Türkiyə, Avstriya, İspaniya və s.). Azərbaycan Respublikasının cinayət qanunu da ikinci modelə uyğun olaraq hüquqi şəxslərin cinayət məsuliyyətini təsbit etmişdir. bu modelin üstünlüyü ondadır ki, qüvvədə olan cinayət qanununun cinayətin subyekti ilə bağlı müddəalarına, cəza, cəza təyin etməyə dair normalarına və digər sistemdaxili elementlərinə hər hansı dəyişikliyin edilməsini tələb etmir: cinayətin subyekti bütün hallarda fiziki şəxs hesab edilir, təqsirin mahiyyəti dəyişmir, cəzanın sistemi və cəza təyin etmə qaydaları və s. olduğu kimi qalır (1, s. 613-614).

Avropa ölkələrində (o cümlədən Fransada) fransız hüququnda hüquqi şəxslərin cinayət məsuliyyətinin təsbit edilməsindən əvvəl debatların aparıldığı zaman nümunə qismində məhz ingilis hüququ diqqət mərkəzində olmuşdur. Bununla belə bir sıra ölkələr, o cümlədən Azərbaycan, yuxarıda qeyd edildiyi kimi məhz ikinci modelə üstünlük vermişdir. Bunun da səbəbi aydındır. Debatlarda ingilis hüququ nümunə qismində götürülsə də, hüquqi şəxslərin cinayət məsuliyyətinin təsbiti məsələsi bir sıra çətinlikləri üzə çıxarmışdır. Çətinlik, hər şeydən əvvəl, ondan ibarətdir ki, ingilis hüququnda hüquqi şəxs anlayışı son dərəcə mürəkkəbliyi ilə seçilir. Bundan əlavə, hüquqi hüquq subyektliyinə malik olmayan birliklər (bu birliklərin bəziləri «kvazikorporosiyalar» adlandırılır) barəsində bəzən hüquqi şəxslərin hüquqi rejimindən əxz edilən normalar

tətbiq edilir. Digər bir çətinlik isə ingilis hüququnda cinayət məsuliyyətinin özünəməxsus sirlərinin olması ilə izah edilir. məlumdur ki, ingilis hüququnda əməlin cinayət hesab olunması üçün qanuni baza və ya məhkəmə bazasının olması ilə yanaşı konkret əməl və subyektiv cəhət mövcud olmalıdır. Üstəlik, cinayət məsuliyyəti fərdi xarakter daşıyır.

Beləliklə, R.Lejenin fikrincə, hüquqi şəxslərin cinayət məsuliyyəti ingilis hüququnda bir-birindən son dərəcə fərqli olan aşağıdakı iki perspektiv nəzərə alınmaqla işlənmişdir:

1) obyektiv məsuliyyət və digər şəxsin hərəkətləri nəticəsində vurulan zərərə görə məsuliyyət (bu hallar kazuistik səciyyə daşıyır);

2) fərdi cinayət məsuliyyəti (bu, daha geniş sferanı əhatə edir).

R.Leje yazır ki, məsuliyyətin bu perspektivinin tanınması «əməl» və «obyektiv cəhət» anlayışların xüsusi təfsirinin köməyilə baş verir (3, 419).

R.Lejenin mülahizəsinə görə, cinayət hüququ çərçivəsində, bu sözün əsl mənasında hüquqi şəxsin məsuliyyəti mövcud deyil. Belə mövqe alman cinayət məsuliyyəti konsepsiyası İkinci Dünya müharibəsindən sonra təşəkkül tapmışdır. Almaniyada Federal Konstitusiya məhkəməsi tərəfindən tanınan təqsirlilik prinsipi qanunla qadağan olunan hərəkət və ya hərəkətsizliyə görə fərdi məsuliyyət daşımayan şəxsə və cəza təyin olunmasını qadağan edir. Almaniyada bu prinsip cəza tədbirinin seçildiyi zaman da rəhbər tutulur (3, 425). Fikrimizcə, təqsirlilik prinsipinin bu üsulla başa düşülməsi ancaq fiziki şəxslərə şamil edilə bilər. Deməli alman cinayət qanunvericiliyinə görə, belə cinayət-hüquqi tədbir hüquqi şəxslərə aid edilmir. Azərbaycanın cinayət qanunvericiliyində isə cinayət-hüquqi tədbirlərin dairəsi başqa cür müəyyənləşdirilmişdir.

Belə ki, AR CM-nin 99-5-ci maddəsinə uyğun olaraq hüquqi şəxslərə tətbiq edilən cinayət hüquqi tədbirləri aşağıdakılardır:

99-5.1.1. cərimə;

99-5.1.2. xüsusi cərimə;

99-5.1.3. hüquqi şəxsi müəyyən fəaliyyətlə məşğul olma hüququndan məhrum etmə;

99-5.1.4. hüquqi şəxsi ləğv etmə.

Qanunun bu normasının mətnindən göründüyü kimi, cinayət-hüquqi tədbirlər içərisində hüquqi şəxsin cəmiyyətdən təcrid edilməsi ilə bağlı sanksiya nəzərdə tutulmur. Lakin artıq qeyd etdiyimiz kimi, hüquqi şəxsin səlahiyyətli vəzifəli şəxsi cinayət məsuliyyətinin subyekti ola bilər. məhz burada hüquqi şəxsin təqsirliliyi ilə cinayət məsuliyyəti arasında ziddiyyət meydana çıxır. Göstərilən tədbirlərdən aydın olur ki, qanunverici cinayət-hüquqi tədbirlərin daşıyıcıları qismində hüquqi şəxsin vəzifəli şəxsini deyil, bilavasitə onun özünü nəzərdə tutur.

Haqqında söhbət gedən məsələ ilə əlaqədar F.Y.Səməndərov belə nəticəyə gəlir ki, «…törədilən cinayətin subyektinin ümumi, yaxud xüsusi subyekt olmasından asılı olmayaraq, hüquqi şəxsin cinayət məsuliyyətinin subyekti olması üçün törədilən cinayətin subyekti bütün hallarda xüsusidir. Başqa sözlə, hüquqi şəxslərin məsuliyyəti həmin hüquqi şəxslərin təsisçilərinin, rəhbərlərinin, işçilərinin, yəni hüquqi şəxslə hüquqi bağlılığı olan şəxslərin törətdikləri cinayətlərdən irəli gəlir. Hüquqi şəxslə hər hansı hüquqi bağlılığı olmayan şəxsin cinayət törətməsi hüquqi şəxsin məsuliyyətinə səbəb ola bilməz (1, 614-615). Belə mövqe ilə biz də razılaşır və yalnız onu əlavə etmək istəyirik ki, cinayət məsuliyyətinin subyekti qismində hüquqi şəxslə bağlılığı olan şəxslərin çıxış etməsilə bağlı cinayət-hüquqi tədbirlərdə müəyyən dəyişikliklər edilməli və xüsusən də sanksiyalar bir qədər də ciddiləşdirilməlidir.

Hazırda tədqiqatçılar belə bir mövqedən çıxış edirlər ki, dünyanın hüquq sistemlərinin bir-birinə yaxınlaşması meyli getdikcə güclənməkdədir və bu meyllər ümumi hüquqa (ingilis-sakson hüquq sisteminə) daha çox üstünlük verilməsi istiqamətində nəzərə çarpır (4, 188). Həqiqətən də son dövrdə ümumi hüquqa yaxınlaşma daha da sürətlənmişdir. Fikrimizcə bu, ingilis sakson hüququnun digər hüquq sistemləri ilə müqayisədə nisbi demokratikliyi, xüsusən də hakimlərin tam müstəqilliyi və nəhayət, hüquqi müdafiənin əldə olması ilə əlaqədardır. İngilis-sakson hüquq sistemində hakimin daxili inamı elə bir həddə təzahür edir ki, presedent, bu sözün həqiqi mənasında hüququn əsas mənbələrindən biri olduğunu tam şəkildə təcəssüm etdirir. Hüquqi şəxslərin cinayət məsuliyyəti ilə bağlı isə mülahizələrimizi yekunlaşdıraraq qeyd etmək istərdik ki, bu istiqamətdə ölkə qanunvericiliyi müvafiq normaları ilə hələ özünün formalaşması dövrünü yaşayır. Bu, çətin formalaşma prosesidir və bu prosesdə cinayət qanunvericiliyinin bir çox normalarında dəyişikliklər edilməsi zəruridir.

## Ədəbiyyat:

1. Səməndərov F.Y. Cinayət hüququ. Ümumi hissə. dərslik. Bakı: Hüquq Yayım Evi, 2018
2. Давид Р., Жоффре-Спинози К. Основные правовые системы современности. М.: «Международные отношения», 2009

3. Леже Р. Великие правовые системы современности. М.: «Волтерс Клувер», 2009
4. Марченко М.Н. Правовые системы современного мира. М.: «Зерцало», 2009

**Criminal liability of legal entities**
**Summary**

During the discussion that preceded the criminal liability of legal entities in French law, English law was taken into account as an instructive example. Nevertheless, with great difficulty we can comprehend the way in which this responsibility is interpreted. Difficulties arise primarily because the concept of a legal entity in the legal science of different countries of the world is very complex. This difficulty also exists in modern Azerbaijani criminal legislation, including legal science.

**Уголовная ответственность юридических лиц**
**Резюме**

Во время дискуссии, которые предшествовали закреплению уголовной ответственности юридических лиц во французском праве, английское право было принято во внимание в качестве поучительного примера. Тем не менее, мы с большим трудом можем постичь тот способ, через который трактуется эта ответственность. Трудности возникают прежде всего потому, что понятие юридического лица а правовом науке разных стран мира является очень сложным. Эта трудность существует и современном Азербайджанском уголовном законодательстве, в том числе и правовой науке.

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/35-38

**Rauf Əhəd oğlu Şəmsizadə**
Bakı Dövlət Universiteti,
**Ləman Vüqar qızı Talıbova**
Bakı, Azərbaycan
talibova9797@list.ru

# İNSAN ALVERİNƏ QARŞI BEYNƏLXALQ SFERADA MÜBARİZƏNİN ƏSAS İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *Beynəlxalq konvensiyalar, Avropa İnsan Hüquqları Məhkəməsi, beynəlxalq öhdəliklər*
***Key words:*** *International conventions, European Court of Human Rights, international obligations*
***Ключевые слова:*** *Международные конвенции, Европейский суд по правам человека, международные обязательства*

## Giriş

İnsan alveri insan hüquqlarının pozuntusunun ən ağır formalarından biridir. O, həm milli, həm də beynəlxalq xarakter daşıyır. İnsan alveri fərdi səviyyədə təsirə də malikdir, insanların sağlamlığına zərər yetirir, həmçinin korrupsiyaya səbəb olur, qanunun aliliyini zəiflədir. Qeyd edilən cinayətin aşağı riskli və böyük gəlirli olması cinayətkarları məhz buna yönəldir. Bu baxımdan da, insan alverinə qarşı beynəlxalq səviyyədə mübarizənin rolu əvəzsizdir. Mövzu çərçivəsində daha çox BMT və Avropa Şurasının insan alverinə qarşı mübarizə sahəsində rolu araşdırılacaqdır. İnsan alverinə qarşı yalnız milli səviyyədə mübarizə yetərli deyildir, buna görə də beynəlxalq səviyyədə öhdəliklərin müəyyən edilməsi və öhdəliklərin icra edilməsinə nəzarət etməklə effektiv nəticə əldə etmək mümkündür, xüsusən də beynəlxalq məhkəmə qurumlarının bu sahədə fəaliyyəti faydalıdır.

### 1.1. BMT-nin insan alverinə qarşı mübarizə üzrə fəaliyyəti

Beynəlxalq sülh və təhlükəsizliyin qorunub saxlanması, dövlətlərarası dostluq əlaqələrinin inkişaf etdirilməsi, insan hüquq və azadlıqlarının qorunması sahəsində Birləşmiş Millətlər Təşkilatı mühüm rola malikdir. İnsan alverinin qarşısının alınması sahəsində BMT-nin başlıca vəzifəsi beynəlxalq konvensiyaların qəbul edilməsi və dövlətlər tərəfindən onun icra edilməsinə nəzarət etməkdən ibarətdir. Bu sahədə mövcud olan əsas aktlara diqqət yetirək: 1. “Transmilli mütəşəkkil cinayətkarlıq əleyhinə” 2000-ci il tarixli Konvensiya – konvensiyanın əsas məqsədi transmilli mütəşəkkil cinayətkarlığın qarşısının alınması və bu sahədə dövlətlərarası əməkdaşlığı təşviq etməkdən ibarətdir. 2. “İnsan alverinin, xüsusən qadın və uşaq alverinin qarşısının alınması, aradan qaldırılması və cəzalandırılması” haqqında 2000-ci il tarixli protokol – 2-ci maddədə protokolun qəbul edilməsinin məqsədləri qeyd edilir: a) qadınlara və uşaqlara xüsusi diqqət yetirərək, insan alverinin qarşısının alınmasından və onunla mübarizə etmək; b) bu cür alverin qurbanları olan şəxslərə, onların insan hüquqlarına tam hörmət bəsləyərək müdafiə və yardım etmək; c) bu məqsədlərin gerçəkləşməsində iştirakçı dövlətlər arasında əməkdaşlığı təşviq etmək. Konvensiyanın 2-ci fəsli insan alveri qurbanlarının müdafiəsinə həsr edilmişdir. Burada insan alveri qurbanlarına tibbi, psixoloji yardım göstərilməsi, onların sığınacaqla təmin edilməsi, onların repatriasiyası məsələlərinin beynəlxalq tənzimlənməsi öz əksini tapmışdır. 3-cü fəsil isə insan alverinin qarşısının alınmasını tənzimləyir. Bu hissədə sərhəddə nəzarətin gücləndirilməsi, sənədlərin qanuniliyi, həqiqiliyi və s tədbirlər araşdırılır. (1) 3. “Ümumdünya İnsan Hüquqları Bəyannaməsi – bəyannamə deklarativ xarakter daşıyır. Burada insan alverinin bir formasına münasibət bildirilir. Köləliyin qadağan olunmasının vacibliyi vurğulanır. 4. “Qadınlara qarşı ayrı-seçkiliyin bütün formalarının ləğv edilməsi” haqqında 1979-cu il tarixli Konvensiya – Burada qadın alverinin qarşısıının alınması məsələsinə önəm verilir. 5. “Köləlik əleyhinə” 1926-cı il tarixli Konvensiya – Köləlik, şəxs üzərində mülkiyyət hüququna xas olan səlahiyyətlərdən hər hansı birinin həyata keçirilməsidir. 6. “Köləliyin, kölə ticarətinin və köləliyə bənzər halların ləğv edilməsi” haqqında 1956-cı il tarixli əlavə Konvensiya – Burada da köləliyin qarşısının alınması üzrə tədbirlər müəyyən edilir. 7. “Uşaq hüquqları” haqqında 1989-cu il tarixli Konvensiya – burada uşaqların istismarının qadağan edilməsi məsələlərinə toxunulur. 8. “Məcburi əmək” haqqında 1930-cu il tarixli Beynəlxalq Əmək Təşkilatı Konvensiyası – məcburi əməyin anlayışı, dövlətlərin milli qanunvericilikdə onu qadağan etməsi, istisnaya yol verilən hallar burada öz təsbitini tapmışdır. 8. “Məcburi əməyin ləğvi” haqqında 1957-ci il tarixli Konvensiya – Məcburi əməyin ləğvi üzrə tədbirlər müəəyyən edilir. 9. “Uşaq əməyinin ən ağır formaları” haqqında 1999-cu il tarixli Konvensiya – uşaq əməyinin ləğv edilməsi üzrə qanunvericilik tədbirlərinin görülməsi dövlətlərin öhdəliyi müəyyən edilir. 10. “Daxili fəhlələr üçün münasib işə dair” 2011-ci il tarixli Konvensiya – dövlətlərdən daxili fəhlələr üçün münasib işi reallığa çevirmək tələb edilir.

**1.2. Beynəlxalq məhkəmə qurumlarının insan alverinin qarşısının alınmasına göstərdikləri xidmət**

İlk öncə belə bir sual insanı düşündürür ki, beynəlxalq məhkəmə qurumları insan alverinin qarşısının alınmasına hansı şəkildə xidmət göstərə bilərlər? İlk öncə bunu qeyd edək ki, beynəlxalq məhkəmələrin qərarları onun yurisdiksiyası altında olan dövlətlər üçün məcburi hüquqi qüvvəyə malikdir. İnsan alveri cinayəti törədildiyi hallarda beynəlxalq məhkəmə qərarlarının qəbul edilməsi həm hüququ pozulmuş şəxsin hüquqlarının bərpasına, həm də gələcəkdə bu tip cinayətlərin törədilməsinin qarşısının alınmasına xidmət edir, yəni profilaktik xidmət göstərmiş olur. Bu sahədə Avropa İnsan Hüquqları Məhkəməsinin rolu əvəzedilməzdir.

"İnsan hüquq və əsas azadlıqlarının müdafiəsi" haqqında 1950-ci il tarixli Konvensiyanın 4-cü maddəsində qeyd edilir: Heç kəs köləlikdə və ya əsarət altında saxlanılmamalıdır. Heç kəs məcburi və ya icbari əməyə cəlb olunmamalıdır. Bu maddənin məqsədləri üçün «məcburi və ya icbari əmək» termini aşağıdakıları ehtiva etmir: a) bu Konvensiyanın 5-ci Maddəsinin müddəalarına müvafiq olaraq həbsdə olan və ya belə həbsdən şərti azad edilmiş şəxsin adətən yerinə yetirməli olduğu hər hansı iş; b) hərbi xarakterli hər hansı xidmət və ya hərbi xidmətdən əqidəyə görə imtina etmənin qanuni hesab edildiyi ölkələrdə məcburi hərbi xidmətin əvəzinə müəyyən edilmiş xidmət; c) fövqəladə vəziyyət və ya əhalinin həyatı və rifahı üçün təhlükə yaradan fəlakət hallarında hər hansı məcburi xidmət; d) adi vətəndaşlıq vəzifələrinin bir hissəsi olan iş və ya xidmət. (2) Fərqli məhkəmə qərarlarına nəzər salmaqla Avropa İnsan Hüquqları Məhkəməsinin insan alverinə yanaşmasını nəzərdən keçirək.

**Van Der Mussele Belçikaya qarşı işi.** Burada belçikalı vəkil belə ifadə etmişdir ki, məcbur əmək haqqı ödənilmədən çalışmaqdır. Məhkəmə bu iddianı rədd etmiş, lakin məcburi əməyin hər bir ünsürünü təhlil etmişdir. Avropa İnsan Hüquqları Məhkəməsi "İcbari və ya məcburi əmək" haqqında 29 saylı BƏT konvensiyasında verilən anlayışı əsas götürmüşdür. Bu konvensiyaya əsasən məcbur əmək dedikdə cəza təhdidi altında şəxsdən tələb edilən və şəxsin bunu könüllü olaraq yerinə yetirmədiyi bütün işlər və ya xidmətlər anlaşılır. Məhkəmə belə bir nəticəyə gəlmişdir ki, bu anlayış "İnsan hüquq və əsas azadlıqları" haqqında 1950-ci il tarixli Avropa Konvensiyasının 4-cü maddəsinin təfsiri üçün təməl nöqtəsidir.

**Rantsev Kiprə və Rusiyaya qarşı işi.** Burada Rusiya vətəndaşı olan xanım Rantseva "artist vizası ilə Kipr ərazisinə daxil olur. Artist vizası – qadınları gecə klublarında fahişə kimi istismar etmək məqsədilə istifadə edilir. Xanım Rantseva işlədiyi gecə klubundan qaçarkən işəgötürənləri tərəfindən ələ keçirilir və o, viza şərtlərini pozduğuna görə ölkədən xaric edilməsi üçün polis məntəqəsinə gətirilir. Rantseva polis tərəfindən ölkədən xaric edilmir və məntəqədən azad edilir, lakin növbəti gün onun cəsədi tapılır. Daha sonra xanım Rantsevanın atası tərəfindən insan alveri ehtimallarının, qızının qətlinin araşdırılmaması və Kiprin hakimiyyət orqanlarının onun qızını müdafiə etməməsi səbəbi ilə Avropa İnsan Hüquqları Məhkəməsinə müraciət etmişdir. Məhkəmə mövcud vəziyyətdə belə bir qənaətə gəlmişdir ki, insan alveri İHAK-ın 4-cü maddəsində birbaşa təsbit edilməsə də, bu, 4-cü maddənin təsir dairəsinə düşür. Həmçinin məhkəmə insan alveri sahəsində dövlətlərin öhdəliklərinə də aydınlıq gətirmişdir. Rantsevanın işinin araşdırılması zəminində bildirmişdir ki, Avropa Şurasına üzv olan dövlətlər insan alverinə münasibətdə qeyd edəcəyimiz öhdəliklərə malikdirlər: a) insan alveri cinayətini törədənləri cəzalandıran qanunvericilik sisteminin mövcud olması; b) insan alveri qurbanlarını müdafiə etmək; c) insan alveri hallarını araşdırmaq, insan alverçilərini təqib etmək.

**Siliadin Fransaya qarşı işi.** Burada 15 yaşlı qız aldadılaraq məcburi əməyə cəlb edilməq məqsədilə Toqodan Fransaya gətirilmişdir. Məhkəmə bu işə baxarkən belə müəyyən etmişdir ki, mövcud vəziyyətdə İHAK-ın 4-cü maddəsinin pozuntusu mövcuddur. Qeyd edək ki, "Siliadin Fransaya qarşı" işi Avropa Məhkəməsinin insan alveri ilə bağlı baxdığı ilk işdir. Məhkəmə qərarında yekun olaraq bildirmişdir ki, Avropa Şurasına üzv olan dövlətlər insan alverini kriminallaşdıran cinayət qanununu qəbul etməli və bu cinayəti törədən şəxsləri təqib etməlidirlər.

**C.N. Birləşmiş Krallığa qarşı işi.** Avropa Məhkəməsinin ən önəmli təcrübələrindən biridir. Belə ki, şəxs Uqandada fiziki və cinsi istismara məruz qaldığı üçün buradan qaçmağa səy göstərir. Yaxın qohumunun yardımı ilə Birləşmiş Krallığa qaçmağa nail olur, lakin qohumu onun pasportunu alır. Bu zaman şəxs yaşlı bir cütlüyə xidmət göstərməyə başlayır, ayda yalnız bir dəfə istirahət hüququndan istifadə edə bilir, bunun qarşılığında məvacibin böyük hissəsi isə onun qohumuna verilir, o, yalnız az qismini əldə edir. Burada ev köləliyinin bütün əlamətləri mövcuddur. Məhkəmə belə bir mövqe ifadə etmişdir ki, ev köləliyi insan alverinin fərqli və aşkar edilməsi çətin olan növüdür. Bu baxımdan da, ev köləliyinin əlamətləri mövcud olduğu zaman dövlətlər tərəfindən hərtərəfli araşdırma aparılması tələb edilir. Birləşmiş Krallıq ilə bağlı olaraq məhkəmə belə ifadə edir ki, dövlətin qanunvericiliyi köləliklə mübarizə aparmaq sahəsində kifayət qədər təkmil deyil.

### 1.3. İnsan alverinə qarşı mübarizə haqqında Avropa Konvensiyası

İnsan alverinə qarşı mübarizəyə xidmət edən əsas sənədlərdən biri də "İnsan alverinə qarşı mübarizə" haqqında 2005-ci il 16 may tarixli Avropa Şurası Konvensiyasıdır. Konvensiyada insan alverinə anlayış verilir. İnsan alveri - İnsan alveri" dedikdə, hədə-qorxu və ya zor tətbiq etməklə, yaxud başqa cür məcbur etməklə, qaçırma, dələduzluq və ya aldatma yolu ilə, vəzifədən və ya şəxsin köməksiz vəziyyətindən sui-istifadə etməklə və yaxud pul və ya digər maddi vəsaitlər vermək və ya almaqla hər hansı bir şəxsdən onun himayəsində olan şəxs barəsində razılıq almaqla, şəxslərin istismar məqsədləri üçün cəlb edilməsi, daşınması, ötürülməsi, gizlədilməsi və ya qəbul edilməsi başa düşülür. İstismar dedikdə, ən azı, başqalarını məcburi fahişəliyə cəlbetmə və digər cinsi istismar formaları, məcburi əmək və ya xidmətlər, köləlik, daxili orqanların çıxarılması və buna bənzər əməllər nəzərdə tutulur. Konvensiyada toxunulan ən önəmli məsələlərdən biri insan alveri qurbanlarına yardımla bağlı olan məsələdir. Konvensiyanın 12-ci maddəsində yardım tədbirlərinə aid edilir: a) müvafiq və təhlükəsiz mənzil təminatı, psixoloji və maddi dəstək və s. tədbirlər vasitəsilə onların mövcudluğunu təmin edə biləcək yaşayış şəraiti; b) təcili tibbi müayinə imkanları; c) tərcümə xidmətləri (lazım olan hallarda); d) onların başa düşdükləri dildə, xüsusilə onların qanuni hüquqlarına və yararlana biləcəkləri xidmətlərə dair məsləhətlərin və məlumatların verilməsi; e) onların hüquqlarının və mənafelərinin cinayətkarların mühakiməsi prosesinin müvafiq mərhələlərində təmsil olunmasına və nəzərə alınmasına yardım və s. (3)

### Nəticə

İnsan alveri özünün müasir formasında müasir qlobal miqrasiyanın dinamikası ilə ayrılmaz şəkildə əlaqəli olan və bununla formalaşan bir hadisədir. Sərt məhdud immiqrasiya siyasətləri, mütəşəkkil tənzimlənməyən immiqrasiyanı dayandırmaqdan daha çox ona şərait yaradır. (Beynəlxalq Miqrasiya Təşkilatı, 2016: 20) Günbəgün artmaqda olan insan alveri faktoru ona qarşı həm milli, həm də beynəlxalq səviyyədə mübarizəni tələb edir. Bu sahədə beynəlxalq məhkəmə qurumlarının, xüsusən də Avropa İnsan Hüquqları Məhkəməsinin təcrübəsinin öyrənilməsi olduqca faydalıdır. İnsan alverinə məruz qalmış şəxslərin hüquqlarının bərpasına yönələn məhkəmə qərarlarının qəbul edilməsi qeyd edilən cinayətin qarşısının alınması üçün profilaktik xarakter daşıyır. Beynəlxalq təşkilatlar tərəfindən qəbul edilən konvensiyalar isə dövlətlərin milli qanunvericiliyi təkmilləşdirməsi üçün başlıca istiqaməti qismində çıxış edir. Bütün deyilənlər əsasında belə qənaətə gəlirik ki, insan alverinin qarşısının alınması sahəsində dövlətlər və beynəlxalq təşkilatlar koordinasiya şəklində fəaliyyət göstərməlidirlər.

### Ədəbiyyat:

1. İnsan alverinin, xüsusən qadın və uşaq alverinin qarşısının alınması, aradan qaldırılması və cəzalandırılması" haqqında 2000-ci il tarixli BMT protokolu;
2. "İnsan hüquq və əsas azadlıqlarının müdafiəsi" haqqında 1950-ci il tarixli Avropa Konvensiyası;
3. "İnsan alverinə qarşı mübarizə" haqqında 2005-ci il 16 may tarixli Avropa Şurası Konvensiyası.
4. "İnsan alverinə qarşı mübarizə" Dərs vəsaiti, Beynəlxalq Miqrasiya Təşkilatı, 2016, 166 s.

### Main directions of prevention of human trafficking in the international sphere

### Summary

Human trafficking, in its modern form, is an event that is inextricably linked to the dynamics of modern global migration. Strictly limited immigration policies make it even more difficult to stop organized unregulated immigration. The ever-increasing human trafficking factor calls for a national and international fight against it. Based on all of the above, we conclude that human trafficking will be greatly reduced if the recommendations of international organizations are met by the states and the commitments made by international organizations are fulfilled. It is very useful to study the experience of international judicial bodies, especially the European Court of Human Rights. Adoption of court decisions aimed at restoring the rights of trafficked persons is a preventive measure for the prevention of this crime. The conventions adopted by international organizations are the main directions for improving the national legislation of the states. On the basis of all of the above, we conclude that states and international organizations should work in coordination in preventing trafficking in persons.

**Основные направления предотвращения торговли людьми в международной сфере**

**Резюме**

Торговля людьми в ее современной форме-это событие, которое неразрывно связано с динамикой современной глобальной миграции. Строго ограниченная иммиграционная политика делает ее еще более эффективной, чем прекращение организованного регулирования. Постоянно растущий фактор торговли людьми требует борьбы с ним на национальном и международном уровнях. Исходя из всего вышесказанного, мы заключаем, что торговля людьми будет значительно сокращена, если государства выполнят рекомендации международных организаций и выполнят обязательства, взятые международными организациями. Очень полезно изучить опыт международных судебных органов, особенно Европейского суда по правам человека. Принятие судебных решений, направленных на восстановление прав жертв торговли людьми, является превентивной мерой для предотвращения этого преступления. Соглашения, принятые международными организациями, являются основными руководящими принципами совершенствования национального законодательства штатов. Исходя из всего вышесказанного, мы заключаем, что государства и международные организации должны работать в координации по предотвращению торговли людьми.

**Rəyçi: prof. Ş.T.Səmədova**

Göndərilib: 18.02.2020 Qəbul edilib: 20.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/39-41

**Aynur Oktay qızı Səfərzadə**
Azərbaycan, Bakı şəhəri
seferzadeaynur@gmail.com

# CİNAYƏTDƏ İŞTİRAKÇILIĞIN SUBYEKTİV ƏLAMƏTLƏRİ

***Açar sözlər:*** *təqsir, iştirakçılıq, subyektiv cəhət, qanun, məsuliyyət*
***Key words:*** *guilt, participation, subjective aspect, law, responsibility*
***Ключевые слова:*** *виновность, соучастие, субъективный аспект, закон, ответственность*

## Giriş

İştirakçılıqla törədilən cinayətlər öz xarakteri baxımından daha təhlükəli olur. Uzun müddət hüquqi doktrinada iştirakcılığın subyektiv cəhəti mübahisə predmeti olmuşdur. Belə ki, bir sıra müəlliflər ehtiyatsızlıqdan törədilən cinayətlərdə də iştirakçılığın mümkün ola biləcəyini qeyd edirdilər. Lakin son dövrlər demək olar ki, bu mövzuda vahid fikir formalaşmıdır. Əksər ölkələrin qanunvericiliyində, eləcə də hüquqi doktrinada iştirakçılığın yalnız qəsdən törədilən əməllərdə mövcudluğu öz əksini tapmışdır. Hazırda Respublikamızın Cinayət qanunvericiliyində də bu mövqe öz əksini tapmışdır.

Ötən əsrdə iştirakçılığın subyektiv cəhəti ətrafında fikir ayrılıqları mövcud olmuşdur. Belə ki, bəzi müəlliflər ehtiyatsizlıqla törədilən cinayətlərdə də iştirakın mümkün ola biləcəyini qeyd edirdilər. Lakin hazırda demək olar ki, iştirakçılığın subyektiv cəhət ətrafında mübahisələrə son qoyulmuş böyük əksəriyyət yalnız qəsdən törədilən cinayətlərdə iştirakçılığın mümkünlüyünü qəbul etmişlər.

Hazırda qüvvədə olan Respublikamızın Cinayət Məcəlləsi də bu mövqeyi dəstəkləyir. Belə ki, CM-nin 31-ci maddəsində deyilir: “İki və daha çox şəxsin qəsdən cinayət törətməkdə qəsdən birgə iştirakı iştirakçılıq sayilir”. Göründüyü kimi burda “qəsd”əlaməti iki dəfə işlədilmişdir. Bununlada ehtiyatsızlıqdan törədilən cinayətlərdə iştirakçılığın mümkünlüyü məsələsi tamamilə aradan qalxmışdır.

Qeyd edək ki, 1958-ci il “SSR İttifaqı və müttəfiq respublikaların cinayət qanunvericiliyinin Əsasları”nın qəbuluna qədər cinayət qanunda iştirakçılığın anlayışının ümumi tərifi verilmirdi. Məhz bu “Əsaslarda” iştirakçılığa ilk dəfə anlayış verildi(6, s 350). Həmin Əsasların 17-ci maddəsində deyilirdi: “İki və daha çox şəxsin cinayət törətməkdə qəsdən birgə iştirakı iştirakçılıq hesab olunur.” Bu tərif natamam olmaqla ehtiyatsızlıqdan törədilən cinayətlərdə də iştirakçılığın mümkünlüyü məsələsinə yol açmışdır. Lakin hazırda huquqi doktrinada böyük əksəriyyət iştirakçılığın yalnız qəsdə edilən cinayətlərdə mümkünlüyü məsələsini qəbul etmişdir və demək olar ki, bu məsələ ətrafında mübahisələrə son qoyulmuşdur.

İştirakçılıqla törədilən cinayətlərdə qəsdin intelektual və iradəvi cəhəti vardır. Belə qəsdin iradəvi cəhətinin ünsürlərinə aşağıdakılar aiddir: (6, s 355)

a) hər bir iştirakçı özünün yol verdiyi və digər iştirakçının fəaliyyətinə kömək edən əməlinin ictimai təhlükəli olduğunu dərk edir;

b) digər iştirakçıların da (heç olmazsa birinin) fəaliyyətinin kriminal xarakterdə olduğunu dərk edir;

c) özünün və başqalarının birgə fəaliyyəti ilə baş verəcək, hamı üçün olan nəticənin ictimai təhlükəli olduğunu dərk edir.

İradəvi cəhəti isə aşağıdakı ünsürlərdən ibarətdir:

a) şəxs özünün ictimai təhlükəli olan əməlini həyata keçirməyi arzu edir;

b) ictimai təhlükəli fəaliyyətilə digərinin əməlinin baş verməsinə kömək edən şərait yaratmaqla, belə əməlin törədilməsini arzu edir;

c) birgə səylə baş verən ictimai təhlükəli nəticə əvvəlcədən arzu edilir,yaxud birgə səylə belə nəticəyə şüurlu surətdə yol verilir.

“İki və daha çox şəxsin cinayətdə qəsdən iştirakı” iştirakçılığın subyektiv əlamətidir. Qəsdən törədilən cinayətlərdə şəxs əməlinin və ya onun nəticələrinin ictimai təhlükəli olmasını dərk edir, iradəvi cəhətdən ya bunları arzu edir ya da, şüurlü surətdə bunlara yol verir. P.F.Telnov qeyd edir ki, çox az hallarda olsa da , iştirakçılar cinayəti dolayı qəsdlə törədirlər.

Bəzi müəlliflərə görə iştirakçılıqda qəsdin növü ictimai təhlükəli nəticəyə deyil, icraçının əməlinə psixi münasibət ilə müəyyən olunur. İcraçının əməli isə ya arzu olunan ola bilər, ya da ona şüurlü surətdə yol verilə bilər (4, s 63). M.İ.Kovalyova gğrə müasir doktrina və qanunvericilik iştirakçılıqda dolayı qəsdin mümkünlüyünü istisna etməlidir. Müəllif hesab edir ki, iştirakçilarin qəsdinin konsturiktiv elementini cinayət törətmək və ya onun törədilməsində iştirak etmək niyyəti təşkil edir. Başqa şəxsdə cinayət törətmək

qətiyyətinin yaradılması və ya buna köməklik etmə iştirakçılığın motiv və məqsədindən asılı olmayaraq həmişə onda birbaşa qəsdin mövcudluğunu təsdiq edir(4, s 63). Ədəbiyyatda belə fikir vardır ki, cinayətkar nəticəyə iradəvi münasibətindən asılı olaraq birbaşa və dolayı qəsdin fərqləndirilməsi iştirakçılığa görə məsuliyyət məsələsinin həllində həlledici ola bilməz. Dolayı qəsdlə törədilən cinayətlərdə iştirakçılığın mümkünlüyü məsəsləsi məsələsində mübahisəli məqam iştirakçılığın ümumqəbul olunmuş əlamətlərindən biri olan hamı üçün ümumi nəticənin, eyni məqsədin mövcudluğudur. Bu növ cinayətlərdə iştirakçılığın mövcudluğu qəbul edildikdə, onda ümumi nəticənin heç də bütün iştirakçılar üçün eyni məqsəd olmadığı aydın görünür. Fikrimizcə, iştirakçılıqla törədilən cinayətlərdə adətən iştirakçıların hamısı birbaşa qəsdlə, az hallarda isə dolayı qəsdlə hərəkət edirlər. Burada əsas məqam ondan ibarərdir ki, hər bir iştirakçı cinayəti təkbaşına törətmədiyini və ümumi nəticəyə birgə fəaliyyət ilə nail olunduğunu dərk edir.

Məlumdur ki,cinayətdə iştirakçılıq ən azı iki nəfərin iştirakı ilə mümkündür. "Qəsdən birgə iştirak etmə" əlaməti iştirakçılıqda ikitərəfli əlaqənin olmasını, ümumi ictimai təhlükəli nəticəyə nail olunması prosesində ən azı iki nəfərin qarşılıqlı fəaliyyətdə olduğunu və qarşılıqlı dərketməni nəzərdə tutur(2, s 84). Məsələn, A adlı şəxs B-yə öz nəqiliyyat vasitəsini vermişdir, lakin nəqiliyyat vasitəsinin cinayətdə istifadə ediləcəyindən xəbərsiz olmuşdur. Bu halda iştirakçılıqdan söhbət gedə bilməz, çünki şəxs cinayətin ediləcəyindən tamamilə xəbərsiz olmuşdur.

İştirakçılıqda, iştirakçılar arasında əvvəlcədən bir razılaşmanın olması mütləq şərt deyildir. Belə ki, hətta artıq icrasına başlanmış ictimai təhlükəli əməlin törədilməsində iştirak etmək etmək də iştirakçılıq hesab edilə bilər. Burada əsas məsələ iştirakçıların razılaşması olmayıb qəsdən edilən bir cinayətdə iştirak etdiyini bilməsi və istəməsidir. Məslən, cəzaçəkmə müəssisəsindən qaçan şəxslə əvvəlcədən razılaşmadığı halda qaçış zamanı mühafizəçilərin diqqətini yayındıran şəxs köməkçi olaraq cinayətdə iştirak etmiş olur(7, s 749). Burada əsas məsələ şəxsin əməlin qanunla qadağan olunduğunu dərk etməsi buna bilərəkdən və şüurlu surətdə yol vermsidir.

Iştirakçıların hamısının bir-birini tanımaması və ya digərlərinin kriminal fəaliyyətindən xəbardar olmaması da mümkündür. Məsələn, təhrikçi məlum cinayətdə köməkçinin rolunu bilməyə bilər(6, s 355). Təşkilatçı, təhrikçi və köməkçinin bir-birindən xəbərdar olmaları vacib olmasa da, icraçının varlığından xəbərdar olması vacibdir. Bu zaman digər iştirakçıların icraçını şəxsən tanımaları da önəmli deyildir. Əsas məsələ onların icraçının varlığından xəbərdar olmaları və həmin icraçının (icraçıların) cinayət törədəcəyini və ya hazırda cinayət törətdiyini bilmələri və dərk etmələri yetərlidir. Cinayətdə iştirak etmək istəyi ən geci cinayət törədilənədək ortaya çıxmalıdır. Cinayət törədildikdən sonra cinayət törətməyə iştirak mümkün deyildir. Əvvəlcədən vəd etmədən icraçını, cinayətin alət və vasitələrini, cinayətin izlərini və cinayət yolu ilə əldə edilən əşyanı gizlətmək müstəqil cinayət tərkibini yaradır. Azərbaycan Respublikası CM-nin 307-ci maddəsində "Cinayət barəsində xəbər verməmə və ya qabaqcadan vəd etmədən cinayəti gizlətmə"yə məsuliyyət müəyyən edilmişdir. Analoji müddəa Rusiya Federasiyası Cinayət Məcəlləsinin 316-ci maddəsində "Cinayəti gizlətmə"adı altında nəzərdə tutulmuşdur. Qeyd etmək lazımdır ki, AR CM-nin 307-ci maddəsində yalnız ağır və ya xüsusilə ağır cinayətin hazırlanmasını və törədilməsini bilərək həmin cinayət barəsində xəbər verməmə cinayət məsuliyyətinə səbəb olur. Böyük ictimai təhlükə törətməyən və ya az ağır cinayət barəsində xəbər verməmə və ya gizlətmə cinayət məsuliyyəti yaratmır. Həmçinin 307-ci maddənin qeydində deyilir: Arvadı (əri), övladları, valideyinləri, və qanunvericiliklə dairəsi müəyyən edilmiş digər yaxın qohumları tərəfindən hazırlanmış və ya törədilmiş cinayət barəsində xəbər verməyən şəxs bu Məcəllənin 307.1-ci maddəsi ilə cinayət məsuliyyətinə cəlb oluna bilməz.

İştirakçılığın mühüm məsələlərindən biri də birgə törədilən cinayətdə hüquqi əhəmiyətli halların iştirakçılara hansı həddə aid edilməsidir. Bu problemin həlli üçün açar rolunu təqsirin həcmi anlayışı, yəni törədilmiş ictimai təhlükəli əməlin hüquqi əhəmiyyətli obyektiv xüsusiyyətlərinə psixi münasibətlərin məcmuyu oynayır(4, s 71).

Məlumdur ki, hər bir iştirakçının təqsirinə yalnız şüuru ilə əhatə olunan hallar aid edilə bilər. Iştirakçılıq o zaman mövcud olur ki, iştirakçıların hər biri cinayətin onun tərəfindən təkbaşına deyil, digər şəxslərlə birgə tğrədilməsi barəsində məlumatı olur. Lakin bəzi alimlər bunu cinayətin bütün iştirakçıları üçün mütləq zəruri əlamət hesab etmirlər(4, s 71). Məsələn, F.Q.Burçak, B.A.Kurinov, Q.A.Kriqer, A.P.Kozlov və başqaları hesab edir ki, cinayətin törədilməsində iştirak edən şəxslərin digər iştirakçıların cinayət əməlləri barədə məlumatlı olası yalnız birgə icraçılıq üçün zəruri olan əlamətdir. İştirakçılığın digər formaları üçün isə bu əlamət mütləq deyildir. B.A.Kurinov gğstərmişdir ki, iştirakçılığın digər formaları üçün icraçının törətməyə hazırlaşdığı cinayət barədə təhrikçinin və köməkçinin məlumatlı olmaları və ona şüurlu surətdə yol verməlari kifayətdir. Icraçının təhrikçi, köməkçi, və təşkilatçının fəaliyyəti barədə məlumatli olması isə iştirakçılıq institutunun hüquqi təbiətindən irəli gəlmir.

Bəzi müəlliflər motiv və məqsədi də təqsirin məzmununu müəyyən edən elementlər sırasına d daxil edir. Ona görə iştirakçılıqla törədilən cinayətlərin subyektiv əlamətlərindən biri də motiv və məqsəd sayılır. Lakin qeyd etmək lazımdır ki, iştirakçıların motiv və məqsədi bir-birindən fərqlənə bilər. Cinayət hüququ nəzəriyyəsində əsasən bu mövqe üstünlük təşkil edir. Yəni cinayətdə iştirakçıların motiv və məqsədi üst-üstə düşə də bilər, düşməyə də bilər. İştirakçılıqla törədilən cinayətlərdə iştirakçıların motivləri fərqlənə bilər, lakin kriminal nəticə hamı üçün eyni olmalıdır. Burada hamı üçün eyni olan kriminal nəticə cinayət məsuliyyətini yaradan hüquqi fakt kimi çıxış edir.

**Nəticə**

Ölkəmizdə cinayət qanunvericiliyi ilə qadağan olunmuş cinayət hesab edilən əməlin iştirakçılıqa tördədilməsi cəzanı ağırlaşdıran hallardan biridir. Bu da belə əməlin ictimai təhlükəliliyinin xarakteri və dərəcəsindən irəli gəlir. İştirakçiliqla törədilən cinayətlərin qarşısının alınması hüquq mühafizə orqanlarının qarşısında duran əsas məsələlərdəndir. Bunun üçün cinayətkarlığı doğuran səbəb və şərait öyrənilməli, məhkəmə təcrübəsi araşdırılaraq ümümiləşdirilməlidir. Cinayətkarlığın statistikası öyrənilməlidir. Məhkum olunmuş şəxslər tərəfindən yenidən cinayət törədilməsinin səbəbləri öyrənilməli və onların qarşısının alınması üçün profilaktik tədbirlər görülməli, təyin edilmiş cəzanın səmərəliyi məsələsi araşdırılmalıdır.

**Ədəbiyyat:**

1.Azərbaycan Respublikası Cinayət Məcəlləsi. http://www.e-qanun.az/code/11

2.Azərbaycan Respublikası Cinayət Məcəlləsinin Kommentariyası. I hissə. Bakı “Hüquq Yayın Evi” nəşriyyatı, 2018. 702 s.

3.Ağayev. İ. B. Cinayət hüququ.Ümumi və xüsusi hissə. Bakı “Nurlar” 2010 .831 s.

4.Əliyev. N. K. Cinayət hüququnda iştirakçılıq problemi: Müasir yanaşma. Monoqrafiya. Bakı, Təknur, 2011. 255 s.

5.Qasımov.A. E. Dəstə tərəfindən törədilən ictimai təhlükəli əməllərlə cinayət-hüquqi mübarizə. Bakı “Hüquq ədəbiyyatı nəşriyyatı” 2002.158 s.

6.Səməndərov.F. Y. Cinayət hüququ.Ümumi hissə. Bakı “Hüquq Yayın Evi” nəşriyyatı, 2018.724 s.

7. Hüseyinoğlu.E. Rusya Federasyonu Ceza Hukukunda suça iştirak. Ankara Universiteti. Hukuk Fak.Dergisi,67 (4) 2018. s 735-782.

8.Mustafa Özen. 5237 Sayılı Türk Ceza Kanununun İştirak Kurumuna Bakışı. TBB Dergisi, Sayı 70,2007. s 239-253

9.Türk Ceza Kanunu

**Subjective sings of participation in crime**

**Summary**

Crimes involving participation are more dangerous in their nature.The subjective aspect of parcticipation in legal doctrine has long been a subject of debate. As some authors have pointed out, participation in careless crimes can also be possible. The law of most countries as well as the legal doctrine states that participation is only possible trough deliberate acts. This position is also reflected in the criminal legislation of the Republic.

**Субъективные признаки причастности к преступлению**

**Резюме**

Преступления, связанные с участием являются более опасными по своей природе. В течение длительного времени субъективный аспектт участия в правовой доктрине был предметом обсуждения. Как отмечают некоторые авторы, участие в неосторожных преступлениях также возможно. Закон большинства стран, а также правовая доктрина гласят, что участие возможно только посредством преднамеренных действимй. Это также отражено в уголовном законодательстве республики.

**Rəyçi: prof. Ş.T.Səmədova**

Göndərilib: 26.02.2020 Qəbul edilib: 28.02.2020

SİYASİ ELMLƏR POLITICAL SCIENCES ПОЛИТИЧЕСКИЕ НАУКИ

DOI: 10.36719/AEM/2007-2020/51/42-45

**Leyla Telman qızı Məmmədova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilk Akademiyası
leyla_mamedova.64@mail.ru

# STRATEJİ YOL XƏRİTƏSİNİN REGİONAL İNKİŞAFA TƏSİRİ

***Açar sözlər:*** *region, inkişaf, strateji yol xəritəsi, iqtisadiyyat.*
***Key words:*** *region, development, strategic roadmap, economy.*
***Ключевые слова:*** *регион, развитие, стратегическая дорожная карта, экономика.*

## Giriş

Bazar iqtisadiyyatı sistemində iqtisadi artımın tənzimlənməsi qarşıda duran mühüm məqsədlərdəndir. Davamlı iqtisadiyyatı təmin etmək məqsədi ilə səhmləşdirmək və özəlləşdirmək kifayət etmir. İqtisadi inkişafı təmin etmək məqsədi ilə ölkə regionlarında mövcud olan təbii resurslardan səmərəli şəkildə istifadə etmək, regionlarda iqtisadi inkişafa nail olmaq mühüm şərtdir. Ölkə iqtisadiyyatını beynəlxalq dərcədə iqtisadi inkişaf səviyyəsinə çatdırmaq məqsədi ilə yuxarıda qeyd olunanlarla birgə sahə və regional dövlət siyasəti, dolayı və birbaşa dövlət müdaxiləsi tələb edilir. İqtisadçıların bir çoxu keçid dövrünün iqtisadiyyatını analiz edərək belə bir nəticəyə gəlmişlər ki, bu dövrdə ölkənin rolu nəzərdə tutulandan çox daha da genişdir. Ölkəmizdə iqtisadiyyatın inkişafı müstəqillik əldə olunduğu illərdə neft sektorundan asılı formada olmuş, təkistiqamətli iqtisadi inkişaf ilə əlaqədar regionlar arası disproporsiyalar çoxalmış, paytaxt ərazisinə işçi qüvvəsinin axını baş vermişdir. Bu cür şəraitdə ölkədə regionlarda iqtisadi inkişafa nail olmaq məqsədilə tədbirlər görülməsi dövlətin əsas vəzifələrindən birinə çevrilmişdir.

Regional iqtisadi inkişafın idarə edilməsi üçün əsasən məqsədli büdcə transfertlərindən, dövlət proqramlarından, sərəncam və fərmanların qəbul edilməsindən və başqa bir çox məhdud sayda alətlərdən istifadə edilir. Qeyd olunanlar arasında regional siyasətin məqsədlərinə çatmaq üçün əsas alətlərdən biri regionların inkişaf etməsi üçün məqsədli şəkildə proqramların işlənib hazırlanması və həyata keçirilməsidir.

## 1. Regionların inkişafında dövlətin rolu

Ölkə regionlarının ümumi şəkildə inkişafı, onun əhalisinin yaşayış səviyyəsini yaxşılaşdırmaqdan, əhalinin məskunlaşmasını təşkil etməkdən, regionun təbii potensialından mövcud mənafelərin tarazlığı cəhətdən istifadə edilməsindən ibarətdir. Regional bazar ümumilikdə iqtisadiyyatın tərkib hissəsi olmaqla yanaşı, maliyyə, əmtəə-xidmət və başqa resurslara təklif və tələbin yaranması və istifadə olunmasına ən optimal yolların aşkar edilməsini özündə ehtiva edir. Regionların inkişaf xüsusiyyətlərə aşağıdakı xüsusiyyətlər aiddir:

1. region əhalisinin tələbat sistemi;
2. mənəvi və maddi resurslara təklifin yaranması;
3. əhalinin alıcılıq qabiliyyətini müəyyənləşdirmiş gəlirlər;
4. sahibkarlıq fəaliyyətinin hesabına tələbatının ödənilmə dərəcəsi;
5. regionda sosial infrastrukturun inkişaf etmə səviyyəsi;
6. idxal və ixracın əmtəə təklif və tələbinin yaranmasında əhəmiyyəti;
7. əhalinin demoqrafik xüsusiyyətləri.

Ölkələrin və regionlarının iqtisadi sisteminin qeyd olunan amillərdən asılılığının sübuta ehtiyacı yoxdur. Buna görə də iqtisadi layihələrin və proqramların reallaşdırılmasında dövlət iqtisadiyyatı və həmçinin, idarəetmə sistemini tənzimlənməsinin optimallığını təmin edən vacib ərazi amilləri qəbul olunmuşdur və hazırda da istifadə olunur [2; s. 45]. İnkişafın regional əsaslarının daha ətraflı şəkildə tədqiq olunmasının vacibliyi son dövrlərdə nisbətən ortaya çıxmış və hazırda da bu istiqamətdə olan tədqiqatların ən dinamik amillərindən olan regional inkişaf nəzəriyyələri, konsepsiyaları xüsusi əhəmiyyətə malikdir.

Regional inkişaf siyasəti ölkənin sosial-iqtisadi inkişaf siyasətinin vacib tərkib hissəsi olduğundan reallaşdırılması mexanizmi də ümumilikdə ölkənin iqtisadi-sosial inkişaf siyasət mexanizminin əsas tərkib hissəsidir.

Hal-hazırda müəyyən qədər inkişaf etmiş dövlətlərdə dövlət regional siyasəti formalaşmışdır. Bu siyasət hələ özünün ilkin dövrlərindən dövlətin yeritmiş olduğu sosial-iqtisadi siyasətin ölkə miqyasında reallaşdırılmasını təmin etmək məqsədini güdür. Xüsusilə məhsuldar qüvvələri zəif inkişaf edən regionlarda

istehsalın üstün sürətli şəkildə yerləşməsi və inkişafına şərait əmələ gətirmək, demokratik dövlətlərdə genişlənməkdə olan regional sosial, ekoloji və iqtisadi ziddiyyətləri yumşaltmaq məqsədini güdür.

Ölkə iqtisadiyyatımızın, xüsusilə kənd təsərrüfatı və sənayenin ərazi və sahə quruluşunun qarşılıqlı əlaqədə təkmilləşməsi, respublikada ictimai əmək bölgüsünün bir sıra yeni istiqamətlərdə inkişafı ilə bağlı müvafiq iqtisadi, inzibati, təşkilati idarəetmə tədbirlərinin reallaşdırılması və düzgün siyasət yeridilməsi çox vacib məsələdir.

Regional inkişaf proqramına regionun müəyyən müddət ərzində nəzərdə tutulan strateji inkişaf konsepsiyasının həyata keçirilmə mexanizminin əsas elementi olaraq baxılır. Konsepsiya regional inkişafın strateji məqamlarını ümumi şəkildə əks etdirən sənəd olduğuna görə onun reallaşdırılması məqsədiylə regional idarəetmə orqanlarının, digər təsərrüfatçılıq və idarəetmə subyektlərinin, regional inkişafda maraqlı olan başqa tərəflərin hərəkət və niyyətlərin konkretləşdirilməsi və dəqiqləşdirilməsi tələb edilir. Ümumi strateji ideyanın konkretləşdirilməsi və dəqiqləşdirilməsi isə regional inkişaf proqramının hazırlanması çərçivəsində reallaşdırılır. [3; s. 57]

Regional inkişaf proqramlarının ən mühüm xüsusiyyəti odur ki, onlar inkişaf istiqamətlərinin tərkibinin sosial və iqtisadi əhəmiyyətini, məqsədəuyğunluğunu və proqram tədbirlərinin dövlət, bələdiyyə və regional səviyyəsində maliyyələşdirilməni nəzərə almaqla müəyyənləşdirilir. [5]

Təcrübə göstərir ki, proqramlar regionda sosial-iqtisadi inkişafın idarə edilməsində səmərəli şəkildə istifadə oluna bilər. Proqram məqsədli metodun əsas xarakterik cəhəti odur ki, bu metod elmi-texniki və sosial-iqtisadi proseslərin inteqrasiyasının 2 tipini reallaşdırmağa: müxtəlif regionlara, sahələrə və yaxud mülkiyyət formaların məxsus olan subyektlərin səylərini birləşdirmək tələb edildikdə məkanca ineqrasiyaya, proqramda nəzərdə tutulan son məqsədə istiqamətlənmiş ümumi hərəkət proseslərinin müxtəlif mərhələlərinin vəhdətinə və dəqiq ardıcıllığına nail olmaq tələb edildikdə zamanca inteqrasiyaya şərait yaradır.

Regionların inkişafının artırılması və onlar arasında mövcud olan iqtisadi inkişaf fərqlərinin ən az səviyyəyə qədər endirilməsi regional inkişafda tələb edilir. Bu səbəbdən də prezident cənab İlham Əliyev 2004-cü il 11 fevral tarixli fərman ilə “ Azərbaycan Respublikası regionlarının sosial iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər)”nı imzaladı. Son zamanlarda, ümumiyyətlə, bir çox sosial və iqtisadi yönümlü dövlət proqramları qəbul olunmuşdur. Buraya “2008-2015-ci illərdə Azərbaycan Respublikasında yoxsulluğun azaldılması və davamlı inkişaf Dövlət Proqramı”, “2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı”, “2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair Dövlət Proqramı”, “Azərbaycan Respublikasında rabitə və informasiya texnologiyalarının inkişafı üzrə 2010-2012-ci illər üçün Dövlət Proqramı (Elektron Azərbaycan)”, “Azərbaycan Respublikasının Məşğulluq Strategiyasının həyata keçirilməsi üzrə 2011-2015-ci illər üçün Dövlət Proqramı”, “Azərbaycan Respublikası regionlarının 2009-2013-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı”, 27 fevral 2014-cü ildə təsdiqlənən “Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı” və regional inkişaf planlarını daxil etmək mümkündür [6]. 2014-2018-ci illəri əhatə edən dövlət proqramının 3-cü hissəsinin müvəffəqiyyətlə reallaşdırılması nəticəsində regionlarda vacib infrastrukturun yaradılmasına, habelə, regionlarda quruculuq səylərinin artırılmasına şərait yaradılıb. Ümümiyyətlə, inkişaf mütəmadi şəkildə reallaşdırılır və əldə edilən uğurlar bunu sübut edir.

Ümumilikdə nəzərdən keçirildikdə, respublikamızda iqtisadiyyat və başqa bütün sahələrdə, habelə, sosial sahələrə tətbiq olunan dövlət siyasəti uğurlu şəkildə həyata keçirilir. Məhz bu cəhətdən reallaşdırlan bütün işlər müsbət nəticələrini göstərməkdədir. Reallaşdırılan sosial siyasət nəticəsində inkişaf nəzərə çarpacaq dərəcədə artmış, yoxsulluğun miqyası azalmışdır. Dövlət proqramlarının icra edildiyi 2004-2018-ci illərdə ÜDM 3,3 dəfə, həmçinin, qeyri-neft sektoru üzrə 2,8 dəfə, kənd təsərrüfatı üzrə 1,7 dəfə, sənaye üzrə 2,6 dəfə çoxalmışdır.

Dövlət başçımızın regionların inkişafına göstərdiyi qayğı və diqqət nəticəsində ölkəmizin bir çox regionlarında sahibkarlıq fəaliyyəti genişlənmişdir. Yeni xidmət və istehsal müəssisələri, sosial infrastruktur obyektləri yaradılmış, insanların məşğulluq səviyyəsinin yüksəlmişdir. Son illər reallaşdırılan tədbirlərin məntiqi nəticəsi olaraq respublikamızın makroiqtisadi göstəriciləri müsbət istiqamətdə artmış, əhalinin həyat səviyyəsi yüksəlmiş, regionlarda sahibkarlıq fəaliyyəti inkişaf etmişdir. [2; s. 77] Sahibkarlıq fəaliyyətinin inkişafı regionlarda yaşayan insanların məşğulluğunun təmin olunmasında mühüm rol oynamışdır.

Respublikamızda aparılan uğurlu islahatlar nəticəsində 2019-cu ilin I rübündə əhalinin gəlirləri 10 faiz artmış, inflyasiya isə 4 % təşkil etmişdir. Ölkəmizin qarşısında heç bir iqtisadi çətinlik və maliyyə çətinliyi yoxdur. Azərbaycanda güclü iqtisadiyyat yaranmış, həmçinin, sosial problemlərin həll edilməsində müəyyən addımlar atılmışdır. Respublikamızın iqtisadi imkanları olmasaydı, burada maaşları, pensiyaları artırmaq, infrastruktur layihələri reallaşdırmaq mümkün olmazdı. Azərbaycan iqtisadiyyatının rəqabətqabiliyyətliliyi

istiqamətində görülən işlər diqqəti cəlb edir. DİF-in (Dünya İqtisadi Forumunun) apardığı hesablamalarında rəqabətqabiliyyətliliyə görə ölkəmiz 35-ci yerə yüksəlib. Hal-hazırda Azərbaycan dünyanın ən rəqabət qabiliyyətli 35 ölkəsindən biri hesab olunur.

**2. Strateji yol xəritəsinin regionların inkişafında rolu**

Dövlətin iqtisadi siyasətində Azərbaycanın hər bir regionun sürətli və tarazlı inkişaf etdirmək əsas istiqamətlərdən biridir. Regionların sosial-iqtisadi inkişafını şərtləndirən dövlət proqramları bu baxımdan xüsusi qeyd edilməlidir. Belə ki, regionların, habelə Bakı şəhərinin qəsəbələrinin sosial-iqtisadi inkişafı dövlət proqramları rayon və qəsəbələrin iqtisadi potensialının əhəmiyyətli dərəcədə artmasına, infrastruktur təminatının, kommunal xidmətlərin keyfiyyətinin daha da yaxşılaşmasına, müasir müəssisələrin açılmasına, ümumən qeyri-neft sektorunun inkişafının sürətlənməsinə səbəb olub, Azərbaycan bütün bölgələrində dinamik tərəqqi yaşanan ölkəyə çevirib. Hazırda ən ucqar yaşayış məntəqələrinin belə dayanıqlı elektrik enerjisi, qaz, içməli su ilə təmin olunması ilə bağlı işlər görülür, rahat yollar, müasir təhsil, səhiyyə, mədəniyyət, idman obyektləri istifadəyə verilir. Bu dövlət proqramlarının uğurlu icrası sayəsində regionların inkişafına, əhalinin yeni iş yerləri ilə təmin olunmasına, yoxsulluğun və işsizliyin minimuma endirilməsinə nail olunub.

Son dövrlərdə istər regionda, istərsə də qlobal iqtisadiyyatda gedən proseslər, neft gəlirlərinin kəskin azalması, mürəkkəb xarici iqtisadi mühit ölkənin makroiqtisadi və maliyyə sabitliyinə öz təsirini göstərməkdədir. Dünyada cərəyan edən proseslərin yaratdığı yeni çağırışlara uyğunlaşmaq və mövcud qlobal iqtisadi böhranın ölkəmizə təsirini minimuma endirmək məqsədilə iqtisadi islahatların əsas strateji hədəflərinə uyğun olaraq sistem xarakterli bir sıra tədbirlərin həyata keçirilməsi, sosial-iqtisadi inkişafın cari, orta və uzunmüddətli dövrləri arasında üzvi bağlılıq və qarşılıqlı uzlaşma yaratmaqla, iqtisadi inkişafın keyfiyyətcə yeni modelinin formalaşdırılması qarşıda duran əsas prioritet vəzifələrdəndir [1; s. 1]. Azərbaycanda iqtisadi islahatların uğurla həyata keçirilməsi, eyni zamanda, əvvəlki illərdən yaradılan möhkəm maliyyə-iqtisadi potensial hesabına ölkə iqtisadiyyatının dayanıqlığı qorunub saxlanılıb. Son dövrlərin pozitiv nəticələri respublika iqtisadiyyatının yalnız neft amilindən asılılığı barədə indiyədək irəli sürülən müəyyən iddiaların əsassızlığını da tam sübuta yetirib.

Şübhəsiz ki, bu məsələdə milli iqtisadiyyat və onun əsas sektorları üzrə strateji yol xəritələrində qarşıya qoyulan vəzifələrin uğurlu icrası da öz müsbət təsirini göstərib. Azərbaycan Prezidenti İlham Əliyevin 2016-cı il 6 dekabr tarixli “Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritələrinin təsdiq edilməsi haqqında” fərmanında qeyd olunduğu kimi, dünyada cərəyan edən proseslərin yaratdığı yeni çağırışlara uyğunlaşmaq və mövcud qlobal iqtisadi böhranın ölkəmizə təsirini minimuma endirmək üçün iqtisadi islahatların əsas strateji hədəflərinə uyğun sistem xarakterli bir sıra tədbirlərin həyata keçirilməsi, sosial-iqtisadi inkişafın cari, orta və uzunmüddətli dövrləri arasında üzvi bağlılıq və qarşılıqlı uzlaşma yaratmaqla iqtisadi inkişafın keyfiyyətcə yeni modelinin formalaşdırılması hazırda qarşıda duran əsas prioritet vəzifələrdəndir.

“Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə Strateji Yol Xəritəsinin başlıca istiqamətləri”ndə nəzərdə tutulan vəzifələrin həyata keçirilməsi ölkəmizdə makroiqtisadi sabitliyin qorunub saxlanılmasına, qeyri-neft sahələrinin, bütövlükdə regionların tarazlı inkişafının sürətlənməsinə, əlverişli biznes və investisiya mühitinin formalaşmasına və əhalinin sosial rifahının davamlı olaraq yaxşılaşmasına öz müsbət təsirini göstərir [5]. İlham Əliyevin “Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritəsinin başlıca istiqamətlərinin təsdiq edilməsi və bundan irəli gələn bir sıra məsələlər haqqında” 2016-cı il 16 mart tarixli 1897 nömrəli Sərəncamına müvafiq olaraq milli iqtisadiyyat və iqtisadiyyatın 11 sektoru üzrə ümumilikdə 12 strateji yol xəritəsi hazırlanmışdır. Milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi qısa, orta və uzunmüddətli dövrləri əhatə etməklə, 2020-ci ilədək iqtisadi inkişaf strategiyası və tədbirlər planı, 2025-ci ilə qədər olan dövr üçün uzunmüddətli baxış və 2025-ci ildən sonrakı dövr üçün hədəf baxışdan ibarətdir. [4]

Sözügedən yol xəritəsinin icrası ilə bağlı regionlarda kənd təsərrüfatı təyinatlı torpaqların alqı-satqı, icarə və istifadəyə verilməsi ilə bağlı prosedurların sadələşdirilməsi, habelə kənd təsərrüfatına yararlı torpaqların istifadəsiz saxlanılmasının qarşısını almaq üçün müvafiq mexanizmlərin tətbiqi sahəsində beynəlxalq təcrübə araşdırılıb və mövcud qanunvericiliyin monitorinqi aparılıb. Su ehtiyatları, suvarılan torpaq sahələrinin və suvarma suyuna tələbatın ödənilməsi vəziyyəti öyrənilib. Regionların kənd təsərrüfatı texnikası parkının davamlı olaraq yenilənməsi məqsədilə texnika parkının mövcud vəziyyəti təhlil edilib. Bununla yanaşı, kənd təsərrüfatı məhsullarının istehsalı və ilkin emalı üzrə kiçik və orta təsərrüfat subyektlərinin kiçikhəcmli texnikaya, maşın və avadanlıqlara olan ehtiyaclarını öyrənmək üçün rayonlarda sorğular keçirilib. Toxumçuluq haqqında yeni qanun layihəsi işlənib hazırlanıb.

Sənəd sadəcə inkişaf məqsədləri və prinsiplərini deyil, həmçinin, hər bir istiqamət üzrə qlobal meyilləri, iqtisadiyyatın 360 dərəcəli diaqnostikasını və mövcud vəziyyətin GZİT təhlilini, görüləcək tədbirləri, tələb

edilən investisiya və nəticə indikatorlarını əhatə edir. Qısamüddətli dövrdə seçilmiş prioritetlərə fokuslanmaqla orta və uzunmüddətli dövrlərdə iqtisadi inkişafın bünövrəsi qoyulacaqdır. Strateji Yol Xəritəsi iqtisadi inkişafa töhfə verən bütün faktorları, həmçinin, yerli və beynəlxalq özəl sektor nümayəndələrinin kommunikasiyası və əməkdaşlığı üçün imkanları təmin edəcəkdir. Dövlət investisiyaları katalizator rolunu oynayacaq, iqtisadi inkişafın lokomotivi isə özəl sektor olacaqdır.

Xüsusi olaraq qeyd olunmalıdır ki, Strateji Yol Xəritəsinin qəbulundan sonra onun reallaşdırılması üçün müvafiq dövlət qurumları öz fəaliyyətlərini daha da müfəssəl proqramlar əsasında quracaqlar. Sənəddə nəzərdə tutulan layihələrin reallaşdırılmasından əvvəl texniki-iqtisadi əsaslandırılma aparılacaq və hər bir təşəbbüs üzrə müvafiq dövlət qurumları cavabdehlik daşıyacaqlar.

**Nəticə**

Respublikamızda tətbiq olunan regional inkişaf dövlət proqramları sosial-iqtisadi idarəetmədə dövlət tənzimləməsinin müəyyən bir forması olmaqla, ölkənin iqtisadiyyatının diversifikasiyasını, regional və sahəvi strukturunun təkmilləşdirilməsini, insanlarının məşğulluq səviyyəsinin, regionların investisiya cəlbediciliyinin artırılmasını təmin edir.

Ölkəmizin sürətli inkişafında bölgələrin hər rayonu üçün xüsusi istehsal sahələri təşkil edilir. Məhz strateji yol xəritələrində də regionlarda istehsal potensialının tam olaraq reallaşdırılması, dəyər zəncirinin həlqələrinə əsaəsən artırılmasına nail olmaqla əlaqədar tədbirlər öz əksini tapmışdır.

Həyata keçirilən düzgün sosial-iqtisadi strategiyanın nəticəsidir ki, Azərbaycan artıq dünyada özünəməxsus milli inkişaf modeli ilə seçilən, habelə sərmayədar dövlət və qlobal böhran şəraitində belə makroiqtisadi sabitliyi təmin edən ölkə kimi tanınıb. Şübhəsiz ki, Prezident İlham Əliyevin rəhbərliyi altında son illərdə regionlarımızın regionları güclü, müstəqil və müasir inkişaf edən bir respublika olaraq nüfuz qazanmasının da səbəbi məhz bununla bağlıdır.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikası regionlarının 2019–2023-cü illərdə sosialiqtisadi inkişafı Dövlət Proqramı”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı. Bakı, 184 s.
2. Qasımov Ə.C., İsrafilov H.A., Hacızadə E.M., Ağayev E.A. (2006) Regionların sosial-iqtisadi inkişaf problemləri. Bakı: Çıraq, 314 s.
3. Səmədzadə Z., Novruzov V. (2017) Azərbaycan iqtisadiyyatının Strateji yol xəritəsi: Hesabatlılıq və şəffaflıq problemləri (beynəlxalq elmi-praktik konfrans). Bakı, 526 s.
4. https://azerbaijan.az/_Economy/_newWorks/_newWorks_a.html
5. http://old.xalqqazeti.com/az/news/economy/109743
6. https://static.president.az/pdf/38542.pdf

**Influence of strategic roadmap on regional development**
**Summary**

The development of regions in Azerbaijan has great potential. The article examines the state support for the development of the regions, the state programs adopted for this purpose, the specifications of the road map for regional development. The article also discusses the impact of regional development on the country's economy.

**Влияние стратегической дорожной карты на развитие регионов**
**Резюме**

Развитие регионов в Азербайджане имеет большой потенциал. В статье рассматриваются вопросы государственной поддержки в развитии регионов, государственные программы, принятые для этой цели, спецификации дорожной карты регионального развития. В статье также обсуждается влияние регионального развития на экономику страны.

**Rəyçi: dos. İ.İ.Qafarov**

Göndərilib: 12.02.2020 Qəbul edilib: 15.02.20

DOI: 10.36719/AEM/2007-2020/51/46-49

**Seyranə Əflatun qızı Xəlilzadə**
Azərbaycan Turizm ve Menecment Universiteti
seyrane.xelilzade@gmail.com

# SİVİLİZASİYALARIN TOQQUŞMASI

***Açar sözlər:*** sivilizasiya, Qərb, islam, qloballaşma
***Key words:*** civilization, West, Islam, globalization
***Ключевые слова:*** цивилизация, Запад, ислам, глобализация

Sivilizasiyaların toqquşması anlayışı 1993-cü ildə amerikalı tədqiqatçı S.Hantinqton tərəfindən irəli sürülmüş və 2008-ci ildə ölümünəcən 15 il ərzində Hantinqtonun tərəfindən inkişaf etdirilmişdir. Məşhur Amerikalı politoloq S.Hantinqton 1993-cü ilin yayında "Foreign Affairs" jurnalında "Sivilizasiyaların toqquşması?" məqaləsini dərc etdi. Məqalə müxtəlif ölkələrin ictimai-siyasi düşüncə nümayəndələrinin geniş marağına səbəb oldu. Sonralar "Sivilizasiyaların toqquşması?" məqaləsi S.Hantinqtonun qeyd etdiyi kimi, "əvvəllər yazdıqlarımdan daha çox həyəcan doğurdu" [8, s.7]. Eyni zamanda, qeyd etmək lazımdır ki, 1993-cü il məqaləsinin başlığında, S. Huntington sual işarəsindən istifadə etsə də, demək olar ki, hər kəs bu sual işarəsini görməzdən gəlmişdir. [8, s.8]. Bu, xüsusi maraq doğurur, belə ki, amerikalı politoloq məsələni ortaya qoyur, sual verərək izah tələb edir və dünyada baş verən qlobal dəyişikliklərin təhlükəli istiqamət alması sual işarəsini təsdiq işarəsinə çevirir. "Sivilizasiyaların toqquşması və dünya nizamının yenidən qurulması" monoqrafiyasının aşağıdakı müddəası buna sübutdur: "Modernləşmədən qaynaqlanaraq, mədəniyyət prinsipinə uyğun olaraq qlobal siyasi məkanın yenidən qurulması baş verir. Xalqlar və qohum mədəniyyətli dövlətlər bir-birinə yaxınlaşır. Müxtəlif mədəniyyətli xalqları və dövlətlər isə, əksinə, bir-birindən uzaqlaşırlar. Fövqəldövlətlərin ideologiyası və münasibətləri ilə müəyyən edilən birliklər və bloklar müəyyən bir mədəniyyətə və sivilizasiyaya mənsub olduğu diktə edilən birliklər ilə əvəz olunur. Siyasi hüdudlarla yanaşı, mədəni sərhədlərin uyğunlaşdırılmasına yönəlmiş proseslər sürətlənir. Ortaq bir mədəniyyətlə birləşən cəmiyyətlər Soyuq Müharibənin bloklarını əvəz edir və sivilizasiyalar arasındakı tektonik çatların xətləri dünya siyasətinin qarşıdurma və toqquşma baltalarına çevrilir " [8, s.27].

Huntington səkkiz sivilizasiyanı müəyyənləşdirir: Qərb, Konfutsi, Yapon, İslam, Hind, Pravoslav Slavyan, Latın Amerikası, Afrika. SSRİ və dünya sosialist sisteminin dağılmasından sonra əsas dünya qarşıdurması sivilizasiyaların toqquşmasıdır. Hantinqtona görə, dünya sosialist sisteminin süqutundan sonra qarşıdurmaların çoxu mədəniyyət tərəfindən müəyyən ediləcək və sivilizasiyaların toqquşması dünya siyasətində dominant amilə çevriləcəkdir. Sivilizasiyaların toqquşması qlobal münaqişələrin təkamülünün son mərhələsidir. Fransa İnqilabından əvvəl, qarşıdurmaların əsas xətləri dövlətlər arasında, sonra - millətlər arasında, birinci dünya müharibəsindən sonra -ideologiyaların qarşıdurması baş verdi. Bunlar əsasən Qərb sivilizasiyasının münaqişələri idi. İndi isə "sivilizasiyalar arasındakı xətlər - bunlar gələcək cəbhələrin xətləridir." Gələcəyin əsas qarşıdurması Qərb və qeyri-Qərb sivilizasiyalarının, əsasən də İslamın qarşıdurması olacaq. Sivilizasiyalar oxşar cəhətlərlə- dil, din, tarix, adət, ənənələr, müəssisələrə və hər bir fərdin subyektiv özünü identifikasiyası ilə əlaqəli olur. Özünü identifikasiyanın müxtəlif səviyyələri var: belə ki, Romada məskunlaşan sakin özünü romalı, italyan, katolik, xristian, avropalı, qərbli kimi identifikasiyalaşdıra bilər. İnsanların mədəni identifikasiyası dəyişə bilər, və nəticədə bu və yaxud digər sivilizasiyanın tərkibi və sərhədləri də dəyişmiş olacaq [7, s.537].

Sivilizasiya böyük insan kütləsini əhatə edir- məsələn, L.Pay Çin üçün qeyd edir ki "Çin özünü dövlət kimi qələmə verən sivilizasiyadır". Lakin eyni zamanda, sivilizasiya çox az tərkibə də malik ola bilər. Misal üçün, Karib adaları hövzəsinin ingilisdilli sakinlərinin sivilizasiyası kimi. Sivilizasiya bir neçə dövləti (qərb, latın amerikan, ərəb sivilizasiyaları kimi), və yaxud bir dövləti (Yaponiya) əhatə edə bilər. Qərb sivilizasiyası əsasən, Avropa və Şimali Amerika, İslam sivilizasiyası isə əsasən, ərəb, türk və malay sivilizasiyalarında əks olunur. Bunlar arasında sərhədlər bulanıqdır, lakin realdır. Sivilizasiyalar dinamikdir, onlar çiçəklənir və ya tənəzzül edir, inkişaf edir və ya parçalanıb məhv olurlar. Toynbinin hesablamalarına görə, bəşəriyyət tarixində 21 sivilizasiya mövcud olmuş, və müasir dövrdə onlardan yalnız 6-sı mövcuddur [10, s.116 ]. Sivilizasiyalar arasında münaqişələr qaçınılmazdır. Bunun bir neçə səbəbləri var:

1. Sivilizasiyalar çox müxtəlifdir. Onlar müxtəlif dil, din, tarix, mədəniyyət, ənənələrə və s. malikdirlər.

2. Dünya getdikcə daha sıx əlaqələnir. Şimali Afrikadan Fransaya immiqrasiya fransızlarda düşmənçilik münasibəti doğurdu, lakin eyni zamanda, digər immiqrantlar üçün – Polşadan avropalılar və katoliklər

üçün xoşməramlı münasibət doğurdu.Amerikanlar Kanada və Avropa dövlətlərinin iri investisiyalarına sakit yanaşdıqları halda, Yaponiyadan iri kapital qoyuluşlarına həssas yanaşırlar.

3. Üçüncüsü, iqtisadi modernləşmə və sosial dəyişikliklər bütün dünyada insanların ənənəvi identifikasiyasını qarışdırır və beləliklə, milli dövlətlərin identifikasiya mənbəsi kimi rolu zəifləyir.

4. Dördüncüsü, sivilizasyon özünüdərk Qərbin rolunun ikiyə ayrılması ilə diktə olunur. Bir tərəfdən, Qərb öz qüdrətinin ən pik nöqtəsindədir. Digər tərəfdən məhz bu, digər qeyri qərb dövlətlərini öz tarixi mədəni köklərinə qayıtmağa sövq edir.

5. Beşincisi, iqtisadi və siyasi dəyərlər dəyişikliklərə tez məruz qalır, nəinki, mədəni özəlliklər. Məhz buna görə də, mədəni fərqləri həll etmək və yaxud kompromisə gətirmək daha qəlizdir. Keçmiş kommunistlər demokratlara, zənginlər yoxsullara çevrilə bilərlər. Lakin ruslar estonlara, azərbaycanlılar ermənilərə çevrilə bilməzlər [5, s.22].

Huntingtonun yeni geosiyasi vəziyyəti qısa olaraq - the West and the Rest (Qərb və digərləri) olaraq qeyd edir. Zənnimcə, Huntingtonun konsepsiyası, dünya sosialist sisteminin siyasi çökməsi və SSRİ-nin geosiyasi yoxa çıxması kontekstində birqütblü dünya siyasətində “yeni dünya nizamının” formalaşması zərurətinə cavab idi.

Hər hansı bir formada geosiyasi mübarizə əsasən təbii ehtiyatlar və “insan kapitalı” kimi inkişaf mənbələri uğrunda baş verir. SSRİ-nin dağılması Qərbin əvvəllər arzuolunan dərəcədə mənimsəyə bilmədiyi coğrafi, iqtisadi və informasiya-ideoloji (mədəni) məkanların ekspansiyası üçün “azad edildi”. 90-cı illərin birinci yarısında və elə bu gün də, bu məkanların və onların resurslarının ələ keçirilməsi üçün İslam amili ən əlverişli vasitə idi. Bir tərəfdən, ən zəruri təbii sərvətlər (neft, təbii qaz, müxtəlif filizlər, su ehtiyatları və s.) əsasən keçmiş Sovet limanının İslam sektorunda (şimal-qərb və şimali Afrika, cənub-qərb, cənub və cənub-şərq Asiya ) cəmləşmişdir. Digər tərəfdən, Rusiyanın, postsovet və post-sosialist Avrasiya ölkələrinin sosial quruluşunda İslam əhalisinin olması, separatizmin və konfessiyalararası ziddiyyətlərin təşəbbüsü ilə bu dövlətlərin ərazilərini parçalamaq və resurslarını ən əlverişli şərtlərdə istifadə etmək üçün ümid verir [11, s.68].

Ötən əsrin 90-cı illərinin ilk yarısında “sivilizasiyaların toqquşması” anlayışının meydana çıxması təsadüfi deyildi, coğrafi məkanın mənbələri üçün ona qarşı mübarizədə əməkdaşlıq və fəaliyyət birliyini təmin etmək üçün yeni “bütün sivil dünyanın düşməni” nin tapılması zəruri idi.

Keçmiş düşmən - içərisində kommunizm nəzəriyyəsi hakim olan sosializm sistemi məğlub oldu, Koreya, Vyetnam, Anqola və planetin hər hansı bir yerindəki müharibələri əsaslandıran ideoloji qarşıdurma sona çatdı. Huntington haqlı idi. Sivilizasiyaların toqquşması, dünyanın hər bir bölgəsində Qərbin genişlənməsi üçün demək olar ki, əbədi, dəyişməz bir əsaslandırma təmin edir, çünki əsas rəqib yalnız İslamdır. Artıq bütün planet genişlənmə obyektidir. Dünya tarixində ilk dəfə olaraq, yeganə böyük güc və onun əsas müttəfiqləri, ekvivalent qlobal müxalifətlə qarşılaşmayan mütləq qlobal gücə sahibdir, yəni onlar öz super korporasiyalarının dəyərlərini və iqtisadi layihələrini hər şeyə tətbiq edə bilər.Qərbin qlobal genişlənməsinin nəzəri əsaslandırılması (ilk növbədə iqtisadi korporasiyalarının genişlənməsi) qloballaşma anlayışıdır [6, s.7].

Qloballaşma anlayışı “sivilizasiyaların toqquşması” nəzəriyyəsini gücləndirir. Qloballaşma əsaslandırır ki, Qərbin genişlənməsi - eqoist olaraq digər xalqların və cəmiyyətlərin resurslarından öz məqsədləri üçün istifadə etmək istəyi nəticəsində deyil, iqtisadiyyatların və mədəniyyətlərin qlobal qarşılıqlı asılılığının obyektiv qanununun nəticəsidir. Rus çarı I Aleksandr dediyi kimi: “Sizi mən cəzalandırmıram, qanun cəzalandırır”. Bununla belə, iqtisadiyyatların və mədəniyyətlərin qarşılıqlı asılılığının heç bir şəkildə bərabər olmamasına diqqət yetirilmir. Qloballaşma dövründə mədəniyyətlər və sivilizasiyaların bərabərliyi yoxdur. Liberal sivilizasiya üstünlük təşkil edir və öz ideyalarını digərlərinə tətbiq edir,ənənəvi sivilizasiya isə kənarda qalır. Ənənəvi cəmiyyətlərin tibb, fəlsəfə və kulinariya ənənələrinin qədim prinsipləri liberal sivilizasiyaların həyatına və mədəniyyətinə nüfuz edir. Liberal siyasi plüralizmin və sərbəst bazar iqtisadiyyatının qərb prinsipləri isə ənənəvi cəmiyyətlərin iqtisadiyyatına və siyasətinə nüfuz edir. Soyuq Müharibədən sonra, bildiyimiz kimi, iki prinsip tətbiq olunur: “Qaliblər mühakimə olunmur” və “məğlub olanların vay halına!” Geosiyasi genişlənməyə gəldikdə, bu deməkdir ki, hazırda Qərb qalibləri genişlənmə aktorlarını “təmiz”, yəni azadlığı sevən və demokratiyaya sadiq olanlar və“murdar”lara, yəniavtoritarizmə sadiqlərə seçirlər. Birincisi bütün növ məkanlarda regional və qlobal genişlənməni həyata keçirə bilər və keçirməlidir, ikincisi isə edə bilməz və cəhd etsələr belə cəzalandırılacaqlar (keçmiş Yuqoslaviyanın, İraqın, Şimali Koreyanın taleyi) [2, s.7].

Xatırladaq ki, Qərb sivilizasiyasının əsas düşməni olaraq Huntington, "on üç əsr boyu sərhədləri qanla örtülən" İslam sivilizasiyasını elan edir. 2001-ci ilin sentyabr hücumları, əsl mənbəyi nə olursa olsun, sivilizasiyaların toqquşması nəzəriyyəsini tamamlamağa və “şər oxu” anlayışından istifadə edərək beynəl-

DOI: 10.36719/AEM/2007-2020/51/58-64

**Əli Umud oğlu Əliyev**
ADPU-nun Ağcabədi filialı

# MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ FOLKLOR NÜMUNƏLƏRİNİN ÖYRƏDİLMƏSİ

***Açar sözlər:*** *ümumi təhsilə hazırlıq, Gənclər siyasəti, Gənclər günü, folklor, xalq oyunları*
***Key words****: preparation for general education, Youth policy, Youth day, folklore, folk games*
***Ключевые слова****: подготовка к общему образованию, молодежная политика, день молодежи, фольклор, народные игры*

Məktəbəqədər təhsil müəssisələrində folklor nümunələrinin öyrədilməsi hərtərəfli inkişafın özülüdür. Odur ki, 14 aprel 2017-ci il tarixdə Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Prezidenti İlham Heydər oğlu Əliyev Qanun imzalamışdır. Qanunda dövlət standartlarına uyğun məktəbəqədər yaşlı uşaqların intellektual, fiziki və mənəvi inkişafına xidmət edən ilkin bilik, bacarıq və vərdişlərin aşılanması, ümumi təhsilə hazırlığın təmin olunması kimi strateji məqsəd qarşıya qoyulur ki, bu da təhsil sistemində yeniliklərə stimul verən Qanun layihəsidir.

Həmçinin hərtərəfli inkişaf etmiş sağlam və intellektual gənc nəslin yetişdirilməsi dövlətimizin strateji hədəflərindəndir. Buna görə də dövlətimiz “Gənclər siyasəti” haqqında Fərman imzalamış və 1977-ci ildən 02 Fevral gününü “Gənclər günü” elan etmişdir. Bu isə dövlətimizin gənclərə güvən günüdür.

Gənc nəslin, ümumiyyətlə, bəşər övladının şüurunun düzgün formalaşması, hərtərəfli inkişafı üçün şifahi xalq ədəbiyyatı nümunələrinin kiçik yaşdan öyrədilməsi mühüm əhəmiyyət kəsb edir. Bu nümunələrlə tanışlıq lap körpə yaşlarından bələkdə ikən ana laylasından qidalanır, daha sonra isə uşaq bağçalarında bir yaşından öyrədilməyə başlayır. Beşikdə körpələrin dinlədikləri və həzin melodiysının təsiri altında uyuduqları zaman laylalar onlarda ilkin, düzgün duyğular oyadır:

Dağlarda lalam sənsən,
Alınmaz qalam sənsən.
Kimim yox, kimsənəm yox,
Ən şirin balam sənsən.

Bala dadı bal dadı,
Bala adam aldadı.
Şirini ha şirindi,
Acısı da bal dadı.

Analar beşik başında söylədikləri layla və oxşamalarda arzu və istəklərini də ifadə edirlər:

Qızılgül butam, lay-lay,
Ətrinə batam, lay-lay.
Balam ərsəyə gələ,
Toyunu tutam, lay-lay.

Badam badamı,
Oğlan adamı,
Qoy elçi gəlsin,
Alsın qadamı.

Özü də cavab verir:

Ay qız adamı,
Sındır badamı,
Elçiyə çay ver,
Alım qadanı.

Laylay dedim ucadan,
Boyun çıxsın bacadan.
Tanrı səni saxlasın,
Çiçəkdən, qızılcadan.

Nazlasın dilim səni,
Böyütsün elim səni.
Meydanda at oynadan,
Bir igid bilim səni.

Dünyada elə bir xalq olarmı ki, ana laylası, ana zümzüməsi, beşik nəğməsi olmamış olsun?! Bir bayatıda bu barədə belə deyilir:

Mən Aşiqəm gülüncə,
Bülbülüncə, gülüncə.
Hər bir kəs öz balasın,
Oxşayır öz dilincə.

Ümumiyyətlə, laylalar, oxşamalar, saymacalar, yanıltmaclar, xalq oyunları, mahnılar, əyləncələr, tapmacalar, zəncirləmələr (düzgülər), atalar sözləri və nağıllar və s. uşaqların, gənclərin hərtərəfli tərbiyəsində, nitqinin inkişafında və dünyagörüşünün formalaşmasında mühüm əhəmiyyət kəsb edir.

Xalq ədəbiyyatının bir sıra janrları məktəbəqədər müəssisələrdə öyrədilir. Bunlardan oyunlar, saymacalar, zəncirləmələr, düzgülər, yanıltmaclar və tapmacalar daha çox məktəbəqədər yaşlarda öyrədilir. Uşaqlıq illərindən yaddaşıma həkk olunmuş oyun, düzgü, tapmaca və saymacalardan aşağıdakı nümunələri diqqətə çatdırmağı önəmli bildiyim üçün qələmə alıram, doğrudur bu nümunələrin əksəriyyəti toplanıb çap olunubdi, amma bəzi xalq deyimləri, sonda yazdığım "Alanla Talanın" nağılı ilk dəfədir ki, qeyd olunur. Həmçinin hər bir regionun özünəməxsus xalq deyim və duyumları olduğu üçün burada verilmiş deyim və duyumlar da Laçın rayonunun Ərikli kəndindən yaddaşıma həkk olunmuş incilərdir. Odur ki, bu xalq incilərini təkrar olsa da, özüməməxsus tərzdə diqqətə çatdırmağı məqbul sayıram.

## Oyunlar

Qeyd: Kollektiv oyun zamanı uşaqlar iki dəstəyə bölünürlər. Dəstənin biri güclü, o biri zəif olmasın deyə iki nəfər uşağı başçı təyin edib, bəy durun halay gələk-deyirdik. İki nəfər bəy dururdular, biz isə gizlində özümüzə şərti ad seçirdik və iki-iki gəlib deyirdik: Halay bəylər, halay! Kimə dərə, kimə təpə? Bəylərdən biri deyirdi, mənə təpə. Təbii ki, dərə də o biri bəyin dəstəsinə qoşulurdu. Beləliklə, uşaqlar bərabər sayda iki dəstəyə bölünüb, oyuna başlayırdıq. Bu oyunlardan yaddaşımda olanlari qələmə alıram: "Mərə" oyunu, "Yoldaş səni kim apardı?", "Bənövşə-bənövşə", "Siçan-pişik", "Dirədöymə", "Mərəköçmə", "Dəsmalaldı qaç" və yaxud "Şoraba-şoraba", "Gizlənpaç" və s.

### "Mərə" oyunu

İki dəsdəyə bölünmüş uşaqlardan iki-iki olmaqla uzaqda nişan qoyulmuş mərəyə kim tez çatıb əl vurub və başçının yanına gələrsə, qələbə qazanardı. Yarışda geri qalan oyunçu sıradan çıxarılardı. Axırda dəstənin biri uduzaraq yox olardı. Oyun beləcə davam etdirilərdi.

### "Yoldaş, səni kim apardı?" oyunu

İki dəstəyə bölünmüş uşaqlar sıra ilə düzülürlər. Axırıncı sırada dayanmış uşaq öndəki sırada dayanmış uşağın birinin arxasından irəli itələyib aparır. Aparılan uşaq geriyə baxmadan intuziya ilə onu aparanın kim olduğunu tanımalıdır. Uşaqlardan biri aparılana ucadan deyir: Yoldaş səni kim aparır? Aparılan aparanı düz deyirsə, onu da götürüb öz dəstəsinin sıralarını artırır. Yox, əgər aparılan aparanı tanıya bilməsə aparan o uşağı aparıb öz dəstəsinə qoşur. Bu qayda ilə oyun davam edir. Axırda dəstənin biri uduzaraq yox olur.

### "Bənövşə-bənövşə" oyunu

Halay gəlməklə iki dəstəyə bölünərək, iki sıraya düzülən uşaqlar əl-ələ tutub biri-birlərinə növbə ilə müraciət edirlər:

----Bənövşə!
---Bəndə düşə!
---Bizdən sizə kim düşə?
---Gülay düşə.

Bu an çağrılmış uşaq cərgədən ayrılıb sürətlə gəlib əl-ələ tutmuş uşaqların cərgəsini yarmalıdır. Əgər cərgənin sırasını yarıb keçsə, özü ilə bir uşaq aparıb öz cərgəsinin sıralarını artırır. Yox əgər, cərgəni yara bilməsə orada qalır. Cərgələrdən biri yox olunca, oyun beləcə davam edir.

### "Siçan-pişik" oyunu

Uşaqlar dairəvi əl-ələ tuturlar. Oyunçulardan biri könüllü olaraq siçan, o biri isə pişik elan olunur.Siçan qaçır, Pişik qovur. Pişik siçanı tutandan sonra uşaqlar yerlərini dəyişməli olurlar. Pişik siçanı, siçan da pişiyi əvəz edir. Beləliklə maraqlı oyun bu qaydada davam edir.

**“Dirədöymə” oyunu**

Bu oyunu bir qayda olaraq oğlanlar oynayırlar. Uşaqlar iki dəstəyə bölünürlər. Boyük bir dairə cızılır və püşk atılır, dəstənin biri çevrənin içinə girir, o biri dəstə isə çöldə qalır. Çevrənin içərisində olan uşaqlar hərəsi ayağının altına bir toqqa qoyur və onu qorumağa çalışır. Çöldə olan uşaqlar toqqanı götürməyə çalışırlar. Dairədəki uşaqlar ayaqla çöldəki uşaqlardan birinin dizdən aşağı ayağına toxunarsa, çöldəki uşaqlar dərhal dirəyə girməli olurlar. Çöldəki oyunçu içəridəkilərdən birini tutub çölə çıxarırsa, onu bir nəfərə həvalə edib saxladır və yiyəsiz qalmış toqqanı götürməyə cəhd edir. İçəridəkilər çöldəkilərdən birinin ayağna ayağı ilə toxunarsa, dairədən azad olurlar. Toqqa çöldəkilərin əlinə keçsə, dairədəkiləri dizdən aşağı şərtilə döyürlər. O vaxta qədər döyürlər ki, dairədə olanlar çöldəkilərdən birinin ayağına ayaqla toxunub çölə çıxsınlar.

“Mərəköçmə” və yaxud
“Köçdüm-köç” oyunu

“Mərəköçmə” oyununu iki nəfər oynayardıq. Hərəmiz üç mərə (yuva) oyardıq, yəni yeri çala kimi (bir ovucun içi kimi) düzəldər, hər yuvaya yeddi daş qoyardıq. Daşları yuvalara qoyarkən yeddi rəqəmini belə sayardıq; cüt iki, cütman iki, təkəm taraz, qumral göz. Yəni birinci ikiyə “cüt iki”, ikinci ikiyə “cütman iki”, üçüncü ikiyə “təkəm taraz” yeddinci daşa isə “qumral göz” deyirdik. Sonralar öyrəndim ki, belə saymaqla sayaçı qoyunları sayarmış, “man” sözü qoyun deməkdir. (azman. dızman, ozman).

“Dəsmalaldı qaç” və yaxud
“Şoraba-şoraba” oyunu

Bir qrup uşaq dairəvi şəkildə çöməltmə oturub, bir uşaq isə əlində dəsmal uşaqların arxa tərəfi ilə çevrə boyunca qaçır və dəsmalı gizlincə bir nəfərin arxasına atır, çevrəni başa vurub ona çatınca o, bilməsə ki, onun arxasına dəsmal atılıbdı, onu şoraba edib, dairənin ortasında oturdurlar. Yox əgər, arxasına dəsmal atılan bilərsə, dəsmalı götürüb qaçan uşağı dəsmalla vurarsa, onda onu şoraba edir. Qaçan uşaq dəsmal arxasına atılan uşağın yerinə özünü çatdırıb oturursa. Xilas olur, dəsmal əlində olan oyunu davam etdirir.

**“Gizlənpaç” oyunu**

Bu oyun o qədər məşhurdur ki, izaha eytiyac yoxdur. Gözünü yum və aç gizlənəni tap, tut, gözyummadan azad ol. Tapdıgını mətəyə çatmamış tutsan, tutduğun səni əvəz edir.

**Barmaqlar**

Baş barmaq--------Bu vurdu,
Başala barmaq----Bu tutdu,
Uzun hacı-----------Bu bişirdi,
Qan turacı-----------Bu yedi,
Balaca bacı----------Vay buna qalmadı.

Düzgü

Bir, iki----bizimki,
Üç, dörd---qapını ört,
Beş, altı----daşaltı,
Yeddi, səkkiz---Firəngiz,
Doqquz, on----qırmızı don.

Üşüdüm ha üşüdüm

Üşüdüm ha üşüdüm,
Dağdan alma daşıdım.
Almacığım aldılar,
Mənə zülüm verdilər.
Dərin quyu qazdılar,
Dərin quyda beş keçi,
Hanı bunun erkəci?!
Hehələdim gəlmədi,
Çiyid tökdüm yemədi.
Çiyid qazanda qaynar,
Qəmbər bucaqda oynar.
Qəmbər deyil, qamışdı,
Beş barmağım gümüşdü.
Gümüşü verdim tata,
Tat mənə darı verdi.

Darını verdim quşa,
Quş mənə qanad verdi.
Qanadlandım uçmağa,
Haqq qapısın açmağa,
Qapıçı qapı toxuyar,
İçində bülbül oxuyar.
Məndən kiçik qardaçım,
Allahın kəlamın oxuyar.

Tap görək

Ya bundadır, ya bunda.
Keçəl qızın kamında,
Allah qoysa, bax binda.

Əkil-Bəkil

Əkil-Bəkil quş idi,
Ağaca qonmuş idi.
Getdim onu tutmağa,
O, məni tutmuş idi,
Meydana salmış idi.
Meydanın ağacları,
Bar götürüb başları.
Çəpər çəkdim, yol açdım,
Qızıl gülə dolaşdım.
Bir dəstə gül dərməmiş,
Anası gəldi, mən qaçdım.

## Saymacalar

İynə-iynə,
Ucu düymə,
Bal ballıca,
Ballı keçi,
Şam ağacı,
Şatır keçi,
Qoz ağacı,
Qotur keçi,
Əmimoğlu,
Bir ağac atdı,
Haldır dedi,
Huldur dedi,
Vur nağara,
Çıx qırağa. Və yaxud:
Əmimoğlu,
Uzun bığlı,
Haldırım dedi,
Huldurum dedi,
Göyə bir ağac atdı.
Qarğı sapı,
Gül budağı,
Motala-motal,
Tərsə motal,
Ellər atar,
Qaymaq tutar.
Ağ quşum ağar çinim,
Göy quşim-göyərçinim.
Vur nağara,
Çıx qırağa.

Hamam, hamam içində,
Xəlbir saman içində,
Dəvə dəlləklik eylər,
Köhnə hamam içində.
Qarışqa şıllaq atdı,
Dəvənin budu batdı,
Hamamçının tası yox,
Baltaçının baltası yox,
Orda bir tazı gördüm,
Onun da xaltası yox.
Ditdili mindim, çay keçdim,
Yabaynan doğa içdim,
Heç belə yalan görməmişdim.

Tapmacalar

Axşam çağında,
Göl qırağında,
Edirdi qur-qur,
Görək nədir bu?

Gəlirdim kənddən,
Səs gəldi bərtdən,
Ağzı sümükdən,
Saqqalı ətdən.

Deyin nə vaxt,
Sular donur,
Yerə ağ-ağ,
Quşlar qonur?

Günəşlə gülər,
Axşam mürgülər.

Daşa dönmüş sudur o,
Tapın görək nədir o?

Nə yeyər, nə içər,
Gecə-gündüz yol gedər.
Mən gedirəm, o qalır.

**Nağıllar**

Nağıllar qədər uşaq həyatında böyük əhəmiyyəti olan folklor nümunəsi tapmaq çətindir. Nağıllar uşaqlarda vətənpərvərlik, dostluq, əməksevərlik, mərdlik, düzlük, ümumiyyətlə, xeyirxahlıq və nəcib keyfiyyətlər aşılayır. Qəddarlığa, paxıllığa, tamahkarlığa, lovğalığa, acgözlüyə, yalançılığa, ikiüzlülüyə və kobudluğa qarşı nifrət hissi oyadır. Uşaq nitqinin inkişafı, zehni qabiliyyətinin güclənməsi baxımından da nağılların çox böyük əhəmiyyəti vardır. Bunun üçündür ki, xalqımızın qabaqcıl və istedadlı ziyalıları yaradıcılığında uşaq nağıllarına böyük üstünlük vermişlər. Məsələn, bu sahədə Abdulla Şaiqin adını xüsusi vurğulamaq lazımdır. Çünki o, "Yaxşı arxa" (1911), "Tülkü və xoruz" (1911), "Şələquyruq" (1920), "Tülkü həccə gedir" (1927), "Eşşək üstündə səyahət" (1934), "Oyunçu bağalar" (1936), "Tıq-tıq xanım" (1942), "Nağıllar" (1945), "Ovçu Məstan" (1945) və "Şeirlər və nağıllar" (1948) kimi əsərlərini uşaqlar üçün yazmışdır.

1912-ci ildə Firudin bəy Köçərli "Balalara hədiyyə" adlı kitabını nəşr etdirmişdir. Məktəbəqədər tərbiyə üzrə Azərbaycanda ilk metodik vəsait A.Tumanovun "Məktəbəqədər tərbiyə nə deməkdir?" adlı kitabı olmuşdur. Bu kitabı 1925-ci ildə Azərbaycan dilinə Cavad Cuvarlı tərcümə etmişdir. 1941-ci ildə isə M.H.Təhmasib və H.Araslı "Azərbaycan nağılları" kitabını nəşr etdirmişlər. 1941-1947-ci illərdə isə "Azərbaycan nağılları" adlı iki kiatab nəşr olunmuşdur.

Kiçik yaşlarımda babamın söylədiyi “Alanla və Talanın” nağılı hələ də yaddaşımdan silinməyib. Odur ki, yazıya alıram və gələcək nəsillər üçün ərməğan edirəm:

**“Alanla Talanın” nağılı**

Biri varmış, biri yoxmuş, keçmiş zamanlarda bir çoban varmış. Bu çoban kəndin yaxınlığında çəmənlikdə qoyun qoyun otaran zaman anası axtarıb onu tapır və deyir ki, oğul, qonşu kənddə toy var, səni də ora dəvət ediblər, sən ora get, sən gəlincən mən qoyunları otararam.

Çoban qonşu kəndə toya gedir. Qayıdanda anasını pis vəziyyətdə, paltarı cırılmış bir durumda olduğunu görüb, soruşur: ___Ana, sənə nə olmuşdur, niyə bu gündəsən?

Anası xəcalət-xəcalət söyləyir:___Oğul, Tanrıdan gizlin olmayan, səndən nə gizlin! Bir bədheybət yad kişi mənə hücum çəkdi və zorla mənə sahib oldu.

Çoban özünü çox qınayır və günahkar sayır. Odur ki, anasını evə göndərir və o gündən xəcalət çəkdiyi üçün evə, elinə, obasına qayıtmır. Qoyunları götürüb kənddən çox-çox uzaqlarda olan Ala dağa üz tutur, az gedir, üz gedir, dərə-təpə düz gedir, nəhayət, Ala dağa yetişir. Orada məskən salır. Bu çoban eldən-obadan, qohum-əqrabadan uzaq məkanda, Ala dağda öz qoyun sürüsünü otarar və güzaranını keçirərmiş. Bu çobanın köməyi, ən etibarlı arxası sayılan iki köpəyi var imiş. Birinin adı Alan, o birinin adı Talan imiş. Bu çoban Çiçəkli dağda (Ala dağa Çiçəkli dağ da deyirmişlər) sürüsünü Alanla Talanın sayəsində günü-gündən artırarmış. Alanla Talanın qorxusundan sürüyə vəhşi heyvanlardan ziyanlıq dəyməzmiş, sürünün həndəvərindən quş da səkə bilməzmiş. Çoban Alanla Talana təlimi tütəklə öyrədərmiş. Onları çağıranda da, harasa buyuranda da tütəklə deyərmiş. Bir gün çoban öz sürüsünü dağın döşünə yayıb şirin-şirin tütək çalıb, bayatı çağırdığı anda kəndlərindən olan qocaman Zaman kişinin yaxınlaşdığını görür. Tez Zaman kişiyə tərəf gedib, onu duz kimi yalayır, tələsik hal-əhval tutmağa başlayır. Zaman kişi nağıl edir ki, oğul, sən kəndimizdən gedən gündən bu günə kimi biz kən əhli olmazın bəlalarına düçar olmuşuq. Birdən-birə anan hamilə oldu. Doqquz aydan sonra yükünü yerə qoydu, bədheybət, təpəsində bir gözü olan qız doğmuşdu. Bu qız saniyələr içərisində sürətlə böyüyürdü. Qız ananın döşünü sorub, qanını içdi və anan öldü. Beləliklə, bədheybət qız bir neçə qadının da döşünü sorub, qanını içib, öldürdü. Uşaq tez bir zamanda uşaqlara qoşulub oynamağa getdi. Kiminin barmağını, kiminin qulağını, daha sonra bütövlükdə uşaqları yeməyə başladı. Kənddə heç kəsin gücü bu bədheybət qıza çatmırdı ki, onu məğlub etsin və yaxud onu öldürsün. Çünki o, tilsimlənmişdi. Onu bir dəfə balta ilə doğrayib oldürdük. Amma yerə tökülən qandan o, yenidən əmələ gəldi. Onu gərək elə öldürəsən ki, bir damcı da olsun qanı yerə düşməyə.

O, kəndin bütün uşaqlarını, cavanlarını yeyib talamış, indi isə qocaları bir-bir yeməyə başlayıbdır. Oğul, nəsilimiz kəsilmək üzrədir, amanın bir günüdür, bəlkə, sən bir əncam edəsən. Gedib deyəsən ki, bacı, insanları yemə, qoyun-quzu, inək-camış verək ye, camaatla işin olmasın, analar ağlar qalmasın!

Çoban Zaman kişinin sözünə əməl edib, kəndə yollanır, gedib evlərinin qapısını döyür. Bir yoğun boğuq səs onu içəri dəvət edir. Çoban içəri daxil olur və görür ki, təpəsində bir gözü olan bədheybət nəhəng bir qız uzanıbdı. Çobanı görən kimi sevinir və onun üzərinə atılmaq istədikdə, çoban tanışlıq verib onun qardaşı olduğunu söyləyir. Bacısını doğru yola çağırıb mal əti, qoyun-keçi əti yeməyi məsləhət görür. Deyir ki, mənim minlərlə qoyunuum var, nə qədər istəsən verərəm, yeyərsən, ta ki insan əti yeməkdən əl çək.

Bədheybət çölə çıxmaq istədiyini bildirir. O, çölə çıxıb qardaşının minib gəldiyi atı yeyib, gəlib deyi:___Qardaş, yəhəri atsız minib gəlmisən?___Hə bacı, ola bilər.

Çoban işin nə yerdə olduğunu anlayır ki, o, atı yeyib, çoban qaça bilməsin. Nəhayət, bədheybət heç nə ilə razılaşmayıb, onu da yeyəcəyini bildirir. Çoban naəlac qalıb qaçmağa başlayır. Bədheybət onu yaxalamasın deyə hündür bir ağaca çıxır. Bədheybət nəhəng olduğundan ağaca dırmaşıb çıxa bilmir. Çoban tütəyini toqqasından çıxarıb yanıqlı-yanıqlı çalır və Alanla Talanı köməyə çağırır. Alanla Talan çoban tütəyinin səsini eçidib özlərini çoban olan yerə yetirirlər.

Bədheybət çobana deyir: __Qardaş, mən bu itlərdən qorxuram, bunları qov getsin!

Çoban deyir: ___Qorxma, mən bir qədər də tütək çalacağam sonra onlar işlərini görüb gedəcəklər. Çoban tütək çalmağa başlayır və tütək vasitəsi ilə deyir ki, Alan, Talan bu bədheybəti elə yeyərsiniz ki, bir damcı qanı da yerə düşməsin.

Çoban necə demişsə, Alanla Talan da bədheybəti eləcə yeyirlər.

Kənd camaatı azadlığa çıxıb, bəladan xilas olurlar. Odur ki, toy-bayram edib çobanı da köçürüb kəndə gətirirlər, yüz yaşayıb, dövran sürürlər. Siz də yüz yaşayın!

Nağılımız burada sona yetdi, ortalıqdan duman çəkilib getdi. Siz yüz yaşayin, mən iki əlli. Göydən üç alma düşdü. Biri mənim, biri özümün, biri də nağıl deyənin. Siz sağ, mən də salamat.

### Ədəbiyyat:

1. Xumara Səlimxanova. Məktəbəqədər tərbiyə müəssisələrində şifahi xalq ədəbiyyatı nümunələrinin öyrədilməsi. Bakı, 1985.
2. Əliyar Qarabağlı. Azərbaycan ədəbiyyatının tədrisi metodikası. Bakı, 1968.
3. Sura Əliyeva. Məktəbəqədər yaşlı uşaqların nitq inkişafında Azərbaycan xalq nağıllarının rolu. Bakı, 1975.

### Teaching folklore patterns in preschools

**Summary**

Teaching folklore patterns in preschools is the key to comprehensive development. Raising a healthy and intellectually advanced young generation is one of the strategic goals of our state. Therefore, the teaching of folklore samples from an early age plays an important role in the development of their speech and shaping their outlook. Therefore, genres of oral folk literature, taking into account age characteristics, should be continuously taught in preschool educational institutions.

### Обучение фольклорным образцам в дошкольных учреждениях

**Резюме**

Обучение фольклорным образцам в дошкольных учреждениях является ключом к всестороннему развитию. Воспитание здорового и интеллектуально развитого молодого поколения является одной из стратегических задач нашего государства. Поэтому обучение фольклорным образцам с раннего возраста играет важную роль в развитии их речи и формировании их мировоззрения. Поэтому жанры устной народной литературы с учетом возрастных особенностей должны постоянно преподаваться в дошкольных образовательных учреждениях.

**Rəyçi: prof. M.Hüseynov**

Göndərilib: 21.02.2020 Qəbul edilib: 28.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/65-68

**Шахаров Ықылас Өскенбайұлы**
Қожа Ахмет Ясауи атындағы Халықаралық қазақ-түрік университеті
Түркология ғылыми-зерттеу институты
e-mail: ykylas.shakharov@ayu.edu.kz

# ӘЛИХАН БӨКЕЙХАН ЖӘНЕ ҚАЗАҚ РУХАНИЯТЫ

***Кілт сөздер:*** *Әлихан Бөкейхан, «Қазақ» газеті, алаш идеясы, ұлттық көзқарас*
***Key words:*** *Alikhan Bokeikhan, «Kazakh» newspaper, Alash's idea, national view*
***Ключевые слова:*** *Алихан Букейхан, газета «Казах», идея Алаш, национальное воззрение*

XIX ғасырдың аяғы мен XX ғасыр басындағы қазақ баспасөзінде жарияланған материалдарға зер салсақ, өз ұлтының бітім-болмысын жетік білетін қазақ зиялылары заман құбылыстарын қалам ұшына іліктіріп, шығармаларына арқау еткенде қоғамның беталысын шынайы бейнелеуге тырысты. Яғни, саяси-қоғамдық дамудың шарықтау шегіне жетіп тұрған кезеңде өмір сүріп отырғандықтан, Алаш ардақтыларының шығармашылық еңбегін туған халқының азаттық жолында ұлттық мүдделерімен ұштастыра білгені маңызды болды. Кемел біліммен толысып, шұрайлы тілге нәр берген, қазақтың ертеңі қалай боларына сол арқылы ой жүгірткен үлкен әдеби толқын осы тұста қалыптасты. «Қазақ» газетінің негізгі авторлары, әдеби сынның ұлттық әдебиеттің жетекші бір жанрына айналуына қалам қайратымен зор үлес қосқан Алаш басшылары Ә.Бөкейханов, А.Байтұрсынов, М.Дулатов және басқа да көрнекті ұлт зиялылары «өздерінің әдеби шығармаларының беттерінде демократиялық мәндегі мәселелерді көтерді. XIX ғасырда шыққан алғашқы қазақ газеттерінде әдеби сын тұрғысындағы мақалалар жарияланған жоқ, әдебиетке қысқаша шолу, шағын пікірсайыс, библиографиялық анықтама сипатындағы сын белгісі бар материалдар ғана бой көрсетті. Соның өзінде бұл мақалалар XX ғасыр басында қазақ руханиятының өркендеуіне жол ашты. Ә.Бөкейхановтың «Қазақ» газетінде басылған сын мақалаларында мол әдеби, тарихи – этнографиялық мәліметтер бар болды. Әдебиеттегі маңызды еңбектерінің бірі - Шәкәрім Құдайбердиевтің 1912 жылы жарық көрген кітабы «Қалқаман-Мамыр»[1] туралы, Шәкәрім Құдайбердиевтің «Түрік, қырғыз, қазақ һәм хандар шежіресі» [2] атты кітабына сын мақала арнайды. Бұл мақалада қазақ елінің тарихы, шыққан тегі туралы құнды деректер молшылық. 1914 жылы Орынборда «Үміт» баспасынан жарық көрген «Қарақыпшақ Қобыланды батыр» [3] кітабына да сын мақаласын жариялайды. Осы мақалада Ә.Бөкейханов Абай өлеңдеріне, Шәкәрім Құдайбердиевтің «Шежіресіне» Шоқан Уалихановтың ғылыми еңбектеріне сілтеме жасай отырып, жырдың көркемдігі туралы, тарихы туралы көптеген құнды мәліметтер келтіреді.

Зерттушілердің пайымдауынша Ә.Бөкейхановтың әртүрлі жанрда, әр түрлі салада мыңға жуық ғылыми мақалалары бар екен. Ғалымның мақалалары 1917 жылғы Ақпан төңкерісіне дейін 30-ға жуық қазақ – орыс басылымдарында және одан кейінгі 1927 жылға дейін 50-ден астам қазақ және орыс газет – журналдарында жарияланып тұрған. Мақалалары үнемі өз есімімен берілмей «Қыр ұғлы», «Қыр баласы», «Ғали хан», «Әлихан», «Ғ.Б», «Ә.Б», «Арыс ұлы», «Түрік баласы», «Қалмақбай» [4] т.б. деген бүркеншік есімдермен беріліп отырған. Аталған газеттердің ішінде Әлихан Бөкейханов халқымыздың рухани байлығы халық ауыз әдебиет үлгілерін зерттеуге үлес қосқан материалдары да жарық көреді. Ол қазақ әдебиетінің көрнекті өкілдерін жақсы білген, әсіресе, қазақ әдебиетінің тарихында өшпес із қалдырған ақын-ағартушы Абай Құнанбаевты аса жоғары бағалап, алғашқы зерттеуші ретінде баспасөзде құнды пікір білдірді. Ә.Бөкейхановты абайтанудың негізін салушы деп айтуға болады. Өйткені, ең алғаш Абайдың әдеби шығармашылығына зерттеу жүргізіп, оның поэтикалық шеберлігіне көңіл аударды. «Абай (Ибраһим) Құнанбаев» деп аталатын некролог-мақаласында ең алғаш Европа ақындарымен Абай поэзиясы салыстырылып, баға берілді: «Абай... поэтикасы асқан күшті және қырғыз халқының мақтанышы. Әлі Абай сияқты, халықтың шығармашылығын көтерген ақын болған жоқ. Оның жылдың төрт мезгіліне (қыс, жаз, күз, көктем) арналған ғажайып өлеңдері Европаның атақты ақындарына қызмет көрсеткен болар еді» [5,172]. Әдебиеттің халқымыздың санасы мен мәдениетін көтерудегі құндылығын түсіне отырып, сол кездегі әдебиет және қазақ интеллигенциясының өкілдері А.Байтұрсынов, М.Дулатов, Ш.Құдайбердіұлы, М.Жұмабаев, Ж.Ақбаев, С.Торайғыров, Ж.Аймауытов, С.Сейфуллин, І.Жансүгіров, Ғ.Карашев, Жиханша және Халел Досмұхамедовтерді біріктіру үшін белсенді әрекеттер жасайды. Сол кезеңнің фольклористері мен әдебиет зерттеушілері бірауыздан қазақ халық поэтикалық өнерінің бейнелілігі

мен лиризмін, мазмұндылығы мен жоғары сапалылығын атап көрсеткен. Сондықтан, Әлихан Бөкейханов А.Байтұрсынов, Ә.Диваев, М.Көпеевтермен қатар ауыз әдебиеті үлгілерін жинап, жариялауға көп еңбек сіңірді. Оның алғысөздері мен пікірлері жазылған бірнеше кітаптар сақталып қалған. Сыншының бұл пікірлері әдеби сынның дәйектеме-сын жанрын жандандыруға үлес қосты. Белгілі ғалым Александр Беннигсен өзінің 1964 жылы Сорбоннада шыққан «Национальное движение среди мусульман России» атты кітабында Әлихан Бөкейхановтың әдеби шығармашылығына мынандай мінездеме берді: «Оның әдеби қызметі таң қаларлық: экономист, тарихшы, фольклорист, ол «Иртыш», «Голос степей», «Фикир», «Дала уалаяты», «Омич», «Сибирские вопросы», «Қазақ», «Айқап» сияқты бірнеше орыс, қазақ, татар басылымдарымен жұмыс істеді. Оның «Қыр баласы» атты псевдониммен жазылған қазақ эпосы туралы тамаша еңбектері оның отандастарының ұлттық сезімін дамытуға зор үлес қосты».

Ә.Бөкейхановтың «Қара Қыпшақ Қобыланды» сын-мақаласы іштей жеті бөлімнен тұрады. Мақаланың эпиграфы Абайдың «Өлең- сөздің патшасы, сөз сарасы» атты өлеңімен басталады. Оқиға баяндау тәсілімен беріліп, жырдағы Көклан кемпір, Қобыланды, Қараман, Көбікті бейнелері т.б. қысқаша талдауға түседі. Алаш көсемі Әлихан Бөкейхановтың туғанына 145 жыл толуына арналған ғылыми-тәжірибелік халықаралық конференцияда Әлихантанушы Дихан Қамзабекұлы өз баяндамасында[6] Ә.Бөкейхановтың әдебиет туралы әзірше табылған алғашқы еңбегінің бірі – “Қазақ жыры “Қобыландыдағы” әйелдер” атты зерттеу мақаласы екенін ерекше атап айтады. Ол 1899 жылы “Туркестанские ведомости” (Ташкент) газетінің үш нөмірінде жарияланған. Бұл еңбегінің мақсатын автор былай көрсетеді: “Екі сенім тоғысында мәжуси қазақ әйелі кім еді, ол қайтіп мұсылман болды, әйелге деген мұсылман қазақ пен мәжуси қазақтардың көзқарастары қалай еді?» – деген қызықты сұраққа “Қобыландыдан” артық ешқандай жыр жауап бере алмайды. …Біз осыны қарастыруды жөн көрдік”. 1914 жылы Қазанда басылған «Қара қыпшақ Қобыланды» (Махмұд-Сұлтан Тұяқбаев) жыры жөніндегі сын мақаласында ол жыршының өз тарапынан батырлық жырға Қобыланды заманында болмаған, кейінгі кезеңде пайда болған сөздерді орынсыз қосқанын, қолданыстағы емлені сақтамағанын және жер-су, кісі аттарының кітап соңында әліпбилік тәртіппен берілмегендігін сынға алады. «Солдат, сухар, түйме, медаль, бал, шай, алтыатар – Қобыланды заманынан көп бері пайда болған нәрселер. Мұның бәрі бейшара жыршының өзі қосып, жырдың көркем түрін бұзған…. Жоғарыда жазылған беттерде осындай қозы қоспай, ескі заман салтын жаңа заманға аударған сөздер толып жатыр-деп, жырдағы өрескел кемшіліктерді атап көрсетеді. «Қобыландыны» қайта басқанда мұндағы жер, су һәм кісі аттары әліппе тәртібімен кітаптың аяғына басылса һәм шыққанда кітаптың қайсы бетінде қайсы сөз бар екені көрсетілсе, біріншіден – бұл кітап тәрбиелі болар еді» [3] деп жазады.

Ә.Бөкейханов Қара Қыпшақ Қобыланды батыр бейнесінің «Едіге» жыры ішінде де кездесетінін еске сала отырып, Шәкәрім Құдайбердиевтің «Түрік, қырғыз, қазақ һәм хандар» шежіресі мен Ш.Уәлиханов еңбегі негізінде аталған батырдың XIV ғасырда өмір сүргенін дәлелдеуге тырысады: «...Бұл Қобыландының ісі XIV ғасыр ортасы болуға лайық (Қара: Шәкәрім шежіресі, 78б.). Тоқтамысқа болысқан Литва князь Витовты Воркесла өзені бойында (бұл Полтава губерниясында Днепр саласы) Ақсақ Темірдің қолбасшысы Едіге алған. Бұл соғыс 1399-шы жылы болған (Қара: Шоқан кітабы, 71б.). Бұған қарағанда Едіге Тоқтамыстан кеткен соң Ақсақ Темірге қолбасы болған болса керек. Мұнан көрінеді: Қобыландының Тоқтамыс, Едігелермен замандас болғаны»[3],-делінген. Міне, бұдан біз ғалым Ә.Бөкейхановтың фольклорға тарихи дерек көзі ретінде қарағанын байқаймыз.

Сондай-ақ сыншы еңбектерінде «Роман деген не?»[7] деген тақырыпта проблемалық мәселе көтеріп, қазақ романының тұңғышы аталған М.Дулатұлының «Бақытсыз Жамал» романына[7,75], Ж.Аймауытұлының «Қартқожа» романдарына сын мақала жазады. Роман көпке арналған кітап екенін; Һәрқайсымызға тиісті, міндетті романды тесе қарап, телміре оқып, мінез-құлқымызды түзеп, романнан халіміз жеткенше тәрбие алу керек екенін ескертеді.

Жүсіпбектің үш бөлімді романы «Қартқожа» кітабына жазылған сын мақаласында тұрмыстың көп пернелері басылып, көп құбылыстары суреттелетінін айтады. Романда шынында да сол кезеңдегі қазақтың езгіге түскен тағдыры, «қазақ басына қара күн туып, қазақ шаруасы қырылған 1916 жыл, қиянгешілік соғысы, февраль өзгерісі қазақтың Ұлт Үкіметі (Алаш Орда) «осы тұста құрылған «кеңес үкіметі, Кеңестік Қазақстан» барлығы да осы кітапта, қарапайым қазақ өмірімен, тағдырымен шендестіріліп ашық жазылғанын баян етеді. Яғни, көшпенді мал шаруашылығын кәсіп еткен жұртты отырықшылыққа бейімдеу, дала қазағын саясат құрбаны ету сынды – нәтижесі ұлттық қасіретке алып келген реформалардың шынайы бет-бейнесін ашық суреттейді. Бұл кітаптың жалпы мазмұнына

арналған алғысөзі еді. Шығарма тілімен шебер суреттелген елдегі саяси жағдайды сыншы былай толғайды: «Бүгінге дейін біздің ең өзгерісшіл тап жігін айырам деуші жолдастарымыздай, білімінің кемдігінен я ұлтшылдық бойына сіңіп қалғандықтан қазақ елінің тап жігін айқындап алып, суреттей алған жоқ еді. Жүсіпбек дөп сермеді, пернелі, әдемі сөз: тап жігін әдемі суреттеді. Бұл ретте де «Қартқожа» бірінші роман» деп тұжырым айтады. Бұдан кейін сыншы «Қартқожа» романының құрылымдық ерекшелігі мен жазушы шеберлігіне тоқталады. «Кітаптағы әрбір буындарға қойылған «ат» жұмбақ ретінде, яғни, романдағы бөлімдердің тақырыбын жазушы Жүсіпбек жақсы таңдап қоя білген. Бұл ерекшелікті Әлихан Бөкейханов орыстың данышпан жазушысы Достоевскийден байқағанын айтады. «Мәселен, Достоевский: тағы бір жорғалаған адамшылық «мұжықтай шулап келе берді» – деп шығармасына ат қоятын» деп келтіреді. Ал, Аймауытұлы романдағы бөлімдерге оқырман назарын аударатын, толық түйіні бар «Уайым күшейді», «Хабар берді», «Бұлт қоюланды», «Қош, аман бол!», «Мәңгі аңсау» деген сияқты әңгімелеріне жұмбақ ат қойып отырады» [8] - деп, автордың қаламгерлік әдіс-айласының өз кезегінде оқушыға өтімді екенін жазады Ә.Бөкейханов.

Әлихантанушы Сұлтан Хан Аққұлұлы: Алаш көсемінің өз басы газет-журналға мақала, қазақ оқу мекемелерінің оқытушы-оқушыларына арналған кітаптар мен оқу құралдарын және оқыту әдістемелерін жазып, халқына қызмет етудің теңдессіз үлгі-өнегесін көрсетеді. Өзі алыс Мәскеуде тұрса да, оның Қыр баласы, сирек те болса Ғ.Б. немесе V деген таңбамен қол қойған мақаласы, қайсыбір көркем шығармаға не әдеби және т.б. аудармаға жазған пікірі, зерттеуі, ашық хаты және т.б. туындысы жарық көрмеген мерзімді қазақ баспасөзін ұшырату қиын еді[9],-деген пікірі ойымызды нақтылай түседі.

Ә.Бөкейханов баспадағы әдебиетшілік қызметін 1923 жылы қазақ тілінде мектеп оқушыларына арналған «Темірқазық» журналын шығарудан бастады десе қате болмайды. Сол кезеңдегі басылымдарда Әлихан Бөкейхановтың сынның шағын жанрлары – ашық хат, жауап хаттары, әдеби рецензиялары үздіксіз жарияланып, ұлт жастарына ой салып отырды. Соның бірі 1923 жылы Мәскеуден Дінше Әбілұлына жазған шағын хатында: «Бауырым Дінше! Хатыңды алдым. Қуанып қалдым. «Шолпанға», «Темірқазыққа» неге мақала жазбайсың? Сендей білімі бар жазбаса, кім жазады? Не балаларға сабақ беріп, не журналға, газетке мақала жазып Алашқа қызмет қылмасақ, не қазақ тілінде кітап жазбасақ, өзге жол бізге бөгеулі ғой!" – деп, кейігендей болып ой тастауы жай болмаса керек. «Темірқазық» журналының Кіндік баспадан шыққан алғашқы үш санын да Қыр баласы өз материалдарымен толтырды. Оның ішінде Әубәкір (Әбубәкір) Диваев жазып алып 1922 жылы Ташкенттен басып шығарған «Мырза Едіге», «Батыр Бекет» жырларына жазған пікірлері, В.Короленко мен Н.Маркстің балаларға арналған әңгімелерінің аудармалары, «Луи Пастер», «Білім күші», «Хахас» атты мақалалары және т.б. Алайда, Алаш көсемінің «Темірқазығы» 2-3 сандары қосылып шыққан соң, әзірге беймәлім себеппен тоқтатылады. Мәскеуде журнал шығаруын қанағат тұтпай, елағасы Ташкенттен шығатын «Ақ жол» газеті мен оған қосымша ретінде шыға бастаған «Сәуле» журналына 1923 жылы 10-даған мақаласы мен әдеби аудармасын жариялайды. Бірақ Қыр баласының бұл еңбегі сол кездегі солақай сыншылдардың назарын аудармай қоймайды. Бұл жолы Ә.Бөкейханов «шала белсенді» қазақ коммунистерінің алдында «Еңбекші қазақ» газетіне мақала жазғаны үшін «айыпты» болды. А.Байтұрсынұлы 1925 жылдың 1 маусымында Әлиханға жазған хатында «біздің коммунистер Мәскеу коммунистері секілді жартыкеш емес, «нағыз 96 пробалы»- деп жазса, оған 23 маусымда жазған жауабында Елағасы Ленинге еліктеген С.Меңдешұлы, С.Сейфуллин сынды қазақ коммунистерін Юпитер болуды аңсаған бұқаға теңейді. Міне сол «бұқалардың» жазған арыз-шағымдарының нәтижесінде «Еңбекші қазақ» газеті беттерінен 1925 жылдан кейін Қыр баласы, Ғ.Б. немесе тіпті V деп қол қойылған бірлі-жарым мақала-материалды ұшырату өте қиын. С.Меңдешұлының шағымы Кремльге 1925 жылдың мамырында түскен болса, Қыр баласының «Еңбекші қазақ» газетінен әзірше табылған соңғы мақаласы – 1925 жылғы 14 мамыр санында шықса, V деп қол қойылған «Әдебиет дүниесінде» атты мақала – 1926 жылдың 7 қазанында басылды-делінген.

Әлихан Бөйкейханұлы «қыр баласы» деген бүркеншік есіммен «Жердің жаратылысы» атты орысшадан қазақшаға аударылған кітапқа сын жазды. Тәржімалаған жазушы Мұхтар Әуезов. Мақала басы кітаптың 1924 жылы Ташкенттегі «Түркістан мемлекет» баспасынан 83 бет болып жарық көргенін, бағасы 40 тиын екенін баян етуден басталады. Аталған кітап Ресей ғалымдарының жер қойнаулары жайындағы зерттеулері мен тұжырымдамаларын негіз етеді. Сондықтан, Әлихан Бөкейханов әуелі аударылған дүниенің маңыздылығына, тәржіма тіліне, аудармашы шеберлігіне кеңінен тоқталады. Сыни мақалада әуелі кітаптың қазақ жұртына берері, пайдасы мен зияны сөз болады. «Қазақшаға аударған жолдас орысқа еріп кетіп, Қырымда Аю тауды жазған. Бұл арада Алтай, Тарбағатай оқушы қазаққа әсер беретіндей ұғымды болар еді» – дейді «қыр баласы».

Ойымызды түйіндей келе айтарымыз, Қыр баласының әдеби сын мақалаларынан өзге әлі күрделі ізденісті күтіп тұрған әдеби мол мұрасы бар. Ә.Бөкейханов жас кезінен ауыз әдебиеті мұраларымен сусындап қана қоймай, жүйелі түрде орыс классиктерін Пушкинді, Лермонтовты, Крыловты, Чеховты, Мамин-Сибирякты, Достоевскийді, Короленконы оқумен болған. Әсіресе, алпыс жыл бойғы шығармашылық еңбегінің нәтижесінде зор әдеби мұра: романдар, оншақты повестер, жүздеген әңгімелер, пьесалар, өнер жайлы трактаттар, көптеген халықтық және әдеби сын мақалалар, мыңдаған хаттар, томдық күнделіктер қалдырған Л.Н.Толстойды өте зор құрмет тұтты. Л.Н.Толстойдың кітап беттерінде орыс өмірінің бір тұтас дәуірі көрсетілгендіктен, ол оны Әлем мәдениетінің жетістігі деп санап, «Кавказ тұтқыны», «Жеті қарақшы» және «Жұмыртқадай бидай» туындыларын қазақ тіліне аударады. Ә. Бөкейханов көптеген жылдар бойы сібірлік «Дон-Кихот» - Батыс Сібірлік белгілі жазушы Антон Семенович Сорокинмен жолдас болды. Орыс әдебиетімен қатар Батыс Еуропаның, Үндінің, Қырым халқының, антикалық дәуір әдебиет үлгілерінің мәдениеті мен әдебиетінен жақсы хабардар болды. Оның мақалаларымен зерттеулерінде атақты ағылшын жазушылары - Чарльз Диккенс, Вальтер Скотт, Уильям Теккерей, сонымен қатар, француздық Ги де Мопассан есімдері жиі кездеседі. Алаш көсемінің 1925-1928 жылдар аралығындағы еңбектерінен ежелгі грек әдебиетінің өкілі Эзоп пен үнді мысалдарын қазақшалап басып шығарған «Жетпіс жеті мысал» жинағын, Д.Мамин-Сибиряктың «Баймақан», В.Короленконың «Жұмбақ қыз», «Түндегі от» және «Өзі» әңгімелерінің жеке-жеке жинақтарын, ауыз әдебиетінің А.Байтұрсынұлы жазып алған үлгілерін өңдеп, алғысөзін жазып шығарған «Жиырма үш жоқтау» кітабын, орта мектептерге арналған «Дүниенің құрылысы» және «Жердің қысқаша тарихы» оқулықтарын атап өтуге болады. Сондықтан Әлихан Бөкейхановтың әдеби мол мұрасы арнайы жанрға жүйеленіп зерттелуі тиіс.

**Әдебиеттер:**

1. «Қазақ», №121, 1915 жыл
2. «Қазақ», №12, 1913 жыл
3. «Қазақ», №126-129, 1915 жыл
4. Қамзабекұлы Д. Руханият [Мәтін] : Саяси қуғын-сүргін құрбандары туралы мақалалар мен зерттеулер / Қамзабекұлы Д. - Алматы : Білім, 1997. - 272 б.
5. Бөкейханов Ә. Таңдамалы - Алматы, 1995, 310-бет
6. Қамзабекұлы Д. Әлихан Бөкейхан және ұлт руханияты. Abai.kz
7. Бөкейхан Ә. Шығармаларының толық жинағы [Мәтін] VI том. - Астана : Сарыарка, 2013. - 520 б.
8. Бөкейханов Ә. Кітап сыны (Картқожа). //«Еңбекші қазақ» газеті. 4 қараша 1926 ж.
9. Сұлтан Хан Аққұлұлы. Алаш көсемін Мәскеуде коммуналдық пәтер мен әдеби қызмет тосып алды. Abai.kz

**Alikhan Bukeyhan and Kazakh Spirituality**
**Summary**

This article will be devoted to the work of the outstanding Kazakh intellectual A. Bokeikhan, who sincerely reflected the evolution of society in the late XIX and early XX centuries. Literary critical articles were not published in the first Kazakh newspaper of the 19th century; Only were published works such as introduction to literature, small debates, and bibliographies. However, these articles were able to influence the promotion of Kazakh spirituality in the early 20th century. Serving the national society, the Kazakh newspaper provides examples of historical and ethnographic data and the meaning of valuable sources.

**Алихан Букейхан и казахская духовность**
**Резюме**

Эта статья посвящена творчеству выдающегося казахского интеллектуала А.Бокеихана. Писатель искренне и точно отразил эволюцию общества конца XIX и начало XX века. Литературные критические статьи не были опубликованы в первых казахских газетах 19-го века. Печатались такие работы как введение в литературу, небольшие дебаты и библиографии. Тем не менее, эти статьи смогли повлиять на продвижение казахской духовности в начале 20-го века. Служившая национальному обществу, в газете «Казах», приводится примеры историко-этнографических данных и значения ценных источников.

DOI: 10.36719/AEM/2007-2020/51/69-71

**Günel Ədalət qızı Allahverdiyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
allahverdi.gunel@bk.ru

# DAUN SİNDROMLU UŞAQLAR VƏ ONLARIN PEDAQOJİ-PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *əqli gerilik, stereotip, xromosom, həssaslıq, tonus*
***Key words:*** *mental retardation, stereotype, chromosome, sensitivity, tonus*
***Ключевые слова:*** *интеллектуальное отставание, стереотипный, хромосома, чувствительность, тон*

Daun sindromu əqli gerilik diaqnozu ilə assosiasiya olunan və xromosomların miqdar və quruluşundakı pozuntulardan asılı olan əlillikdir.

Daun sindromu elmə 1866-cı ildən məlumdur. İngilis həkimi Lanqdan Daun xarakter xüsusiyyəti olan bu xəstəliyi bir qız uşağında müşahidə edib və onu "monqolizm" adlandırıb. Ancaq asiyalı alimlərin xəstəliyin "monqolizm" adlandırılmasına münasibətindən sonra bu xəstəlik onu kəşf edən alimin şərəfinə "Daun sindromu" adını alıb. Bu uşaqlar bir-birlərinə oxşayır, stereotipləri eyni olur. Yəni onlarda boy qısa olur, əqli inkişafdan geri qalır, kəlləsi kiçik və yumru olub üz nahiyyəsində yastılaşır. Yanaqlar uzun yastılaşmış fonunda bir qədər üzə çıxır, gözləri uzunsov və kiçik olur, göz yarığı çəp, göz bucağında dəri büküşlü, ağzı yarıaçıq, dili böyük, qarnı köpmüş, dişləri seyrək, əzələləri və oynaqları zəif inkişaf etmiş olur. Yəni monqoloid irqinə mənsub şəxslərə bənzəyirlər. "Monqolizm" adı da bu səbəbdən işlədilib.

Lakin Lanqdon Daun bu sindromun yaranma səbəbini elmə açıq-aydın izah etməmişdir. Bundan təxminən bir yüz il sonra, yəni 1959-cu ildə Fransız alimi Jerome Lejeune bu sindromun yaranmasında əsas faktorun insan hüceyrələrində əlavə bir xromosomun olması ilə əlaqələndirmişdir.

Daun əsasən irsi xəstəlikdir və xəstəlik uşağa yalnız anadan keçir. Bu sindroma daha çox 35 yaşından sonra hamilə qalan və irsi genetik xromosom dəyişiklikləri olan qadınların körpələrində rast gəlinir. 30 yaşından cavan ananın göstəricisi 1:600 nisbətidir, 34 yaşından sonra Daun sindromlu uşaqların doğulması hər il iki dəfə artır.

İnsanlarda 46 xromosom var. Xromosomların 23-ü atadan, 23-ü isə anadan övlada keçir. Daun sindromlu şəxslərdə isə 47 xromosom olur. Daun sindromu 21-ci xromosomlarda baş verən anomaliya zamanı meydana gəlir.

Daun sindromu yeganə xəstəlikdir ki, hailəliyin 3-cü ayında aparılan müxtəlif testlərlə diaqnoz qoymaq olur. İkili test və ya ikili siikrininq adlanan test üsulu ilə ana bətnindəki döldə xromosom pozğunluqlarının olub-olmadığını müəyyən etmək olur. Bu müayinə iki yolla həyata keçir:

1. Ultrasəs müayinəsi (USM);
2. Qanın analizi.

USM zamanı xüsusi olaraq dölün yaxalıq məsafəsinin qalınlığı yoxlanılır (11-14-cü həftələrdə). Bütün körpələrin yaxalıq nahiyəsində mayenin toplanması müşahidə olunur, amma Daun sindromunda bu sahədə daha çox maye yığılır. Bu səbəbdən də, Daun sindromu ehtimalı yüksək olan döllərdə boyun arxasındakı yaxalıq məsafəsinin qalınlığı daha çox olur.

Dölün yaxalıq məsafəsinin qalınlığı ilə yanaşı dölün ümumi ölçüləri, ananın yaşı və bədən çəkisi, hazırda və əvvəllər siqaret çəkib-çəkməməsi kimi bir sıra digər göstəricilər xüsusi kompüter proqramına daxil edilərək körpədə Daun sindromu riski müəyyən edilir.

Bəzən dölün yaxalıq məsafəsinin dəqiq ölçülməsi çətinləşir. Səbəbi isə USM zamanı dölün vəziyyəti və ya hamilə qadının artıq çəkisi ola bilər.

Qan analizləri (zərdabın biokimyəvi analizləri) aparıldıqda ananın qanında hamiləliklə bağlı müşahidə olunan hormon və zülalların səviyyəsi ölçülür. Onlar cift və ya inkişafda olan döl tərəfindən istehsal olunur. Döldə Daun sindromunun olması həmin hormon və zülalın (xorion qonadotropini və hamiləliklə bağlı zərdab zülalı) səviyyəsinə təsir edir.

Yenə də qan analizlərinin nəticələri, dölün ölçüləri, ananın yaşı və bədən çəkisi, siqaret çəkib-çəkməməsinə əsaslanaraq döldə Daun sindromu riskini təyin etmək üçün xüsusi kompüter proqramından istifadə olunur.

Daun sindromunun üç əsas növü var: Trisonomiya, Mozaik və Translasiya. Trisonomiya 21-ci cüt xromosomda anomaliyaya səbəb olur. Daun sindromlu uşaqların 90 %- ni təşkil edir.

Mozaik forma nadir hallarda müşhidə olunur, təxminən Daun sindromlu uşaqların 2%-də. Bu formada hüceyrələrin bir hissəsi adi xromosom dəstinə malikdir və bəziləri dəyişir, yəni 21-ci cütdə əlavə xromosom olur. Belə uşaqların müalicəsi Klassik daun sindromuna nisbətən bir az asand keçir.

Translokasiya forması Daun sindromlu uşaqların təxminən 4%- də müşahidə olunur. Bu formada əlavə xromosom 21-dən 15-ə ya da digər xromosom cütlərinə köçürülür. Bu variantda xəstənin karyotipi 46 xromosomdur.

Daun sindromlu körpələrin fərqli bir üz görünüşləri vardır. Başları kiçik, başlarının arxası yastı, boynu qısa və genişdir. Burun kökü yastı, qulaqlar başda normaldan aşağı bir səviyyədə durur və gözlər bir-birindən ayrı və çəkik görünür. Dil, normal danışmağı önləyəcək qədər genişlənmişdir. Bu körpələrin tonusları (bədən gərginliyi) aşağıdır. Geniş əl, qısa və kök barmaq və sıxlıqla ovuc içlərindən birində və ya ikisində “Simian xətti” deyilən tək bir xətt vardır. Əllərin sərçə barmaqları ümumiyyətlə içə doğru qıvrımlıdır.

Bu uşaqların 60 faizində eşitmə ilə bağlı problemlər olur. Bu xəstələrdə görmə qüsurları da müşahidə olunur. Skletin normal inkişafı pozulduğu üçün Daun sindromlu körpələr oturmağı və yeriməyi gec öyrənir. Onların boyu nisbətən alçaq olur. Normal insanların 3-4 ilə göstərdiyi inkişafı onlar 9-10 ilə göstərirlər. İmmun sistemi zəif olur, xəstəliklərə daha tez tutulur, xüsusi ilə də bədxassəli şişlərə tutulma riski çox böyükdür. Beynin ümumi inkişafdan qalması və beyinciyin zəif inkişaf eləməsi əqli cəhətdən geriliyə səbəb olur. Əqli gerilik bu xəstələrin hamısı üçün xarakterikdir. Əqli gerilik iki formada olur: ideateya və imuselis. İmuselis bu xəstəliyin daha yüngülüdür. Ən ağır forması isə ideateyadır.

Bu cür uşaqların yadda saxlama qabiliyyəti zəifdir, diqqətləri dağınıqdır, nitqləri təmiz deyil, amma güclü təqlid bacarıqları var. Xromosom çoxluğu uşağın inkişafına mənfi təsir edir. Evdə yaxşı təlim keçən daunlar özləri geyinib soyuna bilər, yemək və su içə bilər, öz gigiyenik ehtiyaclarını təmin edə bilərlər. Bəzi daunlar hətta məktəbə və universitetə gedə biləcək təlimə yiyələnə bilirlər. Daun sindromlu uşaqların ehtiyacları digər uşaqların ehtiyaclarından fərqli deyil. Onlar da ana, ata və qardaşları ilə birlikdə olmaqdan xoşbəxt olurlar. Ətraflarını kəşf etmək, oynamaq, öyrənmək, gülmək istəyirlər. Daun sindromlu bir uşağın mümkün olduğu qədər ictimai bir mühitdə böyüdülməsi inkişafı üçün son dərəcə faydalıdır.

Daun sindromuolan uşaqların və yeniyetmələrin nitq inkişafında müəyyən gecikmələr nəzərə çarpır. Onlarda nitqi qavrama adətən gecikir, uşaqların əksəriyyəti ilk sözlərini gec deyirlər. Onların lüğət ehtiyatları digər normal yaşıdlarından gec formalaşır və sözləri aydın ifadə etməkdə çətinlik çəkirlər. Daun sindromlu gənclərin nitqinin zəif inkişaf etməsi onların öz həmyaşıdları ilə anlaşmasını çətinləşdirir. Bu daha çox kommunikasiyada hiss olunur.

Daun sindromlu uşaqlarda nitq qüsurlarının yaranma səbəblərinə-yüksək, dar damaq, dişlərin inkişaf xüsusiyyətləri: vaxtından gec çıxması, diş sırasının anomalyası, dişlərin bəzisinin inkişaf etməməsi və ya bəzilərinin çox inkişaf etməsi, üst çənənin dar, kiçik olması, açıq ağız və alt dişlərlə üst dişlərin taraz qalmaması və s. aiddir. Daun sindromlu uşaqlarda, əsasən, dizartriya, alaliya, kəkələmə və s. nitq qüsurları müşahidə olunur.

Daun sindromlu uşaqları daha da sevimli edən yönləri - şən və sevimlidirlər, dürüstdürlər, çox həssasdırlar, səliqəlidirlər, pintiliyi sevməzlər, qaydalara riayət edirlər, yalan danışa bilmirlər, eqoist deyillər, qarşılıq gözləmədən sevərlər, təbiəti, insanları çox sevirlər, incəsənətə xüsusi qabiliyyətləri vardır, kin saxlamırlar, təqlid etmək kimi istedadlari vardır.

Müasir dövrdə bu patologiyanın tam müalicəsi mümkün deyil. Buna görə də əsas diqqət Daun sindromlu uşağın tərbiyəsinə, təhsilinə və onun sosial mühitə uyğunlaşma işinə yönəldilməlidir. Uşağın hansı tədris müəssisəsində: adi və ya ümumi proqram üzrə təlim keçən xüsusi məktəbdə və yaxud fərdi şəkildə təhsil alması onun inkişafındakı ləngimənin nə dərəcədə ifadə edilməsindən asılı olaraq aparılır.

Daun sindromlu uşaqlar xüsusi bir təlimlə normal fərd kimi cəmiyyətə qatılıb peşə sahibi ola bilərlər. Planlı və peşakar bir şəkildə köməyə ehtiyac duyarlar. Körpənin 1 yaşından etibarən həm peşəkar qayğı, həm də ata ananın qayğısı ilə böyüdülməsi məqsədiylə reabilitasiya mərkəzlərinə müraciət edilmələri məsləhət edilir. Rehabilitasiyanın gecikməsi uşağın inkişaf və adaptasiya prosesini çətinləşdirir. Uşaqlar tamamilə diqqətsiz olur, yaddaş zəifliyi, göz kontaktı olmur, psixomotor inkişaf çox geri olur, davranış zəif olur. Belə uşaqlarla hər şeyi sıfırdan başlamaq lazımdır. İlk öncə qavraması, göz kontaktı, diqqəti bərpa edilir. Daun sindromlu uşaqların ailələrinin psixoloji dəstəyə ehtiyacı var. Valideynlər uşaqları ilə məşğul olmalı, elementar şeyləri – özünə qulluq, əynini geyinmək, yeməyini yemək kimi vərdişləri uşaqlara öyrətməlidirlər. Onların musiqi duyumu yüksəkdir, gözəl rəqs edirlər, əl qabiliyyətləri var. Unutmayaq ki, Daun sindromlu körpələr xəstə deyil onlar sadəcə digər uşaqlardan bir az fərqlidirlər.

Birləşmiş Millətlər Təşkilatı 21 Martı "Dünya Daun Sindromu Günü" olaraq tanıyıb. Bu günün təsis edilməsində əsas məqsəd cəmiyyətin diqqətini bu sindrom üzərinə çəkmək, insanları maarifləndirməklə Daun

sindromlu şəxsləri cəmiyyətə qazandırmaqdır. Qeyd edək ki, bu tarixin seçilməsinə səbəb isə Daun sindromlu insanlarda 21- ci xromosomun 3 ədəd olmasıdır.

**Ədəbiyyat:**

1. N.T. Hüseynova "İntellektual inkişafı ləngiyən uşaqların pedaqogikası". Bakı, 2017
2. N.T. Hüseynova "İnklüziv təhsil". Bakı, 2014
3 . N.T.Hüseynova, L.H.Rüstəmova. Xüsusi pedaqogika. Bakı, 2006
4. Açıq cəmiyyət İnstitutu. Uşaq inkişaf metodikası. Bakı, 2009
5. Binbaşıoğlu, Cavid. Eğitim Psikolojisi. Ankara, 1992.

**Children with Down syndrome and their pedagogical and psychological features**

**Summary**

Down syndrome is associated with a diagnosis of mental retardation and is a disability that depends on the amount and structure of chromosomes. The disease is usually inherited and the disease is only born to the child. This syndrome is most commonly found in babies of pregnant women who are pregnant and have genetic chromosomal changes after age 35.

**Дети с синдромом Дауна и их педагогические и психологические особенности**

**Резюме**

Синдром Дауна связан с диагнозом умственной отсталости и является неспособностью, которая зависит от количества и структуры хромосом. Болезнь обычно передается по наследству, и болезнь рождается только у ребенка. Этот синдром чаще всего встречается у детей беременных женщин, у которых есть генетические хромосомные изменения после 35 лет.

**Rəyçilər: p.d.f. S.R.Aslanova,**
**dos.T.Ağayeva**

Göndərilib: 08.02.2020 Qəbul edilib: 10.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/72-75

**Elza Xanış qızı Məhərrəmova**
Sumqayıt Dövlət Universiteti
elza.m59@mail.ru

## TƏLİM METODLARI VƏ TEXNOLOGİYALARINA YENİ BAXIŞ

***Açar sözlər:*** *metod, texnologiya, şagird, müəllim, fənn*
***Key words:*** *method, texnology, student, teacher, subject*
***Ключавые слова:*** *метод, технология, ученик, учитель, предмет*

### Giriş

Ölkənin siyasi, iqtisadi inkişafı, xalqın tərəqqisi, maddi rifahının yüksəlməsi onun maddi sərvətləri və təbii ehtiyatları ilə deyil, daha çox malik olduğu yüksək elmi potensial və qabaqcıl texnologiyalarla şərtlənir. Təbii sərvətlərlə müqayisədə yüksək texnoloji avadanlıqlar dünya bazarında daha yüksək qiymətləndirilir və zaman keçdikcə təkmilləşir, inkişaf edir. Cəmiyyətin gələcək tərəqqisi onun istedad və yaradıcılıq potensialı ilə birbaşa bağlıdır. Müasir dövrdə xüsusi istedada malik olan şəxslərə tələb çox böyükdür. Bu dövrü səciyyələndirən yüksək texnologiyalar və elmi – texniki tərəqqi insanların intellektual və yaradıcılıq qabiliyyətlərinə mühüm tələblər irəli sürür. Yaradıcı şəxslərdən indi daha çox düzgün təhlil etmək, ümumiləşdirmə aparmaq, təsnif etmək, nəticə çıxarmaq, vaxtında və düzgün qərar qəbul etmək, proqnozlaşdırmaq kimi qabiliyyət və bacarıqlar tələb olunur. Müasir dövrdə Azərbaycan təhsil sisteminin yenidən qurulması, müasirləşdirilməsi və bu prosesdə yeni texnologiyalardan istifadə olunması vacib məsələlərdən biridir.

Hər bir cəmiyyətin əsaslı yeniləşməsində və yenidənqurulmasında təhsil sahəsində islahatların həlledici rol oynamasını ümummilli liderimizHeydər Əliyev 24 sentyabr 1998-ci ildə Azərbaycan Müəllimlərinin XI qurultayına ünvanladığı təbrik məktubundayüksək qiymətləndirmişdir: ”Müstəqillik dövrünün tələblərinə cavab verən yeni təhsil sisteminin yaradılması üçün köklü islahatların həyata keçirilməsi zəruri və təxirəsalınmazdır”(1).

Azərbaycan Respublikasının prezidenti İlham Əliyev demişdir: “İnsan kapitalı inkişaf etmiş ölkələrin indiki durumunu müəyyən edən amildir. Həmi ölkələr təbii resurslar hesabına yox, intelektual potensiala, yeni texnologiyaların icad olunmasına,tətbiqinə görə inkişaf edirlər. Biz də bu yolu seçməliyik”.

Müasir dövrdə respublikamızda uğurla aparılan təhsil islahatının nəticəsi olaraq ümumtəhsil məktəblərində fənnlərin öyrədilməsi prosesində əldə olunmuş biliklər öz xarakterini dəyişməklə yanaşı, həm də məzmunca yeniləşməni və nəticəyönümlü məzmunun tətbiqini tələb edir. İnformasiyalı cəmiyyətdə gedən proseslərdən baş çıxaran kamil insanın, çəxsiyyətin formalaşması mühüm məsələ kimi təhsil sisteminin qarşısında durur. Bununla bağlı tədris prosesində hazırda tətbiq oluan təlim vasitələri, metodları təkmilləşməli və təhsil sistemindəki yeniliklərin inkişafını təmin edə biləcək yeni pedaqoji və təlim texnologiyalarının tətbiqi genişləndirilməlidir (2).

Azərbaycan Respublikasının məktəblərində Milli kurikulumlar əsasındatədrisin aparılması ilə təhsil sistemi islahatın mühüm mərhələsinə başlanmışdır. İslahatın həyata keçirilməsində başlıca məqsəd təhsilin səviyyəsini artırmaqla şagirdyönümlü və nəticəyönümlü təhsili həyata keçirməkdir. Humanizmvə demokratiya prinsiplərinə əməl etməklə təhsilin qərbə inteqrasiyasına nail olmaqdır. Şagirdi subyektə çevirən müasir təhsil fəal, yaradıcı, sosial şagird formalaşdırmaqla vətəndaş tərbiyə etməyi özünün əsas məqsədi hesab edir.

Bugünə kimi təlim prosesi öyrənmə, öyrətmə, bilik, bacarıq, vərdişlərə yiyələnmə kimi pedaqoji prosesdə həyata keçirilmişdir. Müasir dövrdə cəmiyyətin inkişafı, sosial-ictimai, mənəvi-mədəni tələblər, elmi-texniki tərəqqi, iqtisadi münasibətlərin yeniləşən formaları, dövlətin inkişaf strategiyası kimi mühüm amillər təhsilin məqsəd və vəzifəsini,təlimin məzmununu,metodları və texnologiyaları yeniləşdirməyi tələb edir.

Yeni dövrdə təlim nəzəriyyəsi və praktikasının yeniləşməsini, müasirləşdirməsini həyata keçirən insanlar ilk növbədə keçilmiş tarixi təcrübəni diqqətlə öyrənir, nəyisə atır, nəyisə yeni formada inkişaf etdirərək bu prosesin mahiyyətini düzgün qavramaqla dövrün tələblərinə cavab verən yeni təlim – tədris metodikasını müəyyənləşdirirlər.

N.Tusi, Y.A.Komenski, A.Disterveq, K.D.Uşinski və başqaları yeni inkişaf mərhələsi yaradan konsepsiyalarını, təlim-tərbiyə nəzəriyyələrini təklifetmişlər.

A.Disterveq qeyd edirdi ki, dərsdə “təfəkkürhakim olmalıdır, suallar və cavablar, axtarışlar və tapıntılar olmalıdır.” O göstərirdi ki, təlim işi üçün təfəkkür müstəqilliyi daha çox əhəmiyyət kəsb edir, ona görə də şagirdlərdə mustəqil təfəkkür qabiliyyətinin tərbiyyə edilməsinə daha çox diqqət yetirməlidir. Onun fikrincə, təlim prosesində şagirdlərə bu və ya digər biliyin verilməsi kifayət deyildir, onların müstəqil surətdə bilik

öyrənmək bacarığını da ikişaf etdirmək lazımdır. Müəllimin köməyi olmadan şagird yalnız kitabdan deyil, həm də onu əhatə edən mühitdən, həyat hadisələrindən faydalı biliklər almaq bacarığına yiyələnməlidir.Belə olduqda insan bütün ömrü boyu öyrənməyə, bilik, bacarıq qazanmağa çalışır. K.D.Uşinski təlim prosesində şagirdlərə "öyrənməyi, öyrətməyi" pedaqoji tələb kimi irəli sürmüşdür. Təlimprosesini düzgün təşkil edib, şagirdlərdə müstəqil təfəkkürü ikişaf etdirmək qayğısına qaldıqda şagirdlər sərbəstləşir, onların fəaliyyətində müstəqil düşüncəyə istinad hərəkətlər üstünlük təşkil edir. Onlar təlim materiallarının məzmununu kitabdakı hazır ifadələrlə, əzbər yaddasaxlanılmış cümlələrlə deyil, öz sözləri ilə, öz tərzlərində şərh edirlər. Təfəkkür müstəqilliyininxüsusiyyətlərini aşağıdakı kimigöstərmək olar:

1. Başqasının köməyi olmadan qarşıya müəyyən sual, məsələ və ya problem qoymaq və onun həllinə nail olmaq;
2. Səbəblər haqqında mühakimə yürütmək;
3. Əldə edilmiş biliyi, bacarığı vəmənimsənilmiş qanun və qanunauyğunluqları tələb olunduqda tətbiq etməyi bacarrmaq;
4. Müstəqil düşünmək, təhlil etmək və nəticə çıxarmaq;
5. Başqalarını dinləmək.

Bu gün yaddaşa əsaslanan ənənəvi dərstəfəkkürü sərbəstlik, müstəqillik və təşəbbüskarlıq kimi keyfiyyətlərdən məhrum edir. K.D.Uşinskiyə görə təlim prosesində şagirdlərə bu və ya digər biliyin hazır şəkildə verilməsi kifayət deyildir, onlarda müstəqil şəkildə bilik qazanmaq bacarığını da inkişaf etdirmək lazımdır. "Öyrənməyi öyrətmək" dövrün tələblərinə cavab verməli, necə öyrətmək əvəzinə, necə "öyrənməyi öyrətmək" prinsipinə cavab verməlidir.

Təlim prosesini fəallaşdırmaq üçün öyrənənə "öyrənməyi öyrətmək" anlayışının əsas prinsiplərini mənimsətmək tələb olunur. Öyrənənlərə "öyrənməyi öyrətmək" üçün müəllim onları aşağıdakı işfəaliyyətinə cəlb edir :

1. Müstəqil çalışmaq;
2. Praktik iş görmək;
3. Müşahidə etmək və tutuşdurmaq;
4. Araşdırmaq və təhlil-tərkib etmək,
5. Nəticə əldə etmək
6. Bacarıq və vərdişə yiyələnmək;
7. Mücərrədləşdirmək,ümumiləşdirmək;
8. Özünəinam, özünütərbiyə;
9. Qabiliyyətlərin üzə çıxarılması.

Müəllim şagirdə "öyrənməyi öyrətmək" üçün şübhəsiz özü də öyrətməni öyrənməlidir.Bu məqsədlə müəllim qabaqcıl təcrübəni öyrənməli, fənnin tədrisdə yerini, şəxsi təcrübəni, pedaqoji hadisələri, şagirdi fəaliyyətini müşahidəetməyi, təhsil standartlarını, metodik ədəbiyyatı, elmi yenilikləri, yaradıcılıqla bağlı problemləri həll etməyi, fəaliyyətin əsas göstəricilərinin inkişaf etdirilməsinə dair işlərin aparılmasını və müasir dərsi təşkil etməyibacarmalıdır.

Şagirdlər aşağıdakı bacarıqlara yiyələnməlidir:

1. Dərslik üzərində işləmək;
2. Müşahidə etməyi bacarmaq;
3. İnformasiya vasitələrindən istifadə etmək;
4. İnsanlarla əməkdaşlıqetmək;
5. Texniki vasitələrdən istifadə etmək;
6. Müstəqil mühakimə yürütmək;
7. Müstəqil bilgi əldə etmək və bilgiləri tətbiq etmək;
8. Öyrəndiklərinəmünasibətbildirmək.

Təlim-tərbiyə prosesində meydana çıxan daxili və xarici kimi ikiyerə ayrılan ziddiyyətlərdən dərketmədə, şagird təfəkkürünün, müstəqilliyniin, yaradıcılığının inkişaf etdirilməsində eyni zamanda daha mürəkkəb problemlərin həll edilməsindəkifayət etməyən müxtəlif ənənəvi təlim metodlarıılə müasir təliməverilən tələblər arasındakı ziddiyyət kimi göstərilən xarici ziddiyyət pedaqogika elminin təlim nəzəriyyəsinin inkişafının fəlsəfi metodologiyasıdır. Didaktikanın özəyini təşkil edən təlim metodları spiralvari inkişaf edir: mövcud metodlara müəyyən dərəcədə yeni məzmunda, başqa formalarda qayıdır.Məqsəd metodları cəmiyyətin inkişaf səviyyəsinə uyğunlaşdırmaq, təlim-tərbiyədə daha mütərəqqi üsullardan istifadə etməklə təlim subyektinin maraq tələbatını ödəməkdir. Müasir zamanda müstəqil təlim işi olanöyrədicimühitə aşağıdakılar daxildir;

1. Əşyavi mühit (dərsliklər, dərs vəsaitləri,texniki vəsaitlər və s.);

2. İformasiya mühiti (televiziya, mətbuat, kompyuter, bədii,ensiklopedik, elmi-kütləvi ədəbiyyat, sərgilər, ekskursiyalar və s.);
3. Sosia-psixoloji mühit (təlim prosesində şagird-şagird, müəllim-şagird, müəllim-şagird-valideyn, ailə-şagird, müdiyyət-şagird, yaşlılar-şagird).

Yeni təlim texnologiyalarında şagirdlərin intellektual, mənəvi cəhətdən inkişaf etdirilməsi ön plana keçirilir. Yeni texnologiyaların təlimdə tətbiqi şagirdlərin öz fikirlərini aydın, məntiqi ardıcıllıqla ifadə etmələrinə şərait yaradır. Bumetodlar şagirdlərin yaradıcılıq qabiliyyətinin inkişafını təmin etməklə, onlarda yüksək ünsiyyət mədəniyyəti formalaşdırır.Təlim prosesini fəallaşdırmaq üçündüşünmə qabiliyyətini inkişaf etdirmək, yaradıcılığa həvəsləndirmək və öyrənməyə maraq yaratmaq məqsədini güdən müəllim şagirdi təlimə cəlb edəcək müəyyən metod və texnikalardan istifadə etməlidir.Yeni texnologiyalar bir sıra xüsusiyyətləri ilə ənənəvi təlim metodlarından fərqlənir:

1. Şagirdlərin tədqiqat fəaliyyətinə cəlb edilmələri;
2. Müəllim tərəfindən problemli şəraitin yaradılması;
3. Biliklərin şagirdlər tərəfindən müstəqil əldə edilməsi və s.

Yeni təlim texnologiyaları aşağıdakı prinsiplərə əsaslandıqda şagirdlərin yaradıcılıq qabiliyyətini inkişaf etdirməyə imkan verir:

1. Təfəkkürün inkişafına səbəb olacaq konstruktivizmə;
2. Şagirdlərin sosialinkişafına səbəb olacaq kooperativ təlimə;
3. Biliklərin müstəqil əldə edilməsi üçün şəraitin yaradlmasıa;
4. Bilik və bacarıqların müstəqil şəkildə əldə edilməsinə;
5. Müəllimin təşkilatçı, koordinator rolunda çıxış etməsi.

Yaradıcı mühitin təmin edilməsi üçün müəllimaşağıdakılara əməl etməlidir:

1. Bilik vermək yox, biliyi əldə etməyə həvəsyaratmalı;
2. Hazır cavablı suallar yox, problemli suallar verməli;
3. İnformasiya verməkdənsə öyrənəni biliklərin əldə edilməsi prosesinə cəlb edilməsi;
4. Öyrənmə prosesini düzgün planlaşdırmalı.

Cəmiyyət müstəqil düşünən, kamil,rəqabətli şəxsiyyət, yaradıcı insan yetişdirməyi problem kimi təhsil müəsissələrinin qarşısına qoymuşdur. Bu vəzifələri həyata keçirmək, reallaşdırmaq inkişaf etmiş qabaqcıl ölkələrdə mövcud olan fəal təlim metodlarından, milli-mənəvi dəyərləri nəzərə alaraq istifadəni zərurətə çevirmişdir.

Azərbaycan Respublikasında təhsil sahəsində İslahat Proqramı yeni təlim metodlarından, təlim texnologiyalarından istifadənin elmi, pedaqoji-psixoloji əsaslarının işlənilməsini əsas problem kimi qarşıya qoymuşdur.

## Nəticə

Məqsədyönlü və məzmunlu təşkil edilən təlim-təhsil prosesi təhsilalanlara əqli, əxlaqi, amosional, iradi, əmək, iqtisadi və s. keyfiyyətlər aşılamaqla yanaşı, onlarda dünyanı dərk etmək, həyatı dəyərləndirə bilmək bacarıqları formalaşdırır və gələcək həyat üçün bir sıra keyfiyyətlər aşılayır. Bu prosesdə həlledici rol dərsə məxsusdur. Dərsin əsas xüsusiyyətləri ondan ibarətdir ki, o, şagirdlərdə müəyyən bilik, bacarıq, səriştə, intellektual inkişaf, elmi düşüncə tərzi, dərketmə bacarıqları formalaşdıra bilir. Şagirdlərin təlim-təhsil fəaliyyətinin təşkilində və aparılması prosesində müəllim fəaliyyətinə daxil olan pedaqoji texnologiyaların nəzərə alınması olduqca vacibdir. Müəllim bu texnologiyaları, qarşıda duran məsələlərin necə, hansı formada və şəraitdə həll edilməsini yaxşı bilməlidir. Pedaqoji prosesdə şagirdlərin öz fikirlərini sərbəst şəkildə ifadə etmək, yaradıcılıq prosesinə qoşulmaq, axtarmaq, tapmaq, nəticə çıxarmaq, məlumat mübadiləsi aparmaq və s. kimi məsələlərə geniş imkan yaratdığından müəllimin şagirdlərlə sıx əməkdaşlıq şəraitində işləməsi xüsusi xarakter alır. Belə dərslərdə məşhur bir kəlamda deyildiyi kimi şagirdlərə "hazır balıq verilmir, onlara balıq tutmağın yolları öyrədilir".

## Ədəbiyyat:

1. Azərbaycan Respublikası Təhsil Nazirliyinin Kollegiyasının materialları. Bakı: Təhsil, 2003, 185 s.
2. Azərbaycan respublikasının Təhsil İslahatı Proqramı. Azərbacan Respublikası Nazirlər Kabinetinin 168 nömrəli sərəncamı, 15 iyun 1999-cu il.
3. Mehrabov A. və b. Pedaqoji texnologiyalar. Bakı: Mütərcim, 2006.
4. Mərdanov M., Şahbazlı F. Azərbaycanın təhsil siyasəti (1998-2004 ), I-ci kitab. Bakı: Çaşıoğlu, 2005.
5. Qaralov Z. Təhsil sistemləriə müasir baxış.Bakı: Pedaqogika, 2003.
6. Qədimova X. İnteraktiv təlim metodlarının tətbiqi yolları. Bakı: Nur, 2003, 315 s.

**A new look at teaching methods and technologies**

**Summary**

In the article teaching of subject taking into account modern requirements is once again explained. The new modern model of teaching of subject is offered. Also it is simultaneously specified the practical directions captured by a pedagogical science inteaching subject. Technological approach to teaching, while providing accurate management of the learning process, must also ensure that the educational objectives are met at a high level. technologies should be chosen depending on the goals and conditions. The main thing is to educate children, develop their ability to think, think independently, apply knowledge, build a culture of communication, understanding, and ability to solve their problems. Let the students come to the conclusion in the shortest possible time without making any mistake.

**Новый взгляд на методы и технологии обучения**

**Резюме**

В статье еще раз разъясняется преподавание предметов с учетом современных требований. Предлагается новая современная модель преподавания предметы. Также одновременно уточняются практические направления в преподавании. Технологический подход к обучению, в то же время обеспечивая точное управление учебным процессом, также должен обеспечивать достижение образовательных целей на высоком уровне, а преподаватель должен наилучшим образом работать над применением интерактивных методов обучения. Пр этом технологии следует выбирать в зависимости от целей и условий. Главное - воспитывать детей, развивать их способность мыслить, мыслить самостоятельно, применять знания, развивать культуру общения, понимания и умения решать свои проблемы. Основной целью педагогических технологий является то, чтобы студенты могли в краткие сроки делать правильная выводы.

**Rəyçi: prof. R.Hüseynzadə**

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/76-78

**Судаба Мамед гызы Мамедова**
Сумгаитский государственный университет
sdu.hazirliq@mail.ru

# ПУТИ ФОРМИРОВАНИЯ МЕЖКУЛЬТУРНОЙ КОММУНИКАТИВНОЙ КОМПЕТЕНЦИИ У СТУДЕНТОВ-АЗЕРБАЙДЖАНЦЕВ В ПРОЦЕССЕ ОБУЧЕНИЯ РУССКОМУ ЯЗЫКУ КАК ИНОСТРАННОМУ

***Ключевые слова:*** *коммуникативность, методика, эффективность, компетенция, образование*
***Açar sözlər:*** *kommunikativlik, metodika, effektivlik, kompetensiya, təhsil*
***Key words:*** *communication skills, methodology, efficiency, competence, education*

Учитывая многонациональность нашей страны, русский язык был и есть одним из главных языков общения между постсоветскими народами. Будучи составной частью единого педагогического течения, реализуемого в средних школах, вузах иных и образовательных учреждениях Азербайджана, освоение русского языка тесно связано с научной и культурной жизнью страны.

Готовясь к общению с представителями других этносов, необходимо иметь представление об их традиционных особенностях и не торопиться с умозаключениями по поводу того, что ваш собеседник не совсем правильно, с вашей точки зрения, реагирует на те или иные высказывания, мимику, жесты. Нужно постараться понять, почему так происходит. Другими словами, необходимо избавиться от культурного центризма в оценке поведения людей, что возможно только через формирование толерантности посредством знаний, умений и навыков межкультурной коммуникации.

В данное время, к методике учения русского языка предъявляются особые требования и успешное выполнение этих требований обеспечивает высокую эффективность обучения ему учащихся-азербайджанцев. Главным признаком специализации в любых отраслях деятельности, показывающим степень подготовки основных видений и умений в области взаимоотношения, является коммуникативная компетентность. Важным направлением образования является не только иноязычная коммуникация, но и межкультурная коммуникативная компетенция (МКК) у учащихся, которая подразумевает формулирование новых основ в педагогике. Эта компетенция станет важным качеством, необходимым каждому выпускнику высшего учреждения. МКК научит студентов вузов профессиональной мобильности, подготовит их к активной жизнедеятельности в работе и адаптирует специалиста к мировым стандартам достижений. Сегодня студенты получают расширенные знания о языке, который изучают, о стране этого языка, но при этом, сталкиваясь со сложностями в процессе взаимоотношения с иностранцами, иногда даже показывают неумение принятия другой культуры. Поэтому можно утверждать о присутствии разногласия, которое заключается в не полностью проработанной педагогической теории в вопросе образования межкультурной компетенции. Значение практических занятий также важны в данном вопросе.

В процессе работ выявлено и подтверждено, что межкультурная коммуникация ярко влияет на воспитание личности студента, однако специальных педагогических основ в этом направлении нет. В определении уровней формирования межкультурной толерантности, как профессионального качества, можно использовать *метод самооценки и экспертной оценки*. Повышение самооценки способствует скорейшей адаптации студента к различным ситуациям, в том числе в образовательной среде. Следовательно, самооценка как один из приемов определения уровня формирования межкультурной толерантности у студентов, не может дать объективной оценки уровня формирования её комп-онентов.

Важным направлением образования является не только иноязычная коммуникация, но и межкультурная коммуникативная компетенция - МКК у учащихся, которая подразумевает формулирование новых основ в педагогике. Эта компетенция станет важным качеством, необходимым каждому выпускнику высшего учреждения. МКК научит студентов вузов профессиональной мобильности, подготовит их к активной жизнедеятельности в работе и адаптирует специалиста к мировым стандартам достижений. [1]

Развитие современной высшей школы направлено на образование нравственной, грамотной и творческой личности, на воспитание толерантности и уважительного отношения к другим народам, их языку и культуре. Оно диктует необходимость обновления образования, в том числе, обновленного предмета учебных дисциплин в высшей школе, реализующих этнокультурные функции образования.

Компетенция является требованием к обучению студента, которое выражается в комплексе способностей, знаний и опыта при поведении студента в определенном кругу. Основываясь на положения подхода в компетентном направлении, определяются принципы методики и дидактики изучения иностранного языка в вузах, одними из которых считаются межкультурная и коммуникативная направленность на самообразование и профессионализм.

Принцип коммуникативности располагает применять изучаемый язык при обычном каждодневном общении. Для этого процесс образования межкультурной компетенции подразумевает моделирование реального и близкого к нему контакта на данном языке.

Еще одной разновидностью коммуникативной компетенции считается иноязычная компетенция (ИКК), которая стала главным качеством специалиста. Сегодня мы наблюдаем, как Азербайджан интегрирует в международные сообщества, где требования, предъявляемые к уровню овладения иностранным языком, не только имеют межличностный, но и носят научно-технический характер. Это становится основой для реализации совместных программ, научно-технических проектов и т.д.

Оба вида коммуникативной компетенции не эквивалентны друг другу, однако присутствие их обоих обеспечивает полную готовность студента к удачному межкультурному действию.

Существует несколько целей МКК:

1) усовершенствование компетенции, как подготовленности и возможности студента опознавать, изучать и разъяснять термины, концепции, принципы и нормы собственной лингвокультуры;

2) образование инокультурной компетенции, как подготовленности и возможности студента вуза опознавать, изучать и разъяснять термины, концепции, принципы и нормы собственной лингвокультуры;

3) развитие интеркультурной компетенции, как подготовленности и возможности студента вуза опознавать, изучать и разъяснять термины, концепции, принципы и нормы собственной лингвокультуры.

В 80-х годах XX века представители западной науки утверждали, что межкультурная компетентность формируется за счет познаний, полученных в процедуре проведения межкультурной коммуникации. Вышеуказанная информация разделялась на специфическую, которые были выражены как определенные знания о культуре в концепции традиций и обычаев и общую, которые подразумевали знания в области толерантности и общекультурных универсалий [2].

Вышеуказанная классификация не отрицает связь обоих типов знаний.

Именно поэтому в западной литературе межкультурная компетенция изучается в двух направлениях:

1) как способность личности образовать в себе интерес к другой культуре;

2) как способность достичь успеха при общении с носителями другого культурного качества.

В первом случае предполагается ознакомление и освоение наибольшего количества знание об иной культуре, а во втором – не требуется максимальный объем знаний об основных элементах культуры партнеров по общению.

То есть в современной западной науке сложились два подхода к термину межкультурной компетенции, точнее две концепции, определяющие суть данного явления:

1) способствуя практическому улучшению, межкультурная коммуникация должна быть направлена на взаимопонимание соучастников диалога культур;

2) межкультурная компетенция должна быть нацелена не только на восприятие, уважение и признание носителей другой культуры, но и на выявление различия между людьми, являющимися обладателями прочих культур.

МКК базируется на применении разных методов обучения, основу которых занимают ролевые игры и упражнения с игровыми элементами. С их помощью нам удается воссоздать реальную ситуацию иноязычного общения. В таком случае, к примеру, при обучении тематики «Жизнь студентов» их приглашают в университеты для общения с преподавателями о будущей специальности. Этот вид деятельности знакомит учащихся с иноязычной культурой и учит понимать и принимать ее. Основную роль в образовании МКК играет индивидуальная работа учащихся, подразумевающая поиск нужных страноведческих сведений в сети Интернет, итогом которого становятся презентации работ с их последующим обсуждением. Главным содержанием процедуры изучения иностранного языка, в том числе и образование МКК являются устройство и принятии дискуссии. Мнение, работа над логической постройкой своей точки зрения, доказательство с опорой на модели, указанные в иноязычных источниках, формирует и улучшает у студентов личное отношение к ценностям окружающего мира, дает выявить разногласия социокультурного вида. В итоге студенты учатся показывать выводы по

вопросам изучения. Важность поиска в иноязычном тексте проблемы, соискание аргумент для ее объяснения, оценивания, быстрой реакции на другие рассуждения, приводить на иностранном языке свои убедительные аргументы. Эти факторы производят ценностные ориентации, условия нравственной активности, улучшая опыт и формируя социокультурную, тематическую, компенсаторную и лингвистическую компетенции, которые приводят к социокультурной адаптации индивидуума. Во время обсуждения самыми продуктивными являются прагматическая и социолингвистическая компетенции. Во время учебного процесса педагог руководит коммуникативной дисциплиной учащихся [3]. Тема урока должна принимать во внимание кругозор студентов, имея мотивирующий фактор для выражения собственных замечаний и рекомендаций по образованию и организации темы. Дискуссируя тему, педагог рассматривает ее с учащимися в рамках иноязычной культуры, и пользуется опытом студентов в пределах собственной культуры. Необходимо поощрять независимость ответа студента и организовывать занятия в небольших группах. При этом, педагог на время объединяет студентов в группы по несколько человек для выполнения учебных заданий, назначает главную цель. Это дает возможность создавать учебный процесс на основе разговорной практики по принципам коммуникативного подхода и улучшает самостоятельность студентов [4]. Исходя из этого, делаем вывод, что современная идея преподавания русского языка как иностранного должна основываться на идеях и методиках коммуникативного обучения, которые приводят к увеличению коммуникативной компетенции, и находятся в способностях студентов уметь самостоятельно использовать устную и письменную речь на основе коммуникации.

**Литература:**

1. Пассов Е.И. Основы коммуникативной методики обучения иноязычному общению. М.: Рус.яз. 1989, с.276.

2. Янкина Н.В. Формирование межкультурной компетентности студентов университета. М.: Дом педагогики, 2005, 370 с.

3. Мамедова С.М. Русский язык. Учебное пособие для студентов-филологов азербайджанского сектора. Сумгаит: СГУ, 2014, с. 127.

4. Программа практического обучения русского языка для бакалавров гуманитарных факультетов. Сумгаит: СГУ, 2014, с.19.

**Rus dilinin təlimi prosesində tələbələrdə mədəniyyətlərarası ünsiyyət kompetensiyasının formalaşması yolları**

**Xülasə**

Beynəlxalq ünsiyyət vasitəsi olan və beynəlxalq aləmdə nüfuza malik olan rus dilinin tədrisi hər bir xalqın rus mədəniyyəti və mənəviyyatına, rus dilinin köməyi ilə isə dünya mədəniyyətinə yiyələnməsinə kömək edir. Azərbaycan ali məktəblərində xarici dil kimi tədris olunan rus dilinin öyrənilməsi və onun tədqiqi tələbələrdə mədəniyyətlərarası kommunikasiya kompetensiyasının formalaşdırılması məsələsini müəyyən etməyə imkan verir.

**Ways to develop intercultural communicative competence among azerbaijani students in the process of teaching russian as a foreign language**

**Summury**

Teaching the Russian language, which is a way of international communication and enjoys authority in the international arena, helps to familiarize each nation with Russian culture and spirituality, and with the help of the Russian language - to world culture. Studying and researching curricula on Russian as a foreign language for Azerbaijani universities allowed us to determine the degree to which they reflect the question of the formation of intercultural communication competence.

**Рецензент: проф.А.Шахбазова**

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/79-80

**Südabə Nəsrəddin qızı İsgəndərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# İNTELLEKTUAL POZULMASI OLAN UŞAQLARDA REFLEKSİYANIN İNKİŞAFI ŞƏRTLƏRİ

***Açar sözlər:*** *refleksiya, intellektual qabiliyyəti pozulmuş uşaqlar, emosional-iradi sfera, tələbat-motivasiya sferası, özünüqiymətləndirmə, iddia səviyyəsi*
***Key words:*** *reflection, children with intellectual disabilities, emotional-volitional sphere, motivational-needful sphere, self-esteem, level of claims*
***Ключевые слова*:** *рефлексия, дети с ограниченными интеллектуальными возможностями, эмоционально-волевая сфера, мотивационно-потребностная сфера, самооценивание, уровень притязаний*

Refleksiya "keçmişə müraciət" mənasını bildirib, fərdin özünüdərk məqsədi ilə düşünmə prosesinə daxil olaraq özünün dəyərlərini, prinsiplərini, duyğu və hisslərini, bacarıqlarını və davranışlarını anlaması və təhlil etməsidir. Refleksiya güclü funksiyalara malikdir. Onun mövcudluğu insana şüurlu şəkildə öz düşüncəsini planlaşdırma, tənzimləmə və nəzarət etməsinə imkan verir. Refleksiya düşüncələrin sadəcə həqiqiliyini deyil, eyni zamanda məntiqli olmasını qiymətləndirməyə kömək edir. O, emosional intellektin əsas ünsürlərindən olan özünüdərk prosesini təmsil edir. Müasir psixologiyada özünüdərk - insanın öz emosiyalarının xarakterini dərk etməsi, güclü və zəif yanlarının fərqinə varması, dəyərlərini və prinsiplərini müəyyənləşdirməsi, həyatdakı missiyasını aydınlaşdırması kimi qəbul olunmuşdur. **Refleksiya,** eyni zamanda, insanın özünü, öz daxili aləmini dərk etməsi, özünün fikir və hisslərini təhlil etməsi, öz əməllərini, başqaları ilə münasibətlərini görmək bacarığı, özü haqqında mühakimələri deməkdir. Refleksiya başqalarının sənə necə münasibət bəslədiyini, necə yanaşdığını, onların səni necə başa düşdüklərini görmək və dərk etməsi deməkdir.

Refleksiya uşağın yaş mərhələlərinə uyğun inkişaf edir. Erkən uşaqlıq dövründə refleksiyanın formalaşması üçün ilkin şərtlər yaranır. Refleksiyanın inkişafı uşağın yerinə yetirdiyi fəaliyyətdən asılıdır. Gəzməklə yanaşı uşaq ətraf məkanı öyrənməyə başlayır. Nəticədə əşya ilə manipulyasiya fəaliyyəti inkişaf edir. Ancaq intellektual pozulması olan uşaqlarda belə manipulyasiyaya maraq olmur. Onlarda əşya ilə qeyri-adekvat münasibət müşahidə olunur. Həmçinin, məqsədyönlü fəaliyyət etmirlər. Bu yaşda refleksiyanın formalaşmasına birbaşa nitqin inkişafdan qalması da təsir edir. İntellektual pozulması olan körpə yaşlı uşaqlarda ətraf aləmi dərk etməyə cəhd olmur. Emosional ünsiyyətə tələbatın pozulması refleksiyanın formalaşması üçün ilkin şərtlərin olmaması qənaətinə gəlməyə imkan verir.

Refleksiyanın inkişafına görə sağlamlıq imkanları məhdud uşaqlar arasında özünəməxsus inkişaf qanunauyğunluqlarına malik olan intellektual qabiliyyəti pozulmuş uşaqlar xüsusi ilə fərqlənir. Belə uşaqlarda reflektiv bacarıqların və vərdişlərin formalaşmasını öyrənmək üçün emosional sferanın, iradi davranışın, özünüqiymətləndirmənin, öz fəaliyyətini tənzimlənmənin və iddia səviyyəsinin inkişafını nəzərə almaq lazımdır [1; 88-91].

Məktəbəqədər yaş dövrü ətraf aləmi dərk etmək mərhələsi kimi xarakterizə olunur. Bu yaşda intellektual qabiliyyəti pozulmuş uşaqlarda refleksiyanın ilkin əlamətləri böyüklərin tələbi sayəsində yaranmağa başlayır. Uşaqlarda özünə xidmət vərdişləri, sosial normalara uyğun davranış formaları yaranır. 4-5 yaşda ictimai təcrübənin mənimsənilməsi, sosial tələbatları yerinə yetirmək istəyi yaranır. Uşaqlar tərif, təsdiq və qınağı dərk edir, emosiyalar təzahür olunur. Uğursuzluq və müvəffəqiyyətsizliyə laqeyd qalmır, hiss edir və başa düşür. Davranışın idarə olunmasında da çətinlik çəkir [3; 914-915].

Kiçikyaşlı məktəbli dövründə də emosiyanal-iradi sfera tam formalaşmamış və inkişaf etməmiş olur. Bu yaş üçün emosiyanal reaksiyalara zəif nəzarət etmək, iradi aktivliyin aşağı olması, yüksək özünüqiymətləndirmə, düzgün olmayan iddia səviyyəsi xarakterikdir, onlar öz potensialını adekvat müəyyənləşdirə bilmirlər. Lakin başqa insanların emosialarına cavab vermək iqtidarına malik olurlar.

Yeniyetmə və gənc yaşda adekvat özünüqiymətləndirmə müşahidə olunur və iddia səviyyəsi yerinə yetirilən fəaliyyətdən asılı olur. Uşaqlar həm özünün şəxsi keyfiyyətlərini, həm də bir-birinin keyfiyyətlərini qiymətləndirməyə başlayır.

T.V.Andruşenko, A.V.Zaxarova, N.V.Karabekova, Q.İ.Katriç, V.N.Lozoseva, N.A.Stepanova və başqalarının tədqiqatlarında qeyd edilir ki, şəxsiyyətin komponenti olan özünüqiymətləndirmə, empatiya, refleksiya emosional-iradi sfera, motivasiya-tələbat sahələrinin inkişafı ilə qarşılıqlı əlaqədə formalaşır.

O.K.Ağavelya, N.Y.Boryakova, T.N.Qolovina əsərlərində göstərir ki, intellektual qabiliyyətin pozulması olan uşaqların emosional inkişafı onların yaşından, pozulmanın dərinliyindən, keyfiyyətindən asılıdır ki, bu da inkişafsızlıqla xarakterizə olunur və belə uşaqların emosional sferasında müəyyən çatışmazlıqlar olur. Emosiyalar səthi, qeyri sabit olub, sürətli və kəskin dəyişikliklərə məruz qalır, kifayət qədər differensasiya

olunmamış olur. Keçirdiyi hisslər primitiv, adətən qeyri-adekvat, dinamikasına görə ətraf mühitlə qeyri-mütənasib qarşılıqlı təsirdə olurlar. Emosiyalarda həddindən artıq inertlik, stereotiplik, real həyati hadisələrə səthi yaşanma müşahidə olunur, əhəmiyyətsiz səbəblərdən emosiyanal reaksiyalar yarana bilər. Bir əhval-ruhiyyədən digərinə tez keçirlər. Belə uşaqlar emosional vəziyyətinə nəzarət edə bilmir, başqalarının emosiyalarını anlamaqda çətinlik çəkirlər, mürəkkəb sosial-əxlaqi xarakterli emosiyalardan məhrum olurlar. Lakin E.A.Yevlaxova, S.D.Zabramnaya qeyd edirlər ki, intellektin pozulması olan uşaqlarda da ətrafındakılar tərəfindən bəyənilməyə və özünü tanımağa ehtiyac vardır. İntellektual cəhətdən pozulması olan uşaqlar motivasiya-tələbat sahəsinin zəifliyi, fəallığa meyilliyin qısa müddətli olması, motivlərin məhdudluğu, sosial tələbatların kifayət qədər formalaşmaması ilə səciyyələnir. Uşaqların fəaliyyətə motivasiyası qısamüddətli olub, ünsiyyətə zəif motivasiya ilə xarakterizə olunur. Bu və ya digər fəaliyyətin yerinə yetirilməsi üçün motivlər qeyri-sabitdir və tez tükənir. Belə uşaqlar üçün iradi fəallığın kəskin azalması, qısamüddətli olması və iradi proseslərin zəifliyi səciyyəvidir. Onlar müstəqil fəaliyyət göstərə bilmirlər. Praktik olaraq həmişə zəif daxili motivasiya, yüksək həyəcanlılıq, düşünülməmiş hərəkətlər və davranışlar, başqa bir insanın iradəsinə qarşı gələ bilməməsi xasdır. Uşaqlar xarici təəssüratlara birbaşa, kəskin, impulsiv reaksiya göstərirlər. Bu kateqoriyadan olan uşaqlar üçün mənəvi əlaqələri, əxlaqi anlayışları mənimsəmək, inkişaf etdirmək və mənəvi əlaqələr qurmaq çətindir.

Əqli cəhətdən zəif uşaqlarda özünüqiymətləndirmə kəskin dəyişikliklərlə, qeyri-adekvatlıq ilə xarakterizə olunur və bu təlim boyunca dəyişir. Kiçikyaşlı məktəblilərdə özünüqiymətləndirmə qeyri-adekvatdır, öz imkanları haqqında düzgün fikir formalaşmır. Yeniyetməlik dövründə özünüqiymətləndirmə daha adekvat olur və yerinə yetirilən fəaliyyət növü ilə müəyyən olunur. İntellektin pozulması olan uşaqlarda iddia səviyyəsinin formalaşması uşağın əvvəlki təcrübəsindən, onun bu fəaliyyət növlərində uğurundan və ya müvəffəqiyyətsizliyindən asılıdır.

Beləliklə, intellektual pozulması olan uşaqlarda emosional inkişaf, iradi davranış, özünüqiymətləndirmə, fəaliyyətin tənzimlənməsi və iddia səviyyəsinin öyrənilməsi şəxsiyyətin reflektiv qabiliyyətinin formalaşmasında onların əsas rol oynadığını göstərir və müəyyən qanunauyğunluqlar əsasında formalaşır.

**Ədəbiyyat:**

1. Бородина В.А., Цилицкий В.С., Тьюторское сопровождение формирования рефлексивных механизмов социализации детей с ограниченными возможностями здоровья (теоретические основы): Учебно-методическое пособие, Челябинск, 2017, 117 с.
2. Бизяева А.А.Психология думающего учителя: Педагогическая рефлексия / А.А.Бизяева. Псков: ПГПИ им. С.М.Кирова, 2004, 216 с.
3. Цилицкий В.С. Закономерности формирования рефлексивных умений и навыков на разных этапах возрастного развития человека / В.С.Цилицкий // Молодой ученый, 2015, № 22, с. 913-917.

**Conditions for the development of reflection in children with intellectual disabilities**

**Summary**

The article notes that in children with intellectual disorders, emotional development, volitional behavior, self-esteem, regulation of activity and the study of the level of claims play a key role in the development of reflective personality skills and the formation on the basis of certain patterns. For primary school age, weakly controlled emotional reactions, low volitional activity, high self-esteem and the wrong level of claims are characteristic. Adequate self-esteem is observed in adolescents, and the level of claims depends on the activity. Children begin to appreciate both their personal qualities and those of.

**Условия развития рефлексии у детей с интеллектуальными нарушениями**

**Резюме**

У детей с интеллектуальными расстройствами, эмоциональное развитие, волевое поведение, самооценка, регулирование деятельности и изучение уровня притязаний играют ключевую роль в развитии рефлексивных умений личности и формировании на основе определенных закономерностей. Для младшего школьного возраста характерны слабо контролируемые эмоциональные реакции, низкая волевая активность, высокая самооценка и неправильный уровень притязаний. Адекватная самооценка наблюдается у подростков молодежи, а уровень притязаний зависит от деятельности. Дети начинают оценивать как свои личные качества, так и качества друг друга.

**Rəyçi: prof.M.İlyasov**

Göndərilib: 07.02.2020 Qəbul edilib: 10.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/81-83

**Afət Afər qızı İsrafilova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# ƏQLİ CƏHƏTDƏN GERİ QALAN UŞAQLARDA DAVRANIŞ POZUNTULARI

***Açar sözlər**: davranış pozuntuları, məktəbəqədər yaş dövrü, əqli gerilik*
***Key words**: behavioural problems, Pre-school children, intellectual disability*
***Ключевые слова:** поведенческие проблемы, дети дошкольного возраста, умственная отсталость*

Ümumilikdə götürüldükdə davranış pozulmaları fərdin yeni bir bacarıq öyrənməsinə mane olan və olduğu mühitə uyğunlaşa bilməməsinə səbəb olan, özünə və başqalarına zərər verən, eyni zamanda fərdin yaşadığı cəmiyyətin sosial normalarına uyğunlaşmayan davranışlar olaraq adlandırıla bilər. Tədqiqatçılara görə uşaqların davranışlarının problem hesab edilməsi üçün bu davranışların yaşa uyğunluğunu, sıxlığını (davamlı olaraq 6 aya qədər), cinsi rol göstəricilərini müəyyən etmək lazımdır.

Davranış pozulmalarını müəyyən etmək məqsədilə aparılan araşdırmalarda ev və məktəb mühiti daxil olmaqla valideynlər və müəllimlərin rolu araşdırılmışdır. Müəyyən olunmuşdur ki, davranış problemlərinin ən çox müşahidə olduğu mühitin məktəb olduğu məlum olmuşdur. Bunun səbəbi uşaqların və yeniyetmələrin vaxtlarının çoxunu məktəbdə keçirmələridir. Məktəbdə davamlı kefsiz, özünəqapalı, aqressiv, əsəbi, həmyaşıdları tərəfindən pis münasibət görən, diqqət yetirilməyən, davamlı tənqid olunan uşaqların dəyərləndirilməsini müəllimlər həyata keçirir.

Davranış pozulmaları uşağın müxtəlif psixi və somtik səbəblərlə bağlı daxili münaqişələrini davranışlarına yansıtması nəticəsində ortaya çıxa bilər. Aqressivlik, əsəbilik, inadkarlıq, yalan kimi davranış pozulmalarına çevrilir. Əqli cəhətdən geri qalan uşaqlarda davranış pozulmaları hissi, psixiatrik və neyropsixatrik pozumalar baxımından tipik uşaqlarla müqayisə etdikdə ümumilikdə daha yüksək risk daşıyırlar. Əqli cəhətdən geri qalan uşqlar tipik uşaqlara nisbətən daha yüksək dvranış pozulmaları göstərirlər.

Atipik uşaqlarda bəzi çatışmazlıqlarla yanaşı arzu olunmayan davranışlarda müşahidə olunur. Bəzi davranışlar problemli davranışlar olaraq qəbul olunuşdur. Bu problemlər uşağın yeni bacarıqlar öyrənməsini mövcud bacarıqlarını isifadə etməsini, mühitlə sosial əlaqələrinə mənfi təsir göstərən davraışardır. Əqli cəhətdən geri qalan uşaqların öz ehtiyaclarını ödəyə bilməmək və digər həmyaşıdları ilə ünsiyyət qura bilməmələri kimi maneələrin nəticəsində aqressiv davranışlar göstərməsinə səbəb olur. Aqressiv davranışların əsas məqsədi diqqət çəkməkdir. Əqli cəhətdən geri qalan uşaqların aqressiv və diqqət əskikliyi kimi davranış pozulmaları baxımndan risk qrupların aid olduqları məlum olmuşdur. Bu pozulmalara səbəb yalnlzca intellektlərinin aşağı olması deyil. Şəxsiyyət pozulmaları və mühit faktorları da bu pozulmalara səbəb olan amillərdəndir.

Sevenə görə uşaqlarda ən çox görünən davranış pozulmaları; diqqət əksikliyi və hiperakivlik, yalan, qısqanclıq, inadkarlıq, qorxu, yuxu pozulmaları, kəkələmə, tiklər, enurez, enkepürez, barmaq əmmə, dırnaq yemə kimi dəyərləndirilmişdir.

Ornstain isə uşaqlarda en çox görülən davranış pozulmaları aşağıdakılardır.

1.Davamlı olaraq yerində otura bilməmək. 2. Çox danışmaq. 3. Oyunlara qatılmamaq. 4. Diqqətsizlik, 5. Başladığı işi yarımçıq qoymaq. 6. Adaptasiya ola bilməmək. 7. Davamlı diqqət gözləmək. 8. Başqalarını ələ salmaq. 9. Yalan danışmaq 10. Yeni insanlarla tanış olmaqdan çəkinmək.

Davranış pozulmalarından bir neçəsinə aydınlıq gətirək.

Kəkələmə - nitq aparatının əzələ qıc olması ilə şərtləndirilmiş nitqin temproritmik təşkilinin pozulması deməkdir. Kəkələmə çətinliklə aradan qalxır, uşağın psixikasını zədələyir, onun düzgün tərbiyəsini tormuzlayır nitq ünsiyyətinə mane olur. Uşaqlarda 3 yaşında olan kəkələmə normaldır. Heç bir əlamət qalmadan keçib gedə bilər. Ancaq aradan qalxmadığı halda kəkələmin başlanğıcı hesab oluna bilər. Kəkələmənin simptomlarının ən yüksək həddə çatdığı yaş dövrü 3-5 yaş dövrüdür. Kəkələmə oğlanlara nisbətən qızlarda daha rast gəlinir.

Enurez çox vaxt somatik və psixoloji səbəblərlə ortaya çıxan, həftədə iki və ya uç dəfə təkrarlanan(qeyri-iradi olaraq) sidik qaçırma olaraq adlandırılmışdır.

Barmaq əmmə - Uşaqlar əmmə ilə aclığı aradan qaldırır, zövq alır və rahatlıyır. Ancaq əmmə olmadıqda barmağını əmməyə başlayır. Uşağın barmağını əmməsi normadan kənara çıxma hesab olunmur. Bu hal ümumilikdə üç ayda başlayıb dörd-beş yaş dövrünə qədər davam edir. Yetərincə sevgi görə bilməyən uşaqlarda aqressiv olduqları zaman daha çox barmaq emdikleri müşahidə olunmuşdur. Dodlarını dişləmək, əli dişlə-

mək kimi davranışlar isə on ikinci aydan sonra başlayır. Əqli cəhətdən geri qalmış uşaqlarda isə bu hal daha uzun müddət çəkir.

Dırnaq yemək - en tez dörd yaşında başlayır. Cinsiyətə görə 5-10 yaş arasındakı uşaqlarda bir fərqlilik müşahidə olunmasa da, 10 yaşdan yuxarı oğlanlarda daha çox müşahidə olunmuşdur.

Aqressivlik - Butovsktay ve Kozintsevə görə aqressivlik canlı və ya cansız obyektə zərər vermə ilə nəticələnən bioloji və sosial səbəbləri olan, təkrarlanan davranışlar olaraq dəyərləndirilmişdir.

Tikler körpəlik yaş dövründə ən çox rast gəlinən pozulmalardır. Oğlan uşaqlarında daha çox rast gəlinir. Tiklər motor və vokal əzələlərinin qeyri-iradi olaraq gərilməsi nəticəsində ortaya çıxan, ani olaraq təkrarlanan, ritmik olmayan istəksiz hərəkətlərdir. Motor tiklər - göz qırpma, çiyin sirkələmə, başı sallama, kimi qeyri iradi olaraq ortaya çıxdığı kompleks tiklər ola bilər. Vokal tikler isə oxşar şəkilde; boğaz təmizləmə, səsinden qarışıq səslər çıxarmaq, və müxtəlif nitq pozulmaları və s. ola bilər.

Davranış pozulmalarına dair bir çox tədqiqtlar aparılmışdır.

Tədqiqatçılar xüsusi qayğıya ehtiyacı olan uşaqlarda davranış pozulmalarının araşdırmış və müəyyən olunmuşdur ki, 5-17 yaş dövründə davranış pozulmalarının görülmə sıxlığı 40% -dir.

6-12 yaş dövründəki uşaqlarda aparılan tədiqatlarda davranış pozulmalarının növünü və dərəcəsini müəyyən etmişlər. Məlum olmuşdur ki, uşaqlarda ən çox rast gəlinən davranış pozulmaları ünsiyyət çatışmazlığı və hiperaktivlikdir.

Xüsusi qayğıya ehtiyacı olan uşaqlar və davranış pozuntusu anlayışlarını birlikdə işlətdikdə xüsusi qayğıya ehtiyacı olan uşaqların kateqoriyaları arasında davranış pozuntusuna ən çox rast gəlinən qrupun əqli cəhətdən geri qalmış uşaqlar olduğu müəyyən olunub. Əqli cəhətdən geri qalan uşaqlarda müşahidə edilən davranış pozuntularını; başqalarına qarşı aqressiya, ağlamaq, qışqırmaq, özünə zərər vermək kimi müəyyən olunub və bu davranışlar ailə və mütəxəssis dəstəyi ilə dəyişdirilə bilən davranışlar olaraq qiymətləndirilib.

Davranış pozuntularının səbəbləri çox olmaqla yanaşı əqli geriliyin davranış pozuntularını ortaya çıxarma riskini artırdığıda müəyyən olunmuşdur

İstər əqli gerilik istərsə də digər funksional məhdudiyyətləri müəyyən olunmuş uşaqlarda davranış pozulmalarının rast gəlmə aralığı bu məhdudiyyətlərin ağırlıq dərəcələri ilə əlaqəli olduğuda müəyyən olunmuşdur.

Amerika tədqiqatçıları əqli cəhətdən geri qalan uşaqların davranış pozuntuları ilə əqli geriliyin dərəcələri arasındakı əlaqəni araşdırdıqda məlum olmuşdur ki, yüngül dərəcəli əqli geri qalmış uşaqlarda zərərvermə və antisosial davranışlar sıx görüldüyü halda, ağır dərəcəli əqli gerilikdə olan uşaqlarda isə eqoizm və autistik davranışlar daha sıx şəkildə görülmüşdür.

Əqli cəhətdən geri qalan uşaqların davranış pozulmalarına dair bir çox tədqiqatlarda fərqli nəticələr əldə olunmuşdur.

Müxtəlif dərəcəli əqli geri uşaqlarda davranış pozulmalarına təsir edən risk faktorlarını araşdırdıqda Daun sindromlu uşaqlarda daha az davranış pozulmalarına rast gəlindiyi müəyyən olunmuşdur. Amma davranış pozulmalarının göstəricilərinin aşağı olmasına baxmayaraq oxşar vəziyyətlərdəki inkişaf geriliyi olan uşaqlara nisbətən, diqqət əksikliyi, hiperaktivlik, aqressiya, həycan pozulmaları kimi psixatrik pozulmalar bu uşaqlarda daha çox rast gəlinir.

Aparılan tədqiqatlarda əqli cəhətdən geri qalan uşaqların ağır yüngül və orta dərəcələrinin də davranış pozulmaları arasında fərqliliklər qeyd olunmuşdur. Yüngül və orta dərəcəli əqli geri qalmış uşaqların ağır dərəcəli əqli geri qalmış uşaqlara nisbətən daha az davranış pozulmaları göstərirlər. Ancaq yüngül və orta dərəcəli əqli geri qalmış uşaqlarda da daha çox psixoz və depressiya əlamətləri göstərdikləri müşahidə olunmuşdur.

Tədqiqatlarda 3-5 yaş dövründə inkişaf geriliyi olan – daun sindromu, serebral iflic, autizm kimi xüsusi qayğıya ehtiyacı olan uşaqların davranış pozulmalarını və valideyinlərin stresi arasındakı əlaqəni araşdırmışlar. Məlum olmuşdur ki, 3 yaşındakı serebral iflicli və autizm uşaqlarda daha çox davranış pozulmalarına rast gəlinir. Həmçinin autizm sindromlu uşaqların valideyinlərinin də daha çox stresə məruz qaldığı müəyyən olunmuşdur.

Əqli cəhtdən geri qalan uşaqlarla tipik uşaqlarlarin psixi inkişafının qanununauyğunluqları eynidir. Amma tipik uşaqlara nisbətən əqli cəhətdən geri qalan uşaqların inkişafı ləngiyir. Bu ləngimə əqli cəhətdən geri qalan uşqların dərəcələrinə görə dəyişə bilir. Əqli geriliyin dərəcəsi artdıqca ləngimənin dərəcəsi də artır. İntellektual öyrənmə çatışmazlığı, əqli gerilikdən dolayı uşağın təhsil performansı və sosial adaptasiyasına mənfi istiqamətdə ağır orta və yüngül dərəcədə təsir göstərir. Əqli geriliyin dərəcəsi artdıqca öyrənmə dövründə başqalarının köməyinə daha çox ehtiyac olur. Zaman anlayışlarını və digər mücərrəd anlayışları daha gec qavrayırlar.

N.Nərimanov qadınların təhsil almasının, ictimai işlərdə iştirakının qızğın tərəfdarı idi. Onun bilavasitə yaxından köməyi ilə təşkil edilmiş qız məktəblərində təhsil alan yüzlərlə azərbaycanlı qız xalqımızın mədəni inkişafında böyük rol oynamışdır.

N.Nərimanovun yaradıcılığında qadın azadlığı və təhsili ilə bağlı maraqlı fikirlər vardır. N.Nərimanov yazırdı ki, çarşab bizim arvadların zənciridir. Bu zəncir gec-tez qırılmalıdır. Çarşab məsələsini Qurana istinad edərək həll etməyə çalışanlara cavab olaraq Nərimanov yazırdı: "Onlar düşünmürlər ki, min üç yüz il bu barədə bəhs olunubdur. On min il bəhs olunsa, yenə də hər iki tərəf müəyyən bir nəticəyə gəlməyəcəkdir" (6, s. 208).

N.Nərimanov qadınların çarşabdan xilas olmasını daha dəhşətli məsələlərdən asılı hesab edirdi ki, bu da istismar, zülm və hüquqsuzluq idi. Nərimanov göstərirdi ki, "daha dəhşətli məsələlər" düzəlməsə, yəni mövcud quruluş dəyişməsə, "çarşab məsələsi" təbii yolla getməyəcəkdir.

N.Nərimanovun qadın azadlığına aid fikirləri sonralar təkmilləşmiş və daha da inkişaf etmişdir. Əgər keçən əsrin 90-cı illərində Nərimanov bu məsələdə islahatçılıq mövqeyində dururdusa, sonralar o, inqilabçı kimi çıxış etmişdir. 1915-1916-ci illərdə "Bahadır və Sona" əsərinin səhnələşdirilmiş nüsxəsində bu cəhət özünü daha aydın göstərir. Müəllif, Bahadırın dili ilə Sonaya müraciət edərək deyir: "Sona, zənnimcə qadınlar hal-hazırdakı zəncirdən, yəni çarşabdan xilas olmasalar, milli ciddi surət tərəqqi yoluna yeriş edə bilməyəcəkdir...

N.Nərimanov qadınların təhsilini qadın azadlığının tərkib hissəsi hesab edirdi. O, qadının-ananın oxumasını, elmli olmasını vacib bilir və göstərirdi ki, gələcək cəmiyyətin taleyi anaların öz uşaqlarına verdiyi tərbiyədən çox asılıdır. Bu isə gələcək ananın elmli, təhsilli olması ilə əlaqədardır. Məhz buna görədir ki, N.Nərimanov qızların məktəbə cəlb olunmasına, onlar üçün xüsusi qız məktəblərinin açılmasına çalışırdı.

N.Nərimanovun əsərlərində insan şəxsiyyətinin formalaşmasında tərbiyənin rolu xüsusilə qiymətləndirilir. Pedaqoji fəaliyyətinin ilk dövründə tərbiyənin rolunu yüksək qiymətləndirməsi onun dünyagörüşündə demokratik maarifçilik mövqeyindən irəli gəlirdi. O, şəxsiyyətin təşəkkülündə elmin, təhsilin əhəmiyyətini göstərməklə kifayətlənmir, tərbiyənin roluna daha üstünlük verirdi. Heç təsadüfi deyildir ki, 90-cı illərdə elm insana ancaq bilmədiyi şeyləri təlim verir, adam olmağa isə tərbiyə gərəkdir, - fikrini geniş təbliğin edirdi. Bu fikir onun pedaqoji görüşlərinin əsasında dururdu. Cəmiyyətin böyük rolunu qeyd edən N.Nərimanov tərbiyyənin rolunu ayrıca qiymətləndirirdi.

N.Nərimanov ana dilinin təlimi əhəmiyyətini göstərməklə bərabər, onun tərbiyəvi rolunu ayrıca qeyd edir. Ana dilinin tərbiyəvi əhəmiyyətindən bəhs edən N.Nərimanov uca səslə deyirdi:

"Ana dili! Nə qədər rəfiq, nə qədər ali, hissiyyati-qəlbiyyə oyandır bir kəlmə! Nə qədər möhtərəm, müqəddəs, nə əzəmətli bir qüvvə! Ana dili! Bir dil ki, mehriban bir vücud öz məhəbbətini, şəfqəti-madərанəni sənə o dildə bəyan edibdir. Bir dil ki, sən daha beşikdə ikən layla şəklində öz ahəng və lətafətini sənə eşitdirib, ruhun ən dərin güşələrində nəqş bağlayıbdır!".

N.Nərimanovun pedaqoji fəaliyyətində və fikirlərində qadın təhsili məsələsi də mühüm yer tuturdu. Azərbaycan qadının hüquqsuzluğu, təhsildən məhrum olması, kölə halında saxlanılıb istismar edilməsi Nərimanovu daim düşündürürdü. Şərq qadınının faciələrlə dolu həyatına yaxından bələd olan Nərimanov onların azadlığı, təhsili uğrunda daim mübarizə aparmışdır.

N.Nərimanov pedaqoji irsində mərkəzi yerlərdən birini də müəllim, onun şəxsiyyəti, müəllim kadrlarının hazırlığı məsələsi tutur. N.Nərimanov xalq arasında savadın yayılmasında, xalqın ümumi tərəqqisində müəllimin rolunu yüksək qiymətləndirirdi. O, müəllim sözünü geniş mənada başa düşür, müəllimin geniş xalq kütlələri arasında işinə, ictimai fəaliyyətinə böyük əhəmiyyət verirdi. N.Nərimanov xalqın mədəni tərəqqisinə çalışan müəllimlərin işini yüksək qiymətləndirdiyi kimi, xalqın ictimai və mədəni yüksəlişi üçün çalışmayan müəllimləri tənqid edir və onları "çinovnik" adlandırırdı.

Onun müəllimdən tələb etdiyi keyfiyyətlərdən biri, pedaqogikanı, təlim və tərbiyənin prinsip və üsullarını, psixologiyanı bilməsi və ona istinad etməsidir. O, şagirdlərin fərdi xüsusiyyətlərinə istinad etməyi təlim və tərbiyə işində müvəffəqiyyətin rəhni hesab edir və göstərir ki, ...hər uşağın özünə görə bir qeyri-xasiyyəti, təbiəti olmağı binaən hamıya bir qayda və qanun ilə dərs vermək, hamıya bir dildə bəyan etmək olmaz. Hamını bir ölçü ilə ölçmək olmaz. Uşaqların bir parça zehinli, bir parası zehinsiz, fəhmsiz, bir parasının qüvveyi-hafizəsi qüvvətli, bir parasınınkı naqis, bir parası müdhiş hekayələr sevən, bir parası gülünc və fərəhli nağıllardan həzz alan olur. Uşaqlara məhəbbəti olan müəllim bunların hamısını mülahizə edən, hər kəsin öz biliyinə, qanacağına görə hərəkət edərsə, hər kəsin eyibinə görə çarə taparsa, əlbəttə, təlim və tərbiyə düz yol ilə gedib, tərəqqi dərəcəsinə çatar.

N.Nərimanov müəllim kadrları hazırlığı işinə xüsusi diqqət verməklə yanaşı, müəllimlərin qarşısında bir sıra mühüm vəzifələr qoymuşdur. Bu vəzifələrdən birincisi əmək məsələsidir. Cəmiyyətin əmək üzərində qurulması ideyasını əsas götürən N.Nərimanov belə hesab edirdi ki, müəllimlərdən təlim alan gənclər, ilk növbədə, əməksevər olmalıdırlar.

N.Nərimanovun müəllimlər qarşısında qoyduğu üçüncü vəzifə daha genişdir. O göstərirdi ki, "Azərbaycan Şərq üçün bir məktəbdir. Yəni Şərq hazırki halında qalarsa, biz ona hər cəhətdən müəllim olacağıq".

N.Nərimanov Azərbaycan məktəb və pedaqoji fikir tarixində özünəməxsus orjinal fikirlərə malik bir sima idi. O, zəhmətsevər xalqın içərisindən çıxmış, zəhmətkeşlər adından çıxış etmiş, zəhmətkeşlərdən bəhs etmiş və ömrünün sonunadək onların azadlığı, xalq maarifi və mədəniyyətinin tərəqqisi naminə çalışmışdır.

**Nəticə**

Azərbaycan xalqının böyük oğlu N.Nərimanov bütün həyatını zəhmətkeş xalqların zülmdən azad olması, onların səadəti və dostluğu uğrunda mübarizəyə sərf etmişdir.

N.Nərimanovun həyatında onun pedaqoji-maarifçilik fəaliyyəti ayrıca əhəmiyyət kəsb edir. XIX əsrin sonlarında Rusiyanın digər milli ucqarlarında olduğu kimi, Azərbaycanda da maarifpərvər müəllimlər yalnız dərs deməklə kifayətlənmirdilər. Onlar ədəbiyyat və incəsənətə, mətbuata xalqın ictimai yaralarını müalicə edən qüdrətli bir vasitə kimi baxırdılar. Odur ki, həmin ziyalılar bədii əsərlər yazır, qəzet və jurnallar çap etdirir, yeni üsullu məktəb açır, qiraətxana və kitabxanalar təşkil edir, dərsliklər hazırlayırdılar. Belə müəllimlərdən biri də Nərimanov idi.

**Ədəbiyyat:**

1. Ə.Ağayeva. Pedaqoji fikrimiz: dünənimiz, bu günümüz. Bakı: Elm, 2000, 300 s.
2. H.M.Əhmədov. Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı: ABU, 2001, 320 s.
3. H.M.Əhmədov. Nəriman Nərimanov. Bakı: ABU, 2004, 282 s.
4. H.M.Əhmədov. Nəriman Nərimanovun həyatı, fəaliyyəti, pedaqoji və tibbi fikirləri. Bakı: ABU, 2004, 284 s.
5. H.M.Əhmədov. Nəriman Nərimanovun pedaqoji fikirləri. Bakı, 2000, 138 s.
6. T.Əhmədov. Nəriman Nərimanov. Bakı: Yazıçı, 1982, 316 s.
7. Z.Göyüşov. Azərbaycan maarifçilərinin etik görüşləri. Bakı, 1960,212s.
8. H.N.Həsənov. N.Nərimanovun milli dövlətçilik baxışları və fəaliyyəti: Ped.elm.nam.dis. Bakı: APİ, 1989, 186 s.
9. F.Köçərli. N.Nərimanov. Bakı, 1965.
10. M.Mərdanov. Azərbaycan təhsil tarix. I cild. Bakı: "Təhsil", 2011, 296 s.
11. N.Nərimanov. Məqalələr və nitqlər. I cild. Bakı, Azərnəşr, 1971.
12. F.Seyidov. Azərbaycan pedaqoji fikir tarixindən səhifələr. Bakı: Çaşıoğlu, 2002, 323 s.
13. F.Seyidov. Qori seminariyası və onun məzunları. Bakı: Maarif, 1988, 296 s.

**Problems in education in N. Narimanov's pedagog heritage**

**Summary**

N. Narimanov was a great educator, playwright, publicist, scientist and teacher, one of the first doctors with higher education in Azerbaijan, a prominent public and political figure. Women's freedom and women's education were one of the most important issues in his teaching and creative work. Attaching great importance to the teaching of the mother tongue and the training of teachers, N. Narimanov has always been based on the idea of building a society on work.

**Пробдемы образования в педагогическом наследии Н.Нариманова**

**Резюме**

Н.Нариманов был великим просветителем, писателем-драматургом, публицистом, ученым-педагогом, одним из первых врачей с высшим образованием в Азербайджане, видным общественным и политическим деятелем. Свобода женщин и образование женщин были одним из важнейших вопросов в его преподавательской и творческой работе. Придавая большое значение преподаванию родного языка и подготовке учителей Н.Нариманов всегда основывался на идее построения общества на труде.

**Rəyçi: prof. E.M.Quliyeva**

Göndərilib: 21.02.2020 Qəbul edilib: 28.02.2020

DOI: 10.36719/AEM/2007-2020/51/97-99

**Yeganə Xanoğlan qızı Məmmədova**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi
yeganememmedova.doc@gmail.com

# MƏKTƏBƏQƏDƏR YAŞ DÖVRÜNDƏ SÖZLƏRİN ORFOEPİK NORMALARA UYĞUN DÜZGÜN TƏLƏFFÜZÜ ÜZƏRİNDƏ İŞİN TƏŞKİLİ

***Açar sözlər:*** *məktəbəqədər dövr, nitq inkişafı, ədəbi tələffüz*
***Key words:*** *pre-school period, speech development, literary pronunciation*
***Ключевые слова:*** *период дошкольного, развитие речи, литературное произношение*

## GİRİŞ

Bu gün məktəbəqədər yaşlı uşaqların ana dilinə yiyələnməsi təlim-tərbiyə işinin mühüm vəzifələrindən biridir. Uşağın nitq və düşüncəsinin inkişaf etdirilməsi, ətraf aləmi dərk etməsi, şəxsiyyətinin hərtərəfli formalaşması ilə sıx sürətdə bağlıdır. Böyüməkdə olan gənc nəslə məişətdə, əməkdə, ictimai fəaliyyətdə ana dilinin zənginliklərindən istifadə etməyi öyrətmək təlimin bütün mərhələlərində mühüm bir vəzifədir. Ümummilli liderimiz Heydər Əliyev düzgün demişdir: «Hər bir xalqın milliliyini, mənəvi dəyərini yaşadan, inkişaf etdirən onun dilidir. Ana dilini bilməmək, ana dilini qiymətləndirməmək, şübhəsiz ki, xalq qarşısında böyük bir qəbahətdir» (Kərimov, 2002:5).

Dilə yiyələnmə prosesinə ailədən başlanır. Uşaq məktəbə gedənədək ana dilinin köməyi ilə ətraf aləm haqqında müəyyən təsəvvürlər əldə edir. Bu təsəvvürlər isə onun lüğət ehtiyatını zənginləşdirir, dəqiqləşdirir. Dilin köməyi ilə başqalarının dediklərini anlayır, ətraf aləmdəki əşya və hadisələr haqqında öz fikirlərini yaşına uyğun şəkildə istifadə edirlər.

Unutmaq olmaz ki, nitq bütövlükdə insan şəxsiyyətini əks etdirir. Ona görə də uşağın nitqinin inkişafı və tərbiyəsinin əsasında bütövlükdə onun şəxsiyyətinin inkişafı və tərbiyəsi durur. Uşaq bağçasının qarşısında uşaqlara ətrafdakı adamlarla ünsiyyətdə olarkən, ana dilindən sərbəst istifadə etməyə və şifahi şəkildə öz fikirlərini düzgün və aydın söyləməyi öyrətmək, onlarda bədii sözə maraq və məhəbbət hissi tərbiyə etmək əsas vəzifələrdəndir. Bu vəzifələr uşağın uşaq bağçasında olduğu bütün müddətdə, hər yaş qrupu üçün proqramın tələbinə müvafiq şəkildə tərbiyəçi tərəfindən həyata keçirilir.

Məktəbəqədər yaşlı uşaqların nitqinin inkişaf etdirilməsi üzrə işlər onlara, ilk növbədə məktəbdə müvəffəvəqiyyətlə oxumalarını təmin etmək imkanı verir. Ana dili məşğələlərində uşaqlar fikir mübadiləsi keçirir, öz fikirlərini düzgün, aydın, səlis ifadə etmək üçün müvafiq sözlər axtarır, tapdıqları sözləri nitqlərində işlətməyə çalışırlar. Bu məqsədlə məşğələlərdə onların nitq inkişafının müxtəlif cəhətlərini-söz yaradıcılığını, lüğət ehtiyatının zənginləşdirilməsini, nitqin qrammatik cəhətdən formalaşmasını və rabitəli nitqin inkişaf etdirilməsini nəzərdə tutmaq lazımdır.

Uşaq nitqini inkişaf etdirmək hər şeydən əvvəl səsləri və sözləri düzgün tələffüz etmək bacarığını aşlamaqdan ibarətdir. Bu, düzgün nitqin əsas əlamətlərindən biridir. Səsləri və sözləri düzgün tələffüz etməyən uşağın söz ehtiyatı nə qədər zəngin olsa da, o qrammatik cəhətdən nə qədər mükəmməl danışsa da onun sözləri aydın olmayacaqdır. Buna görə də uşaqlarda hələ kiçik yaşlarından nitqin fonetik cəhətini, səsləri və sözləri düzgün ifadə etmək vərdişlərini inkişaf etdirmək lazımdır. Məktəbə gedənədək uşaq fonematik eşitmə bacarığına yiyələnməli, dilimizin bütün səslərini aydın tələffüz etməyi, sözdə səslərlə hərflərin sayını və sırasını müəyyənləşdirməyi, bir səsə görə fərqlənən sözləri tapmağı bacarmalıdırlar. Bu sahədə uşaqla iki istiqamətdə iş aparılmalıdır:

1. Onun nitq-hərəki aparatının, fəal nitqin səs cəhətinin inkişafı;
2. Eşitmə diqqəti və nitq eşitmənin inkişafı (Kərimov, 1997:120).

Uşaqların nitqinin normal inkişaf etməsi onların ədəbi dilin normalarına nə dərəcədə yiyələnməsindən asılıdır. Məktəbəqədər yaş dövründə başlıca ünsiyyət forması şifahi nitq olduğundan onun təmizliyinə və düzgünlüyünə, vahid normalar əsasında qurulmasına fikir verilməlidir. Uşağın nitqi mənimsəməsi üçün ilk növbədə onun dilimizdəki fonemləri düzgün tələffüz etməsi, onların artikulyasiyasını və intonasiya elementlərini bilməsi zəruridir.

Müşahidələr göstərir ki, tərbiyəçilərin əksəriyyəti uşaqların nitq inkişafı qayğısına ümumi şəkildə qalırlarsa da, nitq səslərinin düzgün tələffüzünə əhəmiyyət vermirlər. Uşaqların danışıqları yamsılama yolu ilə nitqin ümumi axınında səslərin artikulyasiyasına az-çox uyğunlaşır. Uşaq bağçasında, habelə ailədə uşaqların nitqi üzərində müqayisəli müşahidələr göstərdi ki, bu dövrdə uşaqların nitqi nəzarətsiz qaldığından və ya bu sahədə iş təsadüfdən-təsadüfə, sistemsiz aparıldığından onlar daha çox tələffüz xətalarına yol verirlər. 3-6 yaşlı uşaqların oyun prosesində, ətraf aləmlə tanışlıq prosesində, əmək prosesində, sərbəst

vaxtlarda, ailədə istifadə etdikləri sözlərin, əşyaların adını deyərkən məlum olmuşdur ki, bu dövrdə onlar əsasən aşağıdakı cədvəldə (Cədvəl 1.) verilmiş səsləri düzgün tələffüz etməkdə çətinlik çəkirlər.

**Cədvəl 1.**

| Hansı səsləri tələffüz edə bilmirlər | r | s | s | ş | j | ç | v | b | d | g | q |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| Necə tələffüz edirlər | l, y | z | ş | j | s | c | f | p | t | d | d |

Nitq səslərinin aydın tələffüzü onları əmələ gətirən artikulyasiya orqanlarının (dodaqlar, dil, dişlər, burun, alt çənə, üst çənə, yumşaq damaq, kiçik dilçək, qığırdaq, nəfəs borusu, ağciyər) vəziyyətinin və hərəkətinin düzgünlüyündən asılıdır. Bu dövrdə artikulyasiya aparatında baş verən bəzi pozuntular sonralar da davam edir, lakin bu və ya digər sözü tələffüz edə bilməyən uşaq nitqin səs obrazını bilir və başqaların nitqində həmin sözləri düzgün səsləndiyi halları hiss edir. Ona görə də uşağın tələffüz edə bilmədiyi səsi müxtəlif nitq materialları ilə möhkəmləndirmək zəruridir. Məsələn, əvvəldə, ortada, axırda uşağın tələffüz edə bilmədiyi səsin aid olduğu sözləri ucadan ifadəli demək, yanıltmac, tapmaca, şeir oxumağı öyrətmək faydalıdır. Nitq səslərinin artikulyasiyasının mənimsənilməsi çətin prosesdir. Məktəbəqədər yaşlı uşaqların bir qismi orta damaq samitlərini (r, l, ş, j), bəzən də isə arxa damaq samitlərini (q, k, x) tələffüz etməkdə çətinlik çəkirlər.

Kiçikyaşlı uşaqların nitq cihazı hələ tamamilə inkişaf etmədiyi üçün zəif olur. Bu da əzələlərin zəifliyi, əsəb impulslarının kafi qədər qüvvəyə malik olmaması və tənəffüsün zəifliyi ilə izah olunur. Bunun üçün onun tələffüzü mükəmməl deyildir. Üç yaşlı uşaqların çoxu r, k, l, ş, s səslərini tələffüz edə bilmirlər. Onları başqa səslərlə əvəz edirlər və sözü tələffüz edərkən onları buraxırlar. Dörd yaşından başlayaraq uşağın şifahi nitqi həm fonetik, yəni səsləri demək və eşitmək, həm də düzgün danışıq vərdişlərinin dəqiqləşməsi nöqteyi nəzərdən sürətlə inkişaf etməyə, onun yaşlılarla ünsiyyəti daha məzmunlu, aydın və düzgün olmağa başlayır. Dörd-beş yaşlı uşaqlar ana dilinin bütün səslərini əsasən düzgün tələffüz edə bilirlər. Beş yaşda uşağın nitq cihazı gözə çarpacaq dərəcədə mükəmməlləşir, nitq hərəkətlərində uyğunluq yaxşılaşır və tənəffüs daha da dərinləşir. Buna görə də səslərin ifadə olunması yaxşılaşır, uşaqlar səslərin çox hissəsini təmiz və düzgün tələffüz edirlər, ancaq bəzən tələffüz nöqsanlı olur. Sübut olunmuşdur ki, uşaq normal inkişaf etdikdə onun nitq üzvlərinin də heç bir nöqsanı olmadığından və nitqini inkişaf etdirmək üçün düzgün tədbirlər həyata keçirildiyindən beş-altı yaşlı uşaq ana dilinin bütün səslərini eşidə və düzgün tələffüz edə bilir (Kərimov, 1997: 135).

Tərbiyəçi uşağın qarışdırdığı səsləri və sözləri müəyyənləşdirdikdən sonra sadə çalışmalar da keçirə bilər: Məsələn, z-s, d-t, b-p, q-k, g-k, q-d, v-f, m-n, r-y və s. səsləri növbə ilə deyilir, əvvəl hansı səsi dediyini, sonra isə hansı səs deyildiyini uşaqlardan əzbər deməsini tələb etmək lazımdır. Bu zaman uşağın səhvlərinə düzəliş verilir. Sözlər üzrə də belə çalışmaları keçirmək mümkündür. Ola bilər ki, səslərin düzgün tələffüzünü həyata keçirmək üçün şəkillərdən istifadə edilsin. Tərbiyəçi şar, dəsmal, qaşıq, kasa, şal və s. şəkilləri göstərib, adlarını xəbər almaqla s və ş səslərinin düzgün eşidilməsi üzrə iş apara bilər. Uşaqlar praktik yolla öyrənməlidirlər ki, hər bir səs sözdə düşdüyü şəraitdən, mövqedən asılı olaraq müxtəlif cür səslənə bilər.

Səsin tələffüzü üzrə işə ehtiyatla yanaşmaq lazımdır. Hər bir səsin sözdə aydın tələffüzü ümumiyyətlə, səslərin düzgün tələffüzü ilə əlaqələnir. Sözlərin ədəbi tələffüz normalarına uyğun tələffüzü ilk növbədə yerli şivə xüsusiyyətlərinə, dialektizmlərə yol verilməməsi kimi nəzərdə tutulur. Müşahidələr göstərir ki, ailələrin çoxunda uşaqların tərbiyəsi, o cümlədən, nitq inkişafı nənə-babanın, yaxud digər yaşlıların ixtiyarına buraxılır. Onların danışığı isə bir çox hallarda dialektizmlərlə dolu olduğundan uşaqların nitqinə güclü təsir göstərir. Altı yaşadək ailədə öyrəndiyi danışıq tərzi uşaq üçün çox əziz olur. O, məktəbə gələndən sonra bilmir kimə inansın: nənə-babasına, ata-anasına, yoxsa müəllimə. Ona görə də ilk növbədə uşağın nitqinə çox ehtiyatlı yanaşmaq, danışarkən ədəbi tələffüz normalarını gözləmək lazımdır. Bunun üçün istər ailədə, istərsə də uşaq bağçalarında ümumi nitq rejiminin olması vacibdir. Bu prosesdə uşaqlara Azərbaycan dilinin tələffüz qaydalarının planlı şəkildə öyrədilməsi mühüm əhəmiyyət kəsb edir. Bu sahədə tərbiyəçinin özünün ədəbi tələffüz normalarına necə yiyələnməsindən asılıdır. Tərbiyəçi tələffüz normalarını öyrənməklə öz nitq mədəniyyətini yüksəltməli, danışarkən həmin qaydalara əməl etməlidir. Uşaq nitqi üzərində işləyərkən onların tələffüz sürətini də nizama salmaq lazımdır. Onların danışığındakı tələskənlik tələffüzü pisləşdirir, bəzən səslərin, hecaların, hətta sözlərin düşməsi ilə nəticələnir. Bununla da nitqin səlisliyi və dəqiqliyi pozulur (Hacıyeva, 1992:67).

Normal danışıq sözləri səs simvolikasını duymaqla aparılır. Həddən artıq aşağı sürət dalğınlıqla, nitqin maraqsız və təsirsiz olması ilə nəticələnir. Sürətin həddən artıq artması isə sözün mənası, cümlədəki sözlər arasında əlaqəni duymağa, nitqin ifadəliliyini gözləməyə mane olur. İş burasındadır ki, bu dövrdə qazanılmış sürət sonralar da oxu prosesində, nağıl, şeir söyləmədə öz əksini göstərir. Uşaqlara öz səsinin gücünü onu əhatə edən şəraitə uyğunlaşdırmaq, səsi qorumağı öyrətmək lazımdır. Məktəbəqədər yaş dövründə uşaqların nitqi intonasiya cəhətdən qüsurlu olur. Buna səbəb uşaqlarda nitq eşitmənin zəifliyi, nitqin müxtəlif cür pozulması, erkən yaşlardan onların nitqinin tərbiyə olunmaması, xüsusilə səsin intonasiya cəhətinə laqeydliklə əlaqədardır. Buna görə də istər Azərbaycan dili məşğələsində, istərsə də məşğələdənkənar ünsiyyət prosesində uşaqların nitqinin

intonasiya, fasilə və cümlələrin ritmik bölgüsünə xüsusi diqqət yetirilməlidir. Hələ məktəbəqədər yaş dövründə başlanan bu praktik işlər sonrakı yaş dövründə də davam etdirilir.

Səslənən nitqin ən mühüm keyfiyyəti onun ifadəliliyidir. Tərbiyəçi uşaqlar üçün xarakterik olan təbii ifadəliliyi inkişaf etdirməlidir. Uşağın nitqi ifadəli olmalı, gözləri alovlanmalı, fikri və hissləri jestlərində əks olunmalıdır. F.R.Xalıqov Fransız fonetiki Qrammonun fikrinə istinad edərək qeyd edir ki, «cümlələri əmələ gətirən sözlər onun yalnız skletidir, bu skletə hərəkət və həyat verən intonasiyadır» (Xalıqov, 2012:32). İntonasiya müəyyən bir məzmunun özünəmüvafiq forma ilə ifadə olunması vasitələrindən ən başlıcasıdır.

Nitqin ifadəliliyinə zərər gətirən nöqsanları aradan qaldırmaq üçün tərbiyəçi kiçik qrupdan başlayaraq şeir oxuyarkən, nağıletmə prosesində öz nitqinə yüksək tələbkarlıqla yanaşmalıdır. Çünki tərbiyəçinin ifadəli, emosional nitqini eşitməklə uşaqlar da lazımi intonsiya seçə bilirlər.

## Nəticə

Məktəbə gələnədək uşaq düzgün fonematik eşitmə bacarığına yiyələnməli, dilimizin bütün səslərini aydın tələffüz etməyi, sözdə səslərin, hərflərin sayını və sırasını müəyyənləşdirməyi, bir səsə görə fərqlənən sözləri tapmağı bacarmalıdır. Uşaqların bu dövrdə nitq səslərini necə tələffüz etməsindən asılı olaraq rabitəli nitqi onun emosional rəngi yaranır. Hər bir məşğələdə şifahi nitqin inkişafı üzrə məşqlər aparılmalı, söz və ifadələrin xorla təkrarlanması təşkil edilməlidir. Eyni zamanda uşaqların səsləri düzgün tələffüz edə bilməsi savad təlimini yaxşı mənimsənilməsinə şərait yaradır. Gözəl, bəzəkli oyuncaq, əşya şəkli göstərib ona aid şeirlərin oxunması, hadisənin məzmununa aid müvafiq şeirin seçilməsi və ucadan oxunması, nağıletmənin səhnələşdirilməsi və s. onlarda emosiya doğurur. Bu prosesdə intonasiya üzrə sadə məşğələlər keçirmək, şeirin oxunması, yaxud bir əşyanın, hadisənin təsviri prosesində tərbiyəçi «Daha necə demək olar?» «Şeiri kim daha yaxşı deyər?» şəklində suallar verməklə sözə diqqətlilik tərbiyə edilə bilər.

## Ədəbiyyat:

1. Kərimov Y.Ş. Uşaq məktəbə gedir. Bakı: 2002.
2. Kərimov Y.Ş. Məktəbəqədər yaşlı uşaqların nitq inkişafının metodikası. Bakı: 1997
3. Hacıyeva Ə.H. Məktəbəqədər yaşlı uşaqların nitq inkişafı. Bakı: Maarif, 1992.
4. Xalıqov F.R., Hacıyeva İ. Nitqdə ifadəlilik yaradan vasitələrin öyrədilməsi. Bakı: Müəllim, 2012.

## Organization of correct pronunciation of words according to orthoepic norms in preschool age

### Summary

Speech development in early childhood will give you the opportunity to study in school. One child's ability to develop speech is, above all, the right pronunciation of sounds and words. The normal development of children's speech depends on how well they master the literary language norms. As the main form of communication in the preschool age is oral speech, it is necessary to ensure its purity and accuracy and to establish common ground. To master a child's speech, it is first necessary to properly pronounce phonemes in our language, to know their articulation and intonation elements. Each session should include training on oral speech development and repetition of vocal expressions. At the same time, children's ability to pronounce sounds correctly helps them to master literacy skills.

## Организация правильного произношения слов по орфоэпия нормам в дошкольном возрасте

### Резюме

Развитие речи в раннем детстве даст им возможность читать в первую очередь в школе. Развитие речи ребенка - это прежде всего умение правильно произносить звуки и слова. Нормальное развитие детской речи зависит от того, насколько хорошо они усваивают нормы литературного языка. Поскольку основной формой общения в дошкольном возрасте является устная речь, необходимо позаботиться о том, чтобы обеспечить ее чистоту и точность, а также опираться на общие нормы. Чтобы ребенок освоил свою речь, сначала необходимо, чтобы он правильно произносил фонемы на нашем языке, знал их элементы артикуляции и интонации. Каждый сеанс должен включать упражнения по развитию устной речи и повторению слов и фраз в хоре. В то же время способность детей правильно произносить звуки помогает хорошо овладеть навыками грамотности.

**Rəyci: dos. Z.I. Veliyeva**

Göndərilib: 23.02.2020 Qəbul edilib: 27.02.2020

## JURNALIN İÇİNDƏKİLƏR

### FİLOLOGİYA PHILOLOGY ФИЛОЛОГИЯ



### HÜQUQ ELMLƏRİ THE LAW SCİENCES ПРАВОВЫЕ НАУКИ



### SİYASİ ELMLƏR POLITICAL SCIENCES ПОЛИТОЛОГИЯ



### PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА

www.aem.az AEM AZ EN TR RU

# "ELMİ İŞ"

## humanitar və ictimai elmlər üzrə aylıq beynəlxalq elmi jurnal

Jurnalda aşağıdakı sahələr üzrə məqalələr dərc edilir:

- Tarix və antropologiya
- Filologiya
- Hüquq elmləri
- Fəlsəfə və sosiologiya
- Siyasi elmlər
- Psixologiya
- Pedaqogika
- Sənətşünaslıq və memarlıq

Məqalələr Azərbaycan, ingilis, türk və rus dillərində qəbul olunur

### Məqalələrin texniki tərtibatına dair tələblər

**Həcmi**
Məqalələr - 8-25 səh.
**Mətnlər** Microsoft Word mətn redaktorunda A4 formatda, hər tərəfdən 2 sm olmaqla Times New Roman şrifti ilə 14 pt ölçüdə, 1,5 sətirarası intervalla, 1 sm abzasla yığılmalıdır.
**Müəllif haqqında** məlumat **sağdan, qalın şriftlə** aşağıdakı qaydada tərtib olunmalıdır:
Müəllif(lər)in adı, atasının adı, soyadı (yalnız ilk həriflər böyük olmaq şərti ilə)
Bu məlumatdan aşağıda müəllif(lər)in iş yeri (qısaltmalardan istifadə etmədən) adi şriftlə (nə qalın, nə kursiv) göstərilməlidir, əgər müəllif məqalə nəşrə təqdim olunan zaman heç bir elm və ya təhsil (orta və ya ali) müəssisəsində çalışmırsa, o zaman iş yeri əvəzinə yaşadığı şəhər və ölkə göstərilir. Müəllifin vəzifəsinin, elmi adı və ya elmi dərəcəsinin göstərilməsinə ehtiyac yoxdur!
Müəllif(lər)in şəxsi **elektron poçt** ünvanı **mütləq şəkildə** iş yeri məlumatlarından sonrakı sətirdə e-mail sözü yazılmadan göstərilməlidir.
**Məqalənin adı** - ortadan böyük hərflərlə (Caps lock-dan istifadə edilərək) qalın şriftlə verilməlidir.
***Açar sözlərlə məqalənin adı arasında məsafə*** aşağıdakı qaydada verilməlidir:
Abzas - interval: əvvəl - 0, sonra - 10
Açar sözlər (Azərbaycan dilində)
Key words (ingilis dilində)
Ключевые слова (rus dilində)
3-6 arası açar söz olmalıdır
İlk olaraq məqalənin yazıldığı dildə olan açar sözlər verilməlidir.
"Açar sözlər", "Key words", "Ключевые слова" söz birləşmələri qalın kursivlə, sözlərin özü isə sadəcə kursivlə yazılmalıdır.
**Məqalənin mətni aşağıdakı hissələrdən ibarət olmalıdır:**
**Giriş** məqalənin aktuallığını və elmi yeniliyini əks etdirməli və 5-10 cümlədən ibarət olmalıdır.
Girişdən sonra başlıqsız olaraq məqalənin əsas mətni başlamalıdır.
Bu iki hissə arasında məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.

Məqalənin sonunda mütləq olaraq **Nəticə** hissəsi verilməlidir. Nəticə 5-10 cümlədən ibarət olmalıdır və sıra nömrəsi olmadan məqalənin əsas nəticələrini əks etdirməlidir. ("Nəticə" sözü Caps lock-la qalın hərflərlə ortada verilməlidir). Əsas mətnlə Nəticə arasındakı məsafə "Abzas - interval: əvvəl - 0, sonra - 10" qaydası ilə təyin edilməlidir.

**İstinadlar** mətnin içərisində aşağıdakı qaydada yazılmalıdır:

Mətndə mənbənin (fikrin) müəllifi göstərilmədikdə

Müəllifin soyadı - vergül - interval, mənbənin nəşr ili - iki nöqtə - interval - səh. ***Nümunə***: Axundov, 2005: 201)

Əgər müəllifin adı mətndə çəkilirsə o zaman bu qaydada yazılmalıdır: "...A.Axundov (2005: 205) qeyd etmişdir ki..."

**Ədəbiyyat siyahısı** məqalədə **istinad ardıcıllığına uyğun** olaraq aşağıdakı qaydalarla sıra nömrəsi ilə qeyd olunmalıdır və **Ədəbiyyat** kimi verilməlidir.

Məqalənin hazırlandığı dildən fərqli digər iki dildə məqalənin adı göstərilməklə **7-8 cümlədən ibarət Xülasə** yazılmalıdır.

Xülasənin mətnində "Bu məqalədə filan məsələ araşdırılır..." kimi cümlələr qəti şəkildə istifadə olunmamalıdır! Mətndə məqalənin elmi yeniliyini, araşdırılan mövzuya dair fikir və bir-iki cümləylə əldə olunan nəticə izah edilməlidir.

"Xülasə" sözü yazılanda qalın hərflərlə yalnız "X" hərfi böyük yazılmalıdır.

Xülasədə mütləq məqalənin adı verilməlidir!

Xülasənin xarici dillərə tərcümə edilərkən qəti olaraq elektron tərcüməçilərdən istifadə olunmamalıdır.

Cədvəl və şəkillər nömrələnir və bilavasitə mətndə yerləşdirilir. Cədvəl sözü və cədvəlin nömrəsi cədvəlin üst tərəfindən qalın hərflərlə yazılmalıdır.

Məqalənin məzmununa görə məhsuliyyəti müəllif daşıyır.

Redaksiya məqalənin əsas məzmununa xələl gətirmədən redaktə dəyişiklikləri və ixtisarları etmək hüququnu özündə saxlayır.

Məqalələrin məzmunu orjinal, yeni elmi fikir və nəticələri əks etməlidir.

Məqalə tələblərə cavab vermədiyi halda çap olunmur və müəllifə qaytarılmır.

Məqalə həm kağız, həm də elektron formada redaksiyaya təqdim olunmalıdır.

Elmi dərəcəsi olan mütəxəssisin rəyi mütləq şəkildə yazılı şəkildə (imza müəssisə möhürü ilə təsdiq olunmaq şərti ilə) redaksiyaya təqdim olunmalıdır.

Məqalənin sonunda əlaqə üçün telefon nömrəsi qeyd olunması vacibdir.

Məqalənin faylının adında yalnız müəllifin adı və soyadı göstərilməlidir.

***Nümunə***: Leyla Məmmədova


**Redaksiya ünvanı:** Bakı ş., Mətbuat pros., 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə.
www.aem.az saytında məqalələr onlayn yerləşdirilir.
E-mail: elmmerkezi@gmail.com
Tel.: +994 (012) 510 63 99
+994 (050) 209 59 68
+994 (055) 209 59 68

Çapa imzalanmışdır: 28.02.2020
Kağız formatı:
H/n həcmi:.
Sifariş: 256

"ZƏNGƏZURDA" çap evində çap olunub
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: (050) 209 59 68; (055) 209 59 68; (012) 510 63 99
e-mail: zengezurda1868@mail.ru

